qız", "Vüqarın köynəyi", "İki adamcığaz","Coğrafiya dərsində taxılan eynək" və s. hekayələri bu illərdə qələmə alınmışdır. Müəllif bu əsərlərdə uşaqların daxili aləminin zənginləşməsinə, dünyagörüşünün formalaşmasına xidmət edən süjet xəttinə, qəhrəman seçiminə xüsusi diqqət yetirmişdir. Z.Xəlil 1981-ci ildə keçirilən Azərbaycan Yazıçılarının VII Qurultayında etdiyi çıxışında qeyd etmişdir ki: "Uşaqların hərtərəfli inkişafına nail olmaq üçün onların ağlına, dünyagörüşlərinə, əqidəsinə təsir edən əsərlər yaratmaq bizim vacib vəzifələrimizdəndir (Xəlil, 2008: 10)".

Azərbaycan uşaq ədəbiyyatını öz qələmi ilə zənginləşdirən simalardan biri də nasir, dramaturq, publisist, tərcüməçi Xalidə Hasilovadır. X.Hasilova ədəbiyyat aləminə 50-ci illərdə gəlsə də, onun yaradıcılığının mühüm hüssəsini 1960-1980-ci illər təşkil edir. Bu illərdə ədibin "Ulduzlu papaq" (1960), "Rəna evlərini axtarır" (1962), "Atlas yarpaqlar" (1965), "Kaman" (1972), "Nəğməli Könül" (1976), "Xatirə" (1978), "Məhəbbət olanda" (1979), Xatirənin sorağında" (1983), "Ləpəli sahilin xatirələri" (1983), "Ana fəryadı" (1989) və s. kitabları işıq üzü görmüşdür. Bu kitablarda müəllifin uşaqlar üçün yazdığı hekayələr yer almışdır.

X.Hasilovanın 1983-cü ildə nəşr olunmuş "Ləpəli sahilin xatirələri" adlı kitabına "Yalan", "Buyurun əyləşin", "Nənəm məktəblidir", "Nuru", "Özünü itirmədi", "Ayişə", "Krançı və sərçə yuvası", "Səhər-səhər", "Solmaz və asfaltçı oğlan", "Elçinin pələngi" və s. hekayələri daxildir. Bu hekayələrdə ədib tərbiyəvi əhəmiyyətə malik bir sıra məsələlərə toxunmuş, oxucularını mənfi cəhətlərdən uzaq durmağa dəvət etmiş, onlara hekayə qəhrəmanlarının başına gələn əhvalatlardan nəticə çıxartmağa və bu yolla müsbət keyfiyyətlər aşılamağa çalışmışdır.Uşaq ədəbiyyatının tanınmış tədqiqatçısı Qara Namazovun da qeyd etdiyi kimi: "X.Hasilovanın əsərlərinin başlıca məqsədi dostluq və yoldaşlıq, böyüklərə hörmət, məktəbə və elmə rəğbət, yaşıllıqlara qayğı, müharibəyə nifrət hissi aşılamaqdır (Namazov, 2007: 367)".

Xalidə Hasilovanın ibrətamiz xüsusiyyətə malik olan "İlk məktub" hekayəsində səkkiz yaşlı Solmaz adlı xeyirxah təbiətli, yardımsevər qızdan söhbət açılır. Poçtalyonun qonşulara məktub payladığını görən Solmaz da məktub almağı arzulayır. Solmaz poçtalyonla birgə qonşuları Məsmə xalagilə gəlir və onun xəstə olduğunu görür. "Məsmə xalanın qızı Gülnaz müəllim və nəvəsi Eldar Göygölə - yaylağa getmişdilər". Solmaz Məsmə xalanın bulaşıq qablarını yuyur, onun dərmanlarını alıb gətirir, bir neçə gün Məsmə xalanın qulluğunda dayanır. Bir gün yenə poçtalyon gəlir və bu dəfə Solmaza məktub gətirdiyini söyləyir. Məlum olur ki, məktubu yazan Məsmə xalanın qızı Gülnaz müəllimdir. "Xəstə anasına xidmət etdiyi üçün ona minnətdarlıq edirdi". "Solmaz sevinirdi. Axı, bu onun adına gəlmiş ilk məktub idi (Hasilova, 1983: 39)".

Göründüyü kimi, əsər tərbiyəvi-əxlaqi xüsusiyyətə malikdir. Müəllif kiçik oxucularını Solmaz kimi insanlara qarşı humanist olmağa, yaşlı, xəstə adamlara kömək etməyə, onların qayğısına qalmağa dəvət edir.

X.Hasilova uşaq hekayələrində təhsilə, məktəb həyatına xüsusi diqqət yetirmişdir. "Təqvim", "Yaxşı yoldaş", "Rəşidin qiyməti" kimi hekayələrində elmin, biliyin, savadın önəmli olduğu vurğulanır. Bu hekayələr məktəbyaşlı uşaqların böyük həvəslə və maraqla oxuduqları hekayələrdir. Uşaq ədəbiyyatı tədqiqatçısı Rafiq Yusifoğlu X.Hasilovanın yaradıcılığı haqqında qeyd edir ki: "Yazıçının əsərlərinin ən xarakterik cəhətlərindən biri də onların hamısının yığcamlığıdır. Hiss olunur ki, yazıçı uzunçuluğu, milçəkdən fil düzəltməyi sevmir (Yusifoğlu, 2002: 125)". Həqiqətən də, Xalidə xanımın hekayələrinin əsas məziyyətlərindən biri bu əsərlərin yığcam, lakonik, aydın, səlis, anlaşıqlı dil-üslub xüsusiyyətlərinə malik olmasıdır. Bu cəhət oxucunu yormur, həmin əsərlərin daha yaddaqalan və oxunaqlı olmasına şətait yaradır.

Metodist-alim Bilal Həsənli ali məktəblər üçün yazdığı "Azərbaycan uşaq ədəbiyyatı" adlı dərslikdə X.Hasilovanın yaradıcılığına münasibət bildirmiş, onun "Yalan", "Rəna evlərini axtarır", "Buyurun əyləşin" kimi uşaq hekayələrinin təhlilini vermişdir. B.Həsənli Xalidə xanım haqqında bu qənaətə gəlmişdir ki: "Onun uşaq əsərləri ideya-mövzu zənginliyi, dil-üslub əlvanlığı ilə seçilir (Həsənli, 2013: 370)".

Doğrudan da, yazıçının hekayələrini oxuduqca bunun bir daha şahidi oluruq. X.Hasilovanın əsas məqsədi gənc nəsli yüksək mənəvi-əxlaqi keyfiyyətlərə, sağlam düşüncəyə malik bir şəxsiyyət kimi

görməkdən ibarətdir. Müəllif bu hekayələrin sevilməsi və maraqla oxunması üçün də bütün bacarığını ortaya qoyaraq ana dilimizin şirinliyinə diqqət yetirmiş, bu əsərlərin sadə və anlaşıqlı olmasına çalışmış.

Tanınmış tənqidçi-alim Vaqif Yusifli X.Hasilovanın yaradıcılığına belə qiymət verir: "Uşaq ədəbiyyatı elə bir yaradıcılıq sahəsidir ki, burada müəllif mümkün qədər ideoloji təzyiqlərdən uzaq olmağa çalışır, uşaqlara Vətəni, ata-ananı, məktəbi, elm və təhsili, təbiəti sevməyi təbliğ edir, xalqın qəhrəman oğullarını, qızlarını, nənələrimizin, babalarımızın müdrikliyini nümunə göstərir... O illərdə kiçik yaşlılar olsun, ya məktəblilər, onlara ilk növbədə, Vətəni sevmək, təbiəti qorumaq, əməyə, zəhmətə alışdırmaq, babalara, nənələrə hörmət etmək və əlbəttə, yaxşı oxumaq, bilikli olmaq tövsiyə edilirdi (Yusifli, 2015: 7)".

Ədibin yaradıcılığından gətirdiyimiz nümunələr onu deməyə əsas verir ki, bu mövzularda hekayələrin dərsliklərə salınması, sinifdənxaric oxu kimi tövsiyə olunması məktəb yaşlı oxucuların mənəvi aləminin zənginləşməsinə xidmət göstərir, onları müsbət əxlaqi keyfiyyətlərə malik bir şəxsiyyətə çevirir.

Haqqında danışmaq istədiyimiz yazarlardan biri də Namiq Abdullayevdir. N.Abdullayev öz əsərlərində elmi-fantastik janra müraciət etmiş, bu janrın maraqlı nümunələrini yaratmışdır. Namiq Abdullayevin bu janrda yazdığı əsərlər onun "Sehrli oğlan", "İtirilmiş dunya", "Balaca Kiberin macəraları", "Gecələr uzanaydı", "Piyada vəzirə çevrilir" kitablarına toplanmış, oxuçuların böyük rəğbətini qazanmışdır.

Ədibin elmi-fantastik janrda yazdığı hekayələr uşaqlar tərəfindən böyük maraqla qarşılanır. "Sehrli oğlan", "Sualtı buruq", "Mənim dörd yüz yaşım var", "Tom Vilyam gözə görünmür" hekayələrində müasir elm və texnikanın yeniliklərindən danışılır.

"Mənim dörd yüz yaşım var" hekayəsində baş qəhrəman müəllifin öz prototipidir. Əsərin qəhrəmanı kənddə müəllim işləyir və ara-sıra fantastik hekayələr də yazır. Yer kürəsindən savayı mövcud olan digər planetlər, "qəribə aləmlər" onu daim özünə çəkirdi. Bir gün eşidir ki, planetlərdən birinə səyahət var. O, ərizə yazaraq özünü ekspedisiyanın tərkibinə saldırır. Əsas hadisələr də elə buradan başlayır. Onlar səyahətdən Yerə qayıdanda məlum olur ki, orada keçən bir il Yerdəki 371 ilə bərabər imiş və ailəsini axtrarkən tapmayan gənc 89 yaşlı qoca ilə tanış olduqdan sonra hər şey məlum olur. Qocanın göstərdiyi ailə albomundan bəlli olur ki, bayaqdan bəri baba dediyi qoca əslində 29 yaşlı bu gəncin nəticəsinin nəticəsinin nəticəsidir (Abdullayev, 1960: 26-35)".

Müəllifbuhekayədə həm uşaqları maraqlandıran digər planetlər, qallaktikalar, zamanlar arasındakı səyahətlər, oradakı varlıqlar, onların yaşam tərzləri haqqında fövqəltəbii mövzulara toxunmuş, həm də oxuculara astronomiya, riyaziyyat, fizika, təbiətşünaslıq elmlərinə dair biliklər aşılamağa çalışmışdır.

Ədib hekayələrində həm uşaqları maraqlandıran digər planetlər, qallaktikalar, zamanlar arasındakı səyahətlər, oradakı varlıqlar, onların yaşam tərzləri haqqında fövqəltəbii mövzulara toxunmuş, həm də oxuculara astronomiya, riyaziyyat, fizika, təbiətşünaslıq elmlərinə dair biliklər aşılamağa çalışmışdır. N.Abdullayev özü bu haqda yazır ki: "... bu janrda bədii əsər yazmaq çox çətindir. Çünki əsl fantast-müəllif uzun və ciddi hazırlıq yolu keçməlidir. O, demək olar ki, bütün elmlərdən xəbərdar olmalı, elmi-texniki yenilikləri daim izləməli, informasiya kasadlığı çəkməməlidir (Əhmədov, 1987: 5)".

Ş.A.Mikayılovun və A.A.Səmədovun birgə tərtib etdikləri "Fantastik hekayə və povestlər" kitabı 1987-ci ildə işıq üzü görmüşdür. Kitabın "Elmi-fantastika inkişafın tələbidir" adlı ön sözündə Allahverdi Eminov fantastik əsərlərin özünəməxsusluğunu belə vurğulayır: "Əgər elmi-fantastika ilə yalnız uşaq və gənclərin maraqlandığını nəzərdə tutsaq, görərik ki, məhz elmin gələcək inkişafı onların üzərinə düşür. Tamamilə aydındır ki, gənc müasirlərimiz həm də elmi kütləviləşdirən adamlar kimi yetişirlər. Gənclərə emosional təsir zamanı gələcəyin bədii strukturu elmi kəşf və nailiyyətlərlə birləşərək elmi-fantastika yaradır. Bu isə gəncləri elmin qabaqcıl cərgəsinə çağırır (Mikayılov, Səmədov, 1987: 4)" .

Yuxarıda adı çəkilən kitaba digər fantastlarla yanaşı N.Abdullayevin də "Dirilmə" povesti və "Kölgələr" hekayəsi daxil edilmişdir. "Kölgələr" hekayəsində zavodda işləyən fəhlələrin ağır vəziyyətindən, sahibkarın etdiyi haqsızlıqdan, fəhlələrin kölgəsini belə satın almasından söhbət açılır. Elmi-fantastik əsərlərin son dövrdə azlıq təşkil etməsi Namiq Abdullayevi narahat edirdi. O özü bu haqda yazırdı: "... bizim ədəbiyyatımızda bu janr üzrə "ixtisaslaşan" yazıçı azdır. Bu isə elmi-fantastik janrda qələmə alınmış hər bir müəllifə, hər bir əsərə istər-istəməz qayğı ilə yanaşmağı tələb edir". Bu janrda yazılmış əsərlərə məktəb yaşlı oxucular böyük həvəs göstərirlər. Odur ki, yazıçılarımız elmi-fantastik janra üstünlük verməli, yeni-yeni əsərlərlə uşaqları təəccübləndirməyə davam etməlidirlər. Bu onların zehni qabiliyyətlərinin, təfəkkürlərinin inkişafına xidmət göstərər, onları elmi icadlara sövq edər (Əhmədov, 1987: 5)". Elmi-fantastik janrın bu özünəməxsusluğu məktəb yaşlı uşaqların elmi biliyinin, fantaziyasının, dünyagörüşünün, təfəkkürünün inkişafında müsbət rol oynayır, onların elmi və texniki biliklərinin artmasına kömək edir, bu sahədə öz fantaziyalarını işə salaraq nailiyyətlər əldə etməyə həvəsləndirir. Bu janrda yazılmış əsərlər məktəbliləri texnologiyanın inkişafına fokslandırır, onların xəyal güclərini daha da inkişaf etdirir. Odur ki, bu mövzularda yazılmış əsərlərin uşaqlar tərəfindən oxunması onların zehni qabiliyyətlərinin inkişafına müsbət təsir göstərməsi həm valideynlər, həm də müəllimlər tərəfindən nəzərə alınmalı, bu əsərlərin ətrafında diskussiyalar təşkil olunmalı, şagirdlərin öz fikirlərini söyləmələri üçün şərait yaradılmalıdır. Bu onların öz fantaziyalarını müsbət yöndə ortaya qoya bilmələrinə, bəşəriyyətə faydalıı ola biləcək yeni-yeni texnikaların, elmi icadların, ixtiraların meydana gəlməsinə yol açar.

## Nəticə

Yuxarıda adları çəkilən müəlliflərin hər biri əsərlərinin dil-üslub baxımından sadə və anlaşıqlı, yaddaqalan, aydın və səlis olmasına diqqət yetirmişlər. Bu əsərlər ballaca oxucunu düşündürür, onların zehni inkişafına, təfəkkürünə, leksikonunun zənginləşməsinə müsbət təsir göstərir.

Bu janr həcmcə kiçik olduğuna görə, xüsusən, kiçik yaşlı məktəblilərin oxusu üçün əlverişlidir və aşağı siniflərdə - ədəbiyyat fənninin tədrisində bu janra, təbii ki, dil-üslub baxımından və ideyaca yüksək keyfiyyətə malik hekayələrə üstünlük verilməsi tövsiyəolunandır.Bu kimi hekayələr dərsliklərə salınmaqla yanaşı sinifdınxaric oxu kimi də şagirdlər tərəfindən oxusu təşkil olunmalıdır.Elmi-fantastik janrda yazılmış əsərlərin oxusuna önəm verilməli, ədəbiyyat dərslərində müəllimlər tərəfindən bu əsərlərin müzakirəsi və mübadiləsi keçirilməlidir. Bu tipli əsərlər uşaqlarda yeni bacarıqların yaranmasına yol açar, onları yeni icadlara sövq edər.

## Ədəbiyyat

1. Namazov, Q. (2007). Azərbaycan uşaq ədəbiyyatı. Bakı Universiteti nəşriyyatı, 444 s.
2. Əsgərli, F. (2009). Azərbaycan uşaq ədəbiyyatının mərhələli inkişafı. Bakı: ADPU-nun nəşriyyatı, 435 s.
3. Namazov, Q. (2007). Azərbaycan uşaq ədəbiyyatı. Bakı Universiteti nəşriyyatı, 444 s.
4. Əhməd, V.M. (2006). Azərbaycan uşaq ədəbiyyatı. Bakı: Müəllim nəşriyyatı, 338 s.
5. Babayeva, Ə. (1974). Sehrli pillələr. Bakı: "Gənclik" nəşriyyatı, 109 s.
6. Xəlil, Z. (2008). Seçilmiş əsərləri, VI cild. Bakı, 195 s.
7. Hasilova, X. (1983). Ləpəli sahilin xatirələri. Bakı: Gənclik nəşriyyatı, 300 s.
8. Yusifoğlu, R. (2002). Uşaq ədəbiyyatı. Bakı: Təhsil nəşriyyatı, 268 s.
9. Həsənli, B. (2013). Azərbycan uşaq ədəbiyyatı. Bakı: "Müəllim" nəşriyyatı, 511 s.
10. Yusifli, V. (2015). Zərif hisslər tərənnümçüsü. Ədalət, 13 may.
11. Abdullayev, N. (1960). Sehrli oğlan. Bakı: Uşaqgəncnəşr, 53 s.
12. Əhmədov, Q. (1987). Yad dünyadan qonaq. (Ön söz-N.Abdullayev). Bakı: Yazıçı, 104 s.
13. Mikayılov, Ş.A., Səmədov, A.A. (1987). Fantastik hekayə və povestlər. Bakı: Maarif, 240 s.

Göndərilib: 01.08.2023 Qəbul edilib: 29.10.2023

DOI: https://doi.org/10.36719/2663-4619/96/51-56

**Yeganə Məmmədova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
pedaqogika üzrə fəlsəfə doktoru
yeganememmedova.doc@gmail.com

# MƏKTƏBƏQƏDƏR TƏHSİL MÜƏSSİSƏLƏRİNDƏ UŞAQLARIN NİTQİNİN ƏMƏK PROSESİNDƏ İNKİŞAF ETDİRİLMƏSİ YOLLARI

**Xülasə**

Uşağı əmək fəaliyyətinə hazırlamaq, onda əməksevərlik hissi tərbiyə etmək məktəbəqədər uşaq müəssisələrinin qarşısında duran ən ümdə vəzifələrdən biridir. Bu dövrdə uşaqların əməyi özünəməxsus xüsusiyyətlərə malikdir. Əmək prosesi realdır, çünki uşaq real əşyalarla iş görür. Uşaq əməyi, onun müvəffəqiyyətini o vaxt dərk edir ki, onu yaşlıların fəaliyyətində müşahidə etsin, hekayə və nağıllardan, dinlədiyi kitablardan eşitsin, baxdığı şəkillərdə görsün. Məktəbəqədər yaşlı uşaqların əmək fəaliyyətinin təşkili işin planlaşdırılması və düzgün başa düşülməsindən çox asılıdır. Uşaqların əmək fəaliyyəti nə qədər məqsədyönlü və aydın olarsa, onun yerinə yetirilməsi bir o qədər maraqlı və müfəssəl olar. Əmək məktəbəqədər yaşlı uşaqların dünyagörüşünün formalaşmasında, ətraf mühitin düzgün dərk edilməsində və ona müsbət münasibət bəslənməsində böyük rol oynayır.

***Açar sözlər:*** *məktəbəqədər təhsil, əmək prosesi, nitq inkişafı, ətraf mühit, yollar, vasitələr*

**Yegana Mammadova**
Azerbaijan State Pedagogical University
PhD in pedagogy
yeganememmedova.doc@gmail.com

## Ways to develop children's speech in the labor process in pre-school educational institutions

**Abstract**

Preparing a child for work, instilling a sense of diligence in him is one of the most important tasks facing preschool children's institutions. Children's work in this period has its own characteristics. The labor process is real, because the child works with real objects. Child labor realizes its success when he observes it in the activities of adults, hears it from stories and fables, books he listens to, and sees it in the pictures he looks at. The organization of labor activities of preschool children depends greatly on the planning and proper understanding of the work. The more purposeful and clear the labor activity of children is, the more interesting and detailed its performance will be. Work plays a big role in the formation of the worldview of preschool children, in the correct understanding of the environment and in fostering a positive attitude towards it.

***Keywords:*** *preschool education, labor process, speech development, environment, ways, means*

## Giriş

Əmək insanın həyatının əsasını təşkil edir. Uşaqlar hələ kiçik yaşlarından öz güclərinə müvafiq əmək işlərinə cəlb olunur, getdikcə onların əmək fəaliyyətinin hüdud dairəsi genişləndirilərək mürəkkəbləşdirilir. Düzgün təşkil olunan və məqsədyönlü həyata keçirilən əmək uşağın bütün şəxsi keyfiyyətlərinə müsbət təsir göstərir, onun gələcək həyat yolunu müəyyənləşdirməkdə həlledici rol oynayır. Əmək insanın cəmiyyət xeyrinə maddi və mənəvi nemətlər istehsal etmək məqsədilə həyata keçirdiyi mütəşəkkil fəaliyyətdir. Özü də bu fəaliyyət kollektiv şəkildə həyata keçirildiyindən tələb edir ki, hər bir uşaq başqaları ilə ünsiyyətdə, qarşılıqlı münasibətdə çalışsınlar.

Uşağı əmək fəaliyyətinə hazırlamaq, onda əməksevərlik hissi tərbiyə etmək məktəbəqədər uşaq müəssisələrinin qarşısında duran ən ümdə vəzifələrdən biridir. Bu dövrdə uşaqların əməyi

özünəməxsus xüsusiyyətlərə malikdir. Onların əməyi çox vaxt oyunla əlaqədar olur. Bu özünü müxtəlif formada göstərir. Bəzən oyun yaşlıların əməyini əks etdirir, bəzən də əmək elementləri oyunda əks olunur. Əmək prosesində bəzən uşaqlar qarşıya məqsəd qoyur, əvvəldən işi planlaşdırır, öz fəaliyyətlərini ona müvafiq qurur və müəyyən nəticə əldə edənə kimi işləyirlər. Əmək prosesini əsasən oyun zamanı həyata keçirən yaşlılar uşaqlara elə tapşırıqlar verməlidirlər ki, onlar həmin tapşırığı yerinə yetirərkən həm də əmək fəaliyyəti üçün zəruri olan müəyyən sözləri öz nitqlərində işlətməyə çalışsınlar. B.S.Muxina qeyd edir ki, bağça şəraitində uşaqlara verilən əmək tapşırıqları müxtəlif xarakterli ola bilər: bu həm yaşlıların müxtəlif tapşırıqlarının yerinə yetirilməsi, həm növbətçilik vəzifələrinin icrası, otaq bitkilərinə və ev heyvanlarına qulluq etmək, uşaq bağçası sahəsində işləmək, həm də kağız, karton, ağac, parça və s.dən xırda məmulatlar hazırlamaq şəklində həyata keçirilə bilər (Mukhina, 1985: 56). Belə tapşırıqlar uşaq tərəfindən əsl əmək mənasında başa düşülmür; həmin iş yaşlılar tərəfindən müvafiq şəkildə təşkil olunduqda və istiqamətləndirildikdə əmək hərəkətlərinin köməyi ilə icra olunmağa başlayır.

Əmək prosesi realdır, çünki uşaq real əşyalarla iş görür. Uşaqlarda ünsiyyət inkişaf edir, fikir vahidliyi yaranır, böyüklərin təcrübəsindən istifadə olunur və belə təcrübə nümunə xarakteri daşıyır. Bu dövrdə uşağa müəyyən əmək tapşırığı verdikdə o, onu oyundan fərqləndirməyərək əmək fəaliyyəti kimi başa düşmür. Uşaq əməyi, onun müvəffəqiyyətini o vaxt dərk edir ki, onu yaşlıların fəaliyyətində müşahidə etsin, hekayə və nağıllardan, dinlədiyi kitablardan eşitsin, baxdığı şəkillərdə görsün. Əmək tapşırıqlarının icra şəraitinin təşkilinə aşağıdakılar daxildir:

1. Uşaqlara zəruri iş tərzlərinin öyrədilməsi.
2. Onlara müvafiq bilik, bacarıq və vərdişlərin, xüsusilə, alətlər və materiallarla rəftar etmək bacarığının aşılanması.
3. İşin mənasını, onun başqa adamlar üçün əhəmiyyətininin müfəssəl, ətraflı izahının verilməsi.
4. Öz hərəkətlərini planlaşdırmaqda və uzlaşdırmaqda uşağa köməklik göstərilməsi (Əsgərova, 1978: 47).

Məktəbəqədər dövrdə uşaqlarda çalışqanlığın, əməyə məhəbbət hissinin tərbiyə edilməsi böyük əhəmiyyət kəsb edir. Fiziki əmək üzrə ilkin vərdişlərə yiyələnmiş, əməyə, əmək adamlarına məhəbbətlə yanaşmağa alışmış uşaqlarda proses başa çatanadək, müəyyən nəticə əldə edilənədək səy göstərmək, bu yaşda çətinlikləri dəf etmək, iradəlilik kimi keyfiyyətlər formalaşır. Bu isə öz növbəsində uşağı əməyə, təlim çətinliklərini aradan qaldırmağa hazırlayır. Ona görə də ailədə, uşaq bağçalarında uşaqları erkən yaşlardan əməyə alışdırmaq vacibdir. R.Ə. Əsgərova böyük rus pedaqoqu K.D.Uşinskinin fikrində böyük həqiqqət olduğunu qeyd edərək yazır: «uşağını əməkdən çəkindirən bəzi valideynləri övladlarını xoşbəxtlikdən məhrum edən, mənəviyyat cəhətdən şikəst edən valideynlər adlandırmışdır» (Əsgərova, 2006: 125). Valideynlər uşaq əməyini planlaşdırarkən mövcud olan çətinliklərin uşağın həyat təcrübəsinə müvafiq olmasını nəzərə almalı və onların aradan qaldırılması yollarını qabaqcadan müəyyən etməlidirlər.

Məktəbəqədər yaşlı uşaqların əmək fəaliyyətinin təşkili işin planlaşdırılması və düzgün başa düşülməsindən çox asılıdır. Uşaqlar nəyin necə və nə üçün icra olunması arasındakı əlaqəni görməlidirlər. Uşaqların əmək fəaliyyəti nə qədər məqsədyönlü və aydın olarsa, onun yerinə yetirilməsi bir o qədər maraqlı və müfəssəl olar.

Məktəbəqədər yaşlı uşaqların əmək növləri müxtəlifdir: Özünəxidmət əməyi, təsərrüfat-məişət əməyi, təbiətdə əmək, əl əməyi (Həsənov, 2000: 236). Özünəxidmət əməyi kiçik qruplarda daha çox tətbiq olunur və uşaqlara çətinliyi aradan qaldırmaq, müstəqillik, səliqəlilik kimi keyfiyyətlər aşılayır. Özünəxidmət əməyini həyata keçirərkən tərbiyəçi kollektiv işlə yanaşı, uşaqları fərdi qaydada işlətməli, hər bir uşağı fəaliyyətə ruhlandırmalı, onda öz qüvvəsinə inam yaratmalıdır. Başlıcası isə tərbiyəçi çalışmalıdır ki, bu yaş dövründə uşaqlar özünəxidmətin əhəmiyyətini aydın dərk etsinlər.

Məktəbəqədər yaşlı uşaqların orta qrupunda özünəxidmət əməyinin məzmunu nisbətən inkişaf edir. Bu yaşda uşaqlar müəyyən iş görəndə yaşıdlarına da göz qoyur və onların nöqsanlarını nəzərlərinə çatdırırlar. Orta qrupun uşaqları işi nisbətən sərbəst icra edirlər. 5-6 yaşlı uşaqlarda sərbəstlik və müstəqillik daha da güclənir. Onlar özləri geyinir, soyunur, özünə müvafiq işləri

sərbəst icra edirlər. Çox vaxt özündən kiçik bacı-qardaşlarına nümunə olur, onlara köməklik göstərirlər (Kərimov, 1966: 12). Orta qrupda təsərrüfat-məişət əməyi özünəməxsus əhəmiyyət kəsb edir. Bu yaşlı uşaqlar ilin axırına yaxın qayda-qanuna müstəqil riayət edir, otağın, iş yerinin yığışdırılmasında iştirak edirlər. Böyük qrupda isə uşaqların təsərrüfat-məişət əməyinin məzmunu daha da genişlənir. Tərbiyəçi bu prosesdə uşaqlara bir-biri ilə razılığa gəlmək, kömək göstərmək kimi bacarıqları aşılayır. Məktəbəhazırlıq qrupu uşaqlarının təsərrüfat-məişət əməyi məzmunca mürəkkəb xarakter daşıyır. Məsələn, süfrənin düzəldilməsi, stolun güllərlə bəzədilməsi, ikinci və üçüncü yeməyin paylanması kimi proseslər də daxildir.

Uşaqların təbiətdə əməyi onların sağlamlığında, hərəkətlərinin kamilliyində, bacarıq və vərdişlərin formalaşdırılmasında mühüm rol oynayır. Birinci kiçik qrup uşaqlarının imkanları məhdud olduğundan əmək tərbiyəsi onlara anlaşıqlı olan təbiət hadisələri əsasında həyata keçirilir. Üç yaşlı uşaqların əməyi yalnız əyani təsirli təlim zamanı həyata keçirilir. Həyatının dördüncü ilində uşaqlara izah edilir ki, quşlara qulluq etmək, dən, ot vermək lazımdır.

Orta qrup uşaqlarında əməyə şüurlu münasibət nisbətən güclü olur. Uşaqlar təbiət hadisələrini müşahidə edərkən tanış əşyaları səciyyəvi əlamətlərinə görə müqayisə etməyi və qruplaşdırmağı öyrənirlər.Böyük qrup uşaqlarının əməyi mürəkkəb xarakter daşıyır. Onların əməyi keyfiyyətə, işi vaxtında və müstəqil görməyə görə qiymətləndirilir. Bu keyfiyyətləri nəzərə alıb tərbiyəçi uşaqları təbiət guşəsində növbətçiliyə cəlb edir. Tərbiyəçi çalışmalıdır ki, uşaqlar işi səliqəli və təmiz icra etsin, qoyulmuş məqsəd onların gücünə müvafiq olsun (Nəzərov, 2011: 119). Uşaq şəxsiyyətinin formalaşmasında əl əməyinin müstəsna əhəmiyyəti vardır. Müxtəlif materiallardan uşaqların oyuncaq və əşyalar düzəltməsi məktəbəqədər yaşlı uşaqların, xüsusən böyük qrup uşaqlarının əmək tərbiyəsinin mühüm cəhətlərindən biridir. Əl əməyinin məzmununda quraşdırma əməliyyatı mühüm yer tutur. Bu əmək zamanı uşaqlar əşyalar haqqında təsəvvürlərini genişləndirir, texnika haqqında müəyyən məlumata malik olurlar.

"Uşaq bağçasının təlim-tərbiyə proqramı"nda əməyə, əmək prosesində nitqin inkişaf etdirilməsinə geniş yer verilmişdir. Əmək prosesində uşaqların nitqinin inkişafını öyrənmək məqsədilə biz eksperimental bağçalarda məktəbəqədər yaşlı uşaqların əmək prosesində nitqinin inkişaf etdirilməsini üç istiqamətdə təşkil etdik:

1. Əmək təlimi məşğələlərində uşaqların lüğət ehtiyatına müxtəlif nitq hissələrinə dair sözlər daxil etməklə lüğəti fəallaşdırmaq, zənginləşdirmək;
2. Cümlə qurmaq, onu genişləndirmək bacarığını inkişaf etdirmək;
3. Rabitəli nitqi inkişaf etdirmək (Kərimov, 2009: 140).

Əmək prosesində uşaqlar ilk növbədə rastlaşdıqları əşya və əməliyyatların adlarını öyrənir, lüğət ehtiyatını zənginləşdirirlər. Əməyin müşahidə edilməsi uşaqlar üçün daha maraqlı olur. Müşahidə uşaqlarda əməyə müsbət münasibət yaratmağa kömək edir, onları ictimai əməyə daha da yaxınlaşdırır. Unutmaq olmaz ki, yaşlıların əməyə emosional münasibəti uşaqlara böyük təsir edir. Yaşlılarla uşaqların əlbir fəaliyyəti üçün əmək növü seçərkən bəzi mühüm prinsipləri rəhbər tutmaq lazımdır.

Əmək uşaqlar üçün təbii, zəruri, həyati əhəmiyyətli, ümumilikdə gigiyenik baxımdan əlverişli olmalıdır. İşin daha mürəkkəb, zəhmət tələb edən, uşaqların gücərinə müvafiq olanını böyüklər onlara tapşırmalıdır. Yaşlılarla uşaqların əməkdaşlıq formaları işin konkret məzmunundan, uşaqların yaşından, həmçinin əmək prosesində böyüklərdən neçə nəfərin iştirak etməsindən asılıdır. Böyüklər uşaqlarla birgə əmək fəaliyyətində onlara mümkün qədər müstəqillik verməlidirlər ki, daha fəal olsunlar.

Tərbiyəçi uşaqların əmək fəaliyyətini təşkil edərkən aşağıdakı priyomlardan istifadə etməlidir:

1. İşin obrazlı təşkili.
2. İşin gedişinin izahı.

İşin məzmunu və əhəmiyyəti uşaq şüuruna elə çatdırılmalıdır ki, o uşaqlarda heyranlıq hissi oyatsın. Bu zaman uşaqların əmək prosesində nitqini inkişaf etdirmək üçün aşağıdakı yollardan ardıcıllıqla istifadə etməklə müvəffəqiyyətə nail olmaq olar:

*Birincisi,* əməyi tərənnüm edən ədəbi, bədii parçalar, şeirlər, hekayələr və nağıllar oxumaqla;

*İkincisi,* əmək prosesini tərənnüm edən söhbətlər, müsahibələr vasitəsilə;

*Üçüncüsü,* əmək prosesinə həsr olunmuş şəkillərə, televiziya verilişlərinə, video filmlərə tamaşa etməklə;

*Dördüncüsü,* yaşlılarla uşaqların birgə əmək fəaliyyətini təşkil etməklə (Arkin, 1968: 236).

Tərbiyəçi uşaqları əmək fəaliyyəti ilə tanış edərkən nəzərdə tutulmuş yollardan əlaqəli surətdə istifadə etməlidir. Yəni, tərbiyəçi uşaqları əmək fəaliyyəti ilə tanış etmək məqsədilə onlara bədii əsərlər oxumalı, birlikdə müvafiq filmlərə tamaşa etməli, daha sonra isə həmin əsərin məzmununa uyğun yerlərə ekskursiyalar təşkil etməlidir. Belə olduqda uşaqlar əvvəlcə eşidir, sonra ekskursiyaya gedir, daha sonra isə həyatda olduğu kimi müşahidə edirlər. Məktəbəqədər yaşlı uşaqların nitqini inkişaf etdirmək üçün belə əlaqəli və ardıcıl işin təşkili zəruridir.

Uşaq bağçasında uşaqların yaşlıların əməyi ilə tanışlıq ildə iki dəfə: qışda və yazda məşğələ saatlarında təşkil edilir. Bu zaman uşaqlar böyüklərin sahədə, küçədə, təmizlik və qayda-qanuna rəayət etmələrini, sahələri sulamaq üçün şlanqdan, süpürgəçinin süpürgədən necə istifadə etməsini öyrənirlər. Orta qrupda uşaqların yaşlıların əməyi ilə tanışlıq dairəsi nisbətən genişlənir.

Əmək məktəbəqədər yaşlı uşaqların dünyagörüşünün formalaşmasında, ətraf mühitin düzgün dərk edilməsində və ona müsbət münasibət bəslənməsində böyük rol oynayır. Təcrübə göstərir ki, uşağın fəaliyyəti onun düşüncəsinin nəticəsidir. Yəni uşaq necə düşünür, necə təsvir edirsə, eləcə də fəaliyyət göstərir. Bütün bunlar sübut edir ki, öz fəaliyyətini təşkil etmək üçün uşağın müvafiq bilik, bacarıq və vərdişlərə yiyələnməsinə ehtiyac vardır. Uşaqların konkret əmək prosesinin gedişini təsvir etmələri onların nitqinin inkişafına kömək edir. Prof. Y.Ş.Kərimov yazır ki, müşahidə zamanı uşaqlara əşyanın hazırlanma prosesini göstərmək və onu təsvir etmək lazımdır; məsələn, tərbiyəçi müxtəlif növ parça kəsiklərini uşaqlara göstərib kukla üçün parça seçir, paltar tikir, onların gözləri qarşısında önlük, don biçir və tikir.

Bu zaman uşaqlar ölçmək, nişanlamaq, biçmək, kəsmək, kökləmək, tikmək, ütüləmək kimi proses bildirən sözləri, feilləri öyrənirlər (Kərimov, 2009: 85). Bu zaman əşyaların hissələri, keyfiyyəti, xassələri ilə tanışlıq üzrə məşğələlər uşaqların nitqinə çox geniş və rəngarəng söz ehtiyatının daxil olmasına imkan verir. Bu sözlər müxtəlif nitq hissələrini əhatə edir: isim (əşyalar və onların hissələri), feil (əşyanın hərəkətinin adı, əşyadan istifadə edilməsi, onu yoxlama əməliyyatı), sifət (keyfiyyət və xassəsi).

«Uşaq bağçasının təlim-tərbiyə proqramı»nda uşaqların yaş xüsusiyyətləri nəzərə alınaraq müxtəlif yaş dövrlərində əmək bölmələri verilmişdir (11). Belə ki, kiçik qrupda sadə, mədəni, səhiyyə vərdişlərinin mənimsənilməsindən başlayaraq özünəxidmət əməyi, məişət əməyi, əl əməyi və təsərrüfat-məişət əməyinə qədər təşkil edilir. Hər dəfə əmək məşğələsindən sonra həmin prosesi təsvir edən sözləri ümumiləşdirmək, cümlədə işlətmək, təsvir etmək tələb olunurdu. Yatağı yığışdırmaq, yuyunmaq, geyinmək, soyunmaq, stol açmaq, yemək, paltara qulluq etmək, qrup otağını yığışdırmaq, səliqəliliyi, təmizliyi gözləmək, təbiət güşəsində, bağçada, bağda işləmək və s. məşğələlər buna baza yaradır. Bu zaman uşağın qarşısında aydın məqsəd qoymaqla bu dövrdə öyrədilmiş sözlər fəal lüğətə daxil edilməklə, nitqdə həmin sözlər möhkəmləndirilməlidir. İşin metodikasına gəldikdə isə hər bir uşağın yaşına uyğun əmək prosesi müəyyənləşdirilir və həyata keçirilir. Tərbiyəçi hər bir uşağın nitq xüsusiyyətlərini nəzərə almaqla onları təsərrüfat, məişət əməyi ilə məşğul etməklə yanaşı, həmin sözlərin uşaqların nitqində işlənməsinə çalışmalıdır. Tərbiyəçi uşaqları müntəzəm sürətdə əməyə cəlb etməli, işdə ardıcıllığa, görülmüş işi rabitəli nitqdə ifadə etməyə xüsusi fikir verməlidir.

Böyük və məktəbəhazırlıq qrupunda uşaqların təsərrüfat-məişət əməyi üzrə iş iki istiqamətdə aparılır:

- ictimai əhəmiyyətli kollektiv əmək fəaliyyəti;
- tapşırıqların, növbətçilik vərdişlərinin ətrafdakılara faydalı olan fəaliyyət növlərinin həyata keçirilməsi ilə bağlı olan işlərin yerinə yetirilməsi (12).

Tərbiyəçi əmək prosesində uşaqların nitqini inikşaf etdirilməsi üçün yaxşı əhval-ruhiyyə yaratmağa çalışmalı, onlara öz qüvvəsinə inam formalaşdırmaqla yanaşı, yaşlılarla və yaşıdları ilə ünsiyyətə qoşmalıdırlar. Bu yaşda uşaqlar təbiətin canlı aləmi üzərində müşahidəyə cəlb

olunmalıdırlar. Qışda uşaqların diqqəti qışlayan quşların davranışına, qar basmış ağac və kollara cəlb olunur. Bağçada uşaqların iştirakı ilə ağacların dibi qarla basdırılır, bu zaman onlara izah edilməlidir ki, qalın qar qatı ağacın köklərini şaxtadan qoruyur. İstilər düşəndə isə qar əriyir və ağaclar doyunca su içir. Uşaqlar təbiət hadisələrini müşahidə edərkən tanış əşyaların səciyyəvi əlamətlərinə görə müqayisə etməyi və qruplaşdırmağı öyrənirlər.

## Nəticə

Əmək prosesi realdır, çünki uşaq real əşyalarla iş görür. Oyunda isə uşaqlar yaşlıların əmək işlərini təqlid edirlər. Belə oyunlar, adətən, uşaqların özü tərəfindən təşkil edirlir. Əmək prosesində isə işin nəticəsi ön plana keçir, hamı işin nəticəsi ilə maraqlanır. Uşaqlarda ünsiyyət güclənir, fikir vahidliyi yaranır, böyüklərin təcrübəsindən istifadə olunur və belə təcrübə nümunə xarakteri daşıyır. Bütün bunlar əməkdə son nəticənin müvəffəqiyyətlə əldə olunmasına yaxından kömək edir.

Məktəbəqədər yaşlı uşaqların əmək fəaliyyətinin təşkili işin planlaşdırılmasından və düzgün başa düşülməsindən çox asılıdır. Uşaq nəyin necə və nə üçün icra olunması arasındakı əlaqəni görməlidir. Tərbiyəçi uşaq əməyini planlaşdırarkən mövcud olan çətinliklərin uşağın həyat təcrübəsinə müvafiq olmasını nəzərə almalı və onların aradan qaldırılması yolarını görməlidir. Əməyi planlaşdırma görüləcək işin ardıcıl icrası ilə bağlı olur. Nəyi əvvəl, nəyi sonra, nə üçün başqa cür deyil, belə işləmək kimi vəzifələr əsasən işi sistemlə qurmağı tələb edir. Uşağı kiçik yaşdan əməksevərlik ruhunda tərbiyə etmək üçün ona hər gün gücünə müvafiq iş tapşırılmalıdır. Gücünə uyğun olmayan iş tapşırıldıqda uşaq müvəffəqiyyətsizliyə uğrayır və onda fiziki iş görməyə inamsızlıq yaranır. Lakin bu, heç də o demək deyildir ki, həmişə uşağa yüngül, çox zəhmət tələb etməyən iş verilməlidir. Valideynlər iş zamanı uşağın çətin vəziyyətə düşdüyünü görüb dərhal belə işi onun əlindən almamalıdırlar. Onlar çətinliyin nədən yarandığını dərk etməli və bununla da uşaqlara müstəqil hərəkət etmək imkanı yaratmalıdırlar. Uşaqlar böyüklərin, xüsusən valideynlərin əmək işlərindən nümunə götürür, onlar kimi əməksevər olmağa çalışırlar. Bunun üçün ata və analar uşaqlara öz əmək fəaliyyətlərindən, peşələrindən tez-tez maraqlı söhbətlər etməli və nümunələr göstərməlidirlər. Unutmaq olmaz ki, uşaqlarda əməksevərlik tərbiyəsini ancaq nəsihətlə, söhbətlə yaratmaq mümkün deyil. Uşaqlara ailədə kiçik də olsa, daimi iş tapşırmaq çox vacibdir. Onlar bilməlidirlər ki, ailədə mənim gündəlik vəzifəm nədir, bu işi görməklə mən nə kimi fayda verirəm. Uşaq lap kiçik də olsa hər gün bir iş görməli, həmin işin icrası üçün məsuliyyət daşıdığını hiss etməlidir.

Əmək tapşırıqları verilərkən uşaqların yaş xüsusiyyətləri və idrak imkanları da diqqət mərkəzində saxlanılmır, bu zaman bir sıra çətin işləri icra etməyə uşağın qüvvəsi çatmır. Buna görə də məktəbəqədər yaşlı uşaqlara məzmunca yüngül, həcmcə kiçik işlər tapşırmaq lazımdır. Bu zaman uşaq əmək prosesində bir sıra keyfiyyətlərə və davranış formalarına yiyələnir ki, onun sayəsində o, insan cəmiyyətinin kiçik üzvünün, əlbəttə, sonralar inkişafa və təkmilləşməyə ehtiyacı olan bir şəxsiyyətə çevrilməsinə istiqamətləndirir. Uşaqlara əmək tapşırığı verərkən tərbiyəçi birinci növbədə tapşırığın məzmununu, onun kollektiv və yaxud fərdi formasını nəzərə almalı, bütün formaların qarşılıqlı formada keçirərkən uşaqların nitq inkişafına geniş yer verməlidir.

Uşaq bağçalarında uşaqların əmək tapşırıqları tələb edilən səviyyədə həyata keçirilsə də, rəğbətləndirilmə və çəkdiyi zəhmətin yaşlılar, tərbiyəçilər tərəfindən qiymətləndirilməsi nitq inkişafı baxımından çox böyük əhəmiyyət kəsb edir. Belə ki, əgər uşağın əməyi düzgün qiymətləndirilmirsə, uşaqda əməyə etinasızlıq, laqeydlik, bəzi hallarda isə nifrət hissinin əmələ gəlməsinə səbəb ola bilər. Odur ki, uşağın əməyi düzgün qiymətləndirilməli, yaxşı və pis cəhətləri mütləq nəzərə çatdırılmalı, xoşa gələnlər təqdir edilməli, etiraz doğuranlar isə aradan qaldırılmalıdır. Məktəbəqədər yaşlı uşaqalrın tərbiyəsində müntəzəmlik və vahidlik prinsipi həlledici rol oynayır.

Bu baxımdan məktəbəqədər tərbiyə müəssisələrində aparılan tərbiyə işləri eyni qayda ilə ailədə də davam etdirilməlidir. Əks təqdirdə məktəbəqədər yaşlı uşaqlarda əxlaqi keyfiyyətlərin formalaşması pozula bilər.

**Ədəbiyyat**

1. Mukhina, V.S. (1985). Detskaya psikhologiya. M.: Prosveshcheniye, 272 s.
2. Əsgərova, R.Ə. (1978). Uşaqların tərbiyəsində əmək və oyunların qarşılıqlı əlaqəsi. İbtidai məktəb və məktəbəqədər tərbiyə. № 3, s.47-49.
3. Əsgərova, R.Ə. (2006). Məktəbəqədər yaşlı uşaqların rabitəli nitqinin inkişafı. Bakı: Hərbi, 160 s.
4. Həsənov, A.M. (2000). Məktəbəqədər pedaqogika. Bakı: Nasir, 374 s.
5. Həsənov, A.M. (1993). Məktəbəqədər yaşlı uşaqların əmək tərbiyəsi. Bakı: Azərbaycan, 48 s.
6. Kərimov, A.N. (1966). Uşaqların əmək tərbiyəsi. Bakı: Azərtədrisnəşr, 48 s.
7. Nəzərov, A.M., Kərimova, Z.M., Eminova, G.T. (2011). Məktəbəqədər pedaqogika. Bakı, 185 s.
8. Kərimov, Y.Ş. (2009). Məktəbəqədər yaşlı uşaqların nitq inkişafının metodikası. Bakı, 218 s.
9. Arkin, YA.A. (1968). Rebenok v doshkol'nyye gody. M.: Prosveshcheniye, 445 s.
10. Məktəbəqədər müəssisələrdə tərbiyə və təlim proqramı. (1998). Bakı, 210 s.
11. Ağayev, Ş.S. (1962). Ailədə uşağın nitqinin inkişaf etdirilməsi. Bakı: Azərtədrisnəşr, 53 s.
12. Müasir uşaq bağçalarında təlimin təşkili. (2011). Bakı: Apostrof, 96 s.

Göndərilib: 16.09.2023 Qəbul edilib: 23.10.2023

DOI: https://doi.org/10.36719/2663-4619/96/57-71

**Sədaqət Həsənova**
Naxçıvan Dövlət Universiteti
filologiya elmləri doktoru
sedagethesenova@gmail.com

# AZƏRBAYCANDA BƏDİİ DİLİN İNKİŞAF XÜSUSİYYƏTLƏRİ

**Xülasə**

Məqalədə Azərbaycan bədii dilinin inkişaf özəlliklərindən danışılır. Bu baxımdan, bədii dilimizin müxtəlif tarixi dönəmlərdə qazandığı əsas xüsusiyyətlər ön plana çəkilir. Bu xüsusiyyətlər içərisində yeni söz və ifadə yaradıcılığı, eyni tərkibli ifadə və misraların müxtəlif sənətkarlar tərəfindən işlədilərək yeni üslub keyfiyyəti qazanması, bədii dildə məişət nitqinə və dramaturgiyaya xas olan dialoq mədəniyyəti, qrammatik mövzuların bədiiləşdirilməsi kimi əlamətlər təhlilə cəlb edilir. Bədii dilin inkişaf xüsusiyyətləri ilə bağlı irəli sürülən elmi-nəzəri fikirlər dil-üslub faktları ilə əsaslandırılır.

***Açar sözlər:*** *söz, dil, ifadə, bədiilik, üslub*

**Sadagat Hasanova**
Nakhchivan State University
doctor of philological sciences
sedagethesenova@gmail.com

## Developmental characteristics of artistic language in Azerbaijan

**Abstract**

The article talks about the peculiarities of the development of the artistic language of Azerbaijan. From this point of view, the main features of our artistic language gained in different historical periods are brought to the fore. Among these features, signs such as the creation of new words and phrases, the use of phrases and verses with the same composition by different artists to acquire a new stylistic quality, the dialogue culture characteristic of everyday speech and dramaturgy in artistic language, and the artisticization of grammatical topics are included in the analysis. The scientific-theoretical ideas put forward regarding the development features of artistic language are justified by the facts of language and style.

***Keywords:*** *word, language, expression, artistry, style*

## Giriş

Bədii dil bütün dövrlərdə türk xalqlarının tarixində, o cümlədən Azərbaycanda zənginliyi və təsir gücü ilə seçilmişdir. Həm yazılı bədii dil, həm də ondan daha qədim olan şifahi bədii dil xalqımızın təfəkkür və nitq mədəniyyətini yetərincə ifadə edə bilir. Bu anlamda, şifahi bədii dilimiz daha yüksəkdə dayanır. Barmaqları mürəkkəb tanımayan, yazı-pozu bilməyən nənə-babalarımız yüzlərlə, minlərlə şeir müəlliflərindən daha gözəl, daha möhtəşəm fikirlər ifadə edən sözlər söyləmişlər:

Su gələr, axar, gedər,
Bəndləri yıxar, gedər.
Dünya bir pəncərədir,
Hər gələn baxar gedər.
Əzizim, gül üşüdü,
Şeh düşdü, gül üşüdü.
Güldün, əqlim apardın,
O necə gülüşüdü?

Şifahi ədəbi dildəki insanı heyranlıqda qoyan fikirlərin dərinliyi yüzlərlə şairi "ovsununa salıb şairlik ixtiyarını əlindən alacaq" gücə malikdir:

Əzizim, baxdı yarım,
Baxtımın taxtı yarım.
Üzündə göz izi var,
Sənə kim baxdı, yarım?!

Məgər gözün izi olurmu? Bu izi təsəvvürə gətirib görə bilmək yalnız bədii dilə xasdır.

Şifahi ədəbi dildə ümümxalq təfəkkürü əsas rol oynasa da, yazılı ədəbi dildə ayrı-ayrı söz ustalarının xidməti mühüm yer tutur. Bütün yazarlar, bir tərəfdən, ədəbiyyatın zənginləşməsinə çalışmış, digər tərəfdən isə ədəbi dilimizə müəyyən qədər töhfələr vermişlər. Hər bir sənətkara dəyər vermək üçün ilk olaraq onun dilindən başlanılmasının zəruriliyi qəbul edilmiş fikirlərdəndir. Dilin insanı dəyərləndirmək üçün əsas vasitə olduğunu deyənlər çox haqlıdırlar. Şairin ədəbi dil tarixindəki qiyməti, yeri, rolu onun dil-üslub keyfiyyətləri ilə müəyyənləşir.

Azərbaycan bədii dili uzun bir tarixi inkişaf yolu keçmiş və bu prosesdə bir sıra özəlliklər qazanmışdır. Bədii dilimizin inkişafında müşahidə olunan xüsusiyyətlər aşağıdakılardır:

1. Yeni söz və ifadə yaradıcılığı.
2. Eyni tərkibli ifadə və misraların müxtəlif sənətkarlar tərəfindən işlədilərək yeni üslub keyfiyyəti qazanması.
3. Bədii dilin milliliyə yüksək münasibəti.
4. Əski türk dili vahidlərinin və bir zaman fəal leksikaya daxil olsa da, çağdaş dövrümüzdə dildən çıxan və ya çıxmaqda olan sözlərin qorunması.
5. Bədii dildə bir misra və ya beyt daxilində eyni sözün təkrar işlənməsinin üslub mahiyyəti.
6. Bədii dildə məişət nitqinə və dramaturgiyaya xas olan dialoq mədəniyyəti.
7. Bədii dilin hikmətli fikirlərlə zənginləşdirilməsi.
8. Qrammatik mövzuların bədiiləşdirilməsi faktları və s.

**1. Yeni söz və ifadə yaradıcılığı.** Klassik və çağdaş poetik örnəklər əsasında demək olar ki, Azərbaycan bədii dilinin inkişafı prosesində hər zaman yeni söz və ifadə yaradıcılığına müsbət münasibət olmuşdur. Yazarlar əsərlərində yeni ifadə yaradıcılığı örnəklərini zaman-zaman çoxalaraq üslub keyfiyyətini təmin etmişlər. Belə ifadələrdən biri kimi "saçın zəncirinə könül vermək" uğurlu bədii dil örnəyinə əvvəl Nəsiminin, sonra isə "saçın zəncirinə könül bağlamaq" şəklində Vaqifin dilində rast gəlirik.

Miskin saçın zəncirinə verdi Nəsimi könlünü,
Ayrux nə hacətdir ana zənciri zindan, qandasan? (Nəsimi, 2004: 151)

Vaqif deyir:

Saçın zəncirinə könül bağlayıb
Məcnun kimi düşdüm dağa, Fatimə (Vaqif, 2004: 32).

Vaqifin dilində "könülə dayaq qoymaq", "dərman eləməyə ayaq qoymaq", "hicranın altından çıxmaq", "ruzigarım qara günə bağlanması", "qiblə yelləri", "canan dağı", "könüldən qeybət etmək", "yarlıq etmək", "könülün şüşəsini sındırmaq", "əhli-kamal", "zülfün sevdasına baş qoşmaq", "şəhlalanmaq", "zibalanmaq", "şeydalanmaq", "könül bağının şümşadı" və s. kimi onlarla maraqlı söz və ifadələr vardır.Sonrakı dövrdə Molla Cumanın dilindəki *dərd qılıncı, hicran ağnağı, könülün qərib qonağı, cəlladi gözlər, xəyalda hərlənmək, kamal möhtacı, sevdanın köhnəlməyi, hicran tapdağı, peşman dəftəri, möhnət çəməni* və s. kimi ifadələr təravəti ilə seçilən dil vahidlərindəndir. "Könülün evinə zəlzələ düşməsi" ifadəsi isə tamamilə təzə-tərdir:

Bir kəlmə camalın vəsfin söylədim,
Ağzımdan çıxmamış yüz dilə düşdü.
Görübən xiffətin əfqan eylədim,
Könlümün evinə zəlzələ düşdü (Molla Cümə, 2006: 108).

S.Vurğunun dilində müşahidə edilən *gecənin qəlbi, zülm eli, sayğısız divanə, elçiləmək, xəyal küsdürmək, səfalət yuxusu, tufanlar əsri, qatil qəlb, suların duyumlu səsi, köhnə romantikanın xəstə qurdu, motorlu kəlmələr, Şərqin ciyərlərini gəzən azar, şerin başında turp əkmək, qafiyəlii dəllallar, sənətin bazarı, dərd almaq, dərd yemək, dərdli qəzəl, nazik adamlar, tərlan könül, azğın ürək, ətəkli çöllər, qəlbi saz kimi çalmaq, sərsəm gecələr, rəssam xəyallı, sözün sağı, rəngi rəngləmək, topuqdan yüksəyə qalxmayan xəyal, kağızın yorulmağı, həsrətin son övladı, şəfəqlərdə çimən təbiət, sənətin yarı, çarlığın zülüm quşu, haqqın dodaqları, uğursuz dillər, ala gözlü gündüzlər, sərin küləyin nazlanmağı, səhərlərin ülkər gözü, dənizlərdə kürək çəkən xəyallar, açarsız, qapısız əfsanələr, küsəndirmək, şerin könül dastanı, könül yolçusu, axar qoşmalar, sınğın ruh, can verən şeirlər, fələk bəxtimizə baxdı qıyqacı, yaslı köynək, səhərin tərlan seyri, könül kamançası, qara böhtan, qəlbi şaxta vurmaq, azadlıq çırağı, fəlakət divi, könüldən-könülə yol açmaq, ürəyi sovqat göndərmək, ağılın fəzası, könüllər mülkü, ovçu könül* və s. kimi çoxsaylı ifadələr yeniliyi ilə seçilir.

Yeni söz-ifadə yaradıcılığı baxımından Süleyman Rüstəmin də dili zəngin və maraqlıdır. Onun dilindəki *söz dövləti, ürəkdən-ürəyə yol çəkmək , haqq sözləri hicranlı, fəlakət təbili, heçstan əhli, böhtanzadə, xanəndə bülbüllər, qan dodaqlı gülöyşələr, noğul-noğul yağan qar, payız baharı* və s. kimi ifadələr poetik sintaksis örnəkləridir. S.Rüstəmin dilində *seyran* sözü diqqəti çəkən maraqlı leksik-qrammatik vahidlərdəndir. Ədəbi dilimizdə bu leksemə Mikayıl Müşfiq, Nəbi Xəzri kimi söz sənətkarlarının dilində də rast gəlirik. Onlardan daha əvvəl isə Q.Zakirin dilində bu sözlə qarşılaşmaq mümkündür:

Badi səba, söylə mənim yarıma,
Gözəllər çıxıbdır *seyrana*, gəlsin.

S.Rüstəmin də dilində "seyran" sözünə rast gəlirik:

Bəxtini bəxtimdə görəcək aləm,
Silinib gedəcək lüğətdən ələm.
Vətən torpağını əlində qələm,
Şairlər seyrana çıxacaq mənsiz (Rüstəm, 2005: 27).

Bir sıra klassik və müasir şairlərin, o cümlədən S.Rüstəmin dili təsdiq edir ki, "seyran" sözü ədəbi-bədii dilimizdə bir çox məqamlarda işlənmişdir. Diqqətiçəkən faktdır ki, bu söz Azərbaycan dilinin orfoqrafiya lüğətində qeydə alınmayıb, lakin həmin söz əsasında formalaşan *seyrəngah* sözü 592-ci səhifədə göstərilmişdir. Necə ola bilir, sözün əsas hissəsi lüğətdə yoxdur, lakin şəkilçili forması vardır və o da heç düzgün yazılmayıb, ona görə ki, -*gah* şəkilçisi *seyrən* deyil, *seyran* sözünə qoşulmalı idi. Bu şəkilçi *bəndərgah, qibləgah, nişangah* sözlərində olduğu kimi, sözün kökünü dəyişə bilmir. Lüğətdə isə seyr+an+gah əvəzinə, seyr+ən+gah morfemlərinin birliyi diqqəti cəlb edir. Mənşə baxımından milli olmasa da, bu söz ürəyəyatan dil vahidlərindəndir.

Hüseyn Arifin dilindəki *qaya ətri, daş ətri, həsrət odu, möhnət sınağı, yuxunun naz satmağı, duman dənizi, səyyar duyğular, atüstü ehtiram, hicran dəryası, qönçə niyyət, gözün düşərgəsi, bulud-bulud yuxu, dağın qaya qulağı, könülün kövrək vaxtı, köhlən dağlar, cığır kəmənd, dözüm paltarı, duru duyğular, bir nağıllıq yalan,* Nəriman Həsənzadənin dilindəki *eşqin mənzili, ilahi ağrı, mənəvi qəsd, qul ləhcəsi, sısqa istedad, yalançı şöhrət, azadlıqdan qazanılan əsarət, istedad faciəsi, şerimizin Həmzətov kürsüsü, mikrofon xanəndəsi, eşqin pedaqoji imtahanı* kimi ifadələr uğurlu dil vahidlərindəndir.

Bundan başqa, Fikrət Qocanın dilindəki *qanunun lalı, gözəl dərd, zərif hövsələ, arzunun silahı, sərxoş qəm, soyuq mütilik, qaynar risk, hava hörmək, ömrün güney səması, xəyalın yüyrük yırğalamağı* kimi ifadələr də diqqəti çəkir.

Musa Yaqubun poetik dili də üslub tapıntıları ilə zəngindir. Şairin dilində belə bir yeni ifadə vardır: *hörmət tərəzisi*.

Ağırı, yüngülü yerbəyer eylər,
Bu dünya özü bir daş tərəzidir.
Ariflər gözündə, haqq divanında
*Hörmət tərəzisi* baş tərəzidir (5).

"Yaşıl həyəcan" birləşməsi də maraqlı dil vahidlərindəndir:

Bir buğda dəniydim, düşdüm torpağa
Şaxta, qar altında yarımcan oldum.
Torpaqdan yapışıb qalxdım ayağa,
Baharda bir *yaşıl həyəcan* oldum... (5).

"Könlümdə hələ çox *söz toxumu* var" misrasındsa isə şair "söz toxumu" adlı maraqlı birləşmə işlətmişdir. Musa Yaqubun dilindəki *qismət çiçəyi, ərk yeri, hörmət tərəzisi, sevda çiçəklərim düşüb qırğına, yağışın qərib səsi,* ilahi baxış, *ümid şeiri, ümid ulduzu, yaşıl həyəcan, söz adamı, mənafe oyunu, söz dustağı, arzunu səməndə mindirmək, günəşin tellərini əmmək, aşkarlıq xoru, şeir bazarı, hicran qoxusu, bənövşə sözü, dünyanın doğmalıq qolları, yol azan ümid, sırğa-sırğa damcılar* və s. kimi ifadələr belə tapıntılardandır. Bu baxımdan, Eldar Baxışın *xəyalın qanadında çapmaq, ölümün zirvəsi, dərdli neft, yaxşı adamların tənəzzülü, yaman adamların taraqqası, sözü minib çapmaq, sözün üstünə qar yağması* ifadələri də diqqəti çəkir. Əli Kərimin dilindəki "kainatı sahmana salmaq" ifadəsi təravəti ilə seçilir:

Qayıt, yerinə qoy Ayı, Günəşi, -
Yenə olduğutək görüm həyatı.
Qayıt, gözüm nuru, könlüm atəşi,
Qayıt, sahmana sal bu kainatı (Əli Kərim, 2004: 153).

"Kainatı sahmana salmaq" səslənməsi və mənası ilə nə qədər də gözəl ifadədir! Şair hamı kimi demir ki, ayrılıq çətindir, o, dünyanı alt-üst elədi, deyir ki, Ayı, Günəşi yerinə qoy, onlar yerində olsa, hicran da bitər. Doğrudan da, Əli Kərimin bəhs elədiyi hicran fərqlidir, diqqəti çəkəndir.

Qabilin dilimizdəki sözlər əsasında yaratdığı yeni ifadələr onun ədəbi dilimizə yüksək münasibətini üzə çıxarır. *Qürur sırımaq, ləyaqət müəllimi, sədaqət müəllimi (N.Rəfibəyli haqqında), "dümbələk şair", səviyyə fəlakəti, cəhalət qayığı, milli şərəfsiz, lal qəzəb, pərdəli kin-küdurət, əxlaq arşını, hərzə dolu yazılar, neştər dolu, əqrəb dolu, gürzə dolu yazılar, vicdanın sərhədi, ixtiyar qulu, qərar qulu, qayda qulu, zırxana, ağılın vərdişi, ağlı-qaralı mərmər dastan (Şəhidlər xiyabanı), ibrətamiz ehtişam, dəvə duyğusu, havakabab, yumruq möhürü, trəsdiqə varmaq, laqeydlik yükü, təsvirsiz təbəssüm, millətin şairinə heykəl borcu, əməl borcu, sabahkı xələfə təməl borcu, asılıq borcu, bəxtin nərd taxtası, etiraf elanı, yaltaq cəsarət, imza yarışı, haram əzəmət, quru böhtan, sərxoşluq toxumu* və s. kimi onlarla yeni mənalı ifadələr Qabilin öz qələminə məxsusdur. Sabir Rüstəmxanlının dilindəki *ağıl çıraqları, dərd ağacı, tarixə dəllallıq edən, sözün pası, torağayın səhər himni, sözlə körüklənmək, qul söz, şeirlə evdarlıq etmək, əqidə alveri, qan içəndə qorxmayanın sözdən qorxmaq müəmması, söz güdmək, sözə əvəz ehtiyac, özgənin havasını çaldıran, fitnə göyərtmək, dərd bağışlamaq, söz dəcəli, söz bayrağı, duyğuların əkinçisi, qəmin güllələnməsi, düşüncənin güllələnməsi, qisas baxışı, ölüm baxışı, intiqam məlhəmi, kürsü qəhrəmanı, çəmən hanası, kürsü vədəsi, hərracxana bayquşu, sözdən asılmaq, dərdə bələk gülməcə, xırdalar dünyası, söz bazarı, söz məzarı, söz xəstəliyi, söz yoluxucusu, qeybət itiləmək, qeybət üyütmək, qeybət məzarlığı, şeytan toxumu, tarixin hanası, inam yasağı, qəm tarixi, divanə həsrət, ruh dastanı, duyğu heykəli, yarpaq leysanı, səadətin quruması, kədərin boy atması, turşumuş gülüş, əzik sözlər, yurdun tarix hasarı, rüşvət məzənnəsi, siyasət qumu, cəhənnəmin filialı, cəhənnəmçi, ruh dili, ürək bayraqlı, tayfa mərəzi, cənnətin filialı, dəli sevda, pul işığı, tarixin pası, əllərin dilsiz cavabı, ürəyin mərhəmət savabı, möcüzə sərgisi, etnomüştəbehlər, retrokommunistlər, hədiyyə*

*çocuqları, istəyin yazı, istək yaşı, əlacsız sükut, şeytan çömçəsi, şeytan ümidi, namus qalaları, lal yazılar* və s. kimi onlarla təzə-tər söz və ifadələr ədəbi-bədii dilimizin məzənnəsini meydana qoya bilir.

Söz-ifadə yeniliyi ilə yanaşı, fikir təzəliyi də bədii dilin xarakterik cəhətlərindəndir. N. Rəfibəyli deyir:

Bilsəydim, gələcəksən,
Könlümdən bayraqlar asardım.

Məlumdur ki, hər hansı bir ölkəyə və ya şəhərə əziz qonaq gələndə yüksək yerlərdən bayraqlar asılır. "Könüldən bayrağın asılmağı" isə bədii dil faktıdır.

**2**. **Eyni tərkibli ifadə və misraların müxtəlif sənətkarlar tərəfindən işlədilməsi.** Bu faktların müxtəlif şairlərin qələmində yeni üslub keyfiyyəti yaratması bədii dilin inkişafında diqqəti çəkən faktlardandır. Məsələn, "könülün dönməyi" frazeoloji birləşməsinin anlamı ilə bağlı olan fikirlərlə bir çox sənətkarın dilində qarşılaşmaq olar. Bu mənada, Molla Cumanın aşağıdakı misralarına nəzər salaq:

Bir gözələ gözüm düşdü,
Mən dönərəm, könül dönməz.
Ruhum getdi, əqlim çaşdı,
Mən dönərəm, könül dönməz (Molla Cümə, 2006: 37)

Eyni fikri XX yüzilliyin yaddaşlardan çıxmayan, sevilən şairi M.Müşfiqin dilində də müşahidə edirik:

Tərlansan, göydən enməzsən,
Bu torpaqda sevinməzsən,
Mən dönərəm, sən dönməzsən,
Yaşa, könül, yaşa, könül! (Mikayıl Müşfiq, 2004: 188).

Bundan başqa, türk dillərində, o cümlədən Azərbaycan dilində maraqlı nitq yarlıqlarından biri "qurban olmaq" felidir. Bu dil vahidinin feli sifət formasında müxtəlif üslub məqamlarına salınması bədii dilin inkiaşfında özünü göstərən xüsusiyyətlərdəndir. XVIII yüzilliyin şairi Molla Pənah Vaqifin dilinə müraciət edək:

Sallana-sallana dövlətxanadan,
Bir çıxa boyinə qurban olduğum.
Göydə mələk, yerdə insan gözəli
Sənsən, xoş xoyinə qurban olduğum.
Hüsnün kitabını bülbüllər oxur,
Yay qaşın bağrıma xədəngin toxur,
Həlqə birçəyindən yasəmən qoxur,
Bənəfşə muyinə qurban olduğum (Vaqif, 2004: 65).

Qeyd edək ki, Vaqifin "qurban olduğum" rədifli iki əsəri vardır. İkinci qoşmada "qurban olduğum" rədifi xitab kimi işlənmişdir:

Sən gəldin, nur doldu evə-otağa,
Gəldiyin yollara canım sadağa,
Durub qurban olmaq sən tək qonağa
Nuşdur canımıza, qurban olduğum.

Mən mayiləm, səndən düşmənəm çaşa,
Bulut zülfə, ağ qabağa, ay qaşa,
Qoy doyunca baxsın, etsin tamaşa,
Heyrandı göz-gözə, qurban olduğum.
Sən qəddinə yaşıl-allar geyici,
Vaqif dəxi sənə qəzəl deyici,
Şükr Allaha, deyil adamyeyici,
Nolur gəlsən bizə, qurban olduğum (Vaqif, 2004: 69).

Dərin bir məhəbbətin dil təcəssümü olan "qurban olduğum" ifadəsi poetikləşərək M.P.Vaqifdən üzü bəri dilimizin bəzəyinə çevrilib. Bu ifadə Molla Cumanın dilində daha hərarətli səslənir, daxildən gələn böyük bir məhəbbət və nəvazişin dili kimi danışır:

Canıma nar saldı cananın canı,
Gül yanaqlarına qurban olduğum.
Görmədim cahanda sən təki yarı,
Xumar gözlərinə qurban olduğum (Molla Cümə, 2006: 187).

Azərbaycan ədəbi dilinin ən yeni dövründə M.Müşfiqin dilində "qurban olduğum" feli sifəti şerin dilinə seçkin bir bədii və estetik gözəllik gətirmişdir:

Bilməm, məni neçin atmış, unutmuş,
Cövrü-cəfasına qurban olduğum.
Yoxsa özgəsinə üzünü tutmuş,
Yeni sevdasına qurban olduğum?
Mən Dilbəri sordum gəlib-gedəndən;
Dedilər, barışmaz, küsmüşdür səndən.
Mən iltifat etdim, o qaçdı məndən,
Qaçqın ədasına qurban olduğum (Mikayıl Müşfiq, 2004: 189).

Şerin silindəki yeni sevda, qaçqın əda yeniliyi ilə diqqəti çəkən poetik sintaksis örnəklərindəndir.

Bundan başqa, dilimizdəki bir çox münasibətləri (mehribanlığı, sevgini, bəzən də yalvarışı və s.) ifadə edən "sənə qurban" ifadəsi də bədii üslubda bir sıra söz ustaları tərəfindən işlənən dil faktlarındandır. Aşıq Ələsgərin dilində alınmış örnəyə nəzər salaq:

Bir sözüm var, sana pünhan deməli,
Qayıl olsan deyim, gül sana qurban.
Nə müddətdi həsrətini çəkirəm,
Söyləyim, dərdimi bil, sana qurban (Aşıq Ələsgər, 2004: 74).

Əslində, adi sözlərin poetik məqsədlərə yönəldilməsi emosional fikirləri aktivləşdirərək dili üslub baxımından formalaşdırır və poetikliyi tündləşdirir.

Ələsgəri gözdən qoyma irağa,
Könül tab gətirməz dərdü-fərağa,
Leyli kimi vədə versən bulağa,
Məcnuntək gözlərəm il, sana qurban (Aşıq Ələsgər, 2004: 75).

Məlumdur ki, tarixən "mən" və "sən" əvəzlikləri yönlük halda "mana", "sana" kimi deyilib yazılmışdır. Bu cəhət Aşıq Ələsgərin dilində qorunub saxlanmışdır.

Aşıq Ələsgər özündən sonrakı qələm sahiblərinin yaradıcılığına təsiri duyulan sənətkarlardandır. Onun yuxarıdakı şerinə məxsus rədif və qafiyə sözlərdən Mikayıl Müşfiq də istifadə edərək məşhur əsərini yazmışdır:

Deyirsən yanında qalacağam mən,
Çox gözəl fikirdir, qal, sənə qurban.
Nə zaman istəsən əziz canımı,
Qumral gözlərinlə al, sənə qurban (Mikayıl Müşfiq, 2004: 192).

Azərbaycan ədəbiyyatında təbiətin gözəlliyi, gül-çiçəyi deyəndə aşıq Qurbaninin "Bənövşə" qoşması yada düşür. Baharın gəlişindən xəbər verən, onun simvolu hesab edilən bu zərif çiçəyi Qurbani o qədər gözəlliklə vəsf etmişdir ki, aşığın sözləri həmin çiçəyi tanımayan adamda da xoş hisslər yaradır:

Başına döndüyüm, ay qələng Pəri
Adətdir, dərərlər yaz bənövşəni.
Ağ, nazik əlinlə bir dəstə bağla,
Tər buxaq altına düz bənövşəni.
Tanrı səni xöş camala yetirmiş,
Səni görən aşiq əqlin itirmiş.
Mələklərmi dərmiş, göyrəın gətirmiş?
Heyf ki, dəriblər az bənövşəni (Qurbani, 2006: 47).

Ümumiyyətlə, təbiətin tərənnümü vətən tərənnümünün zəruri bir bölümüdür. Belə əsərlər vətənə, onun təbiətinə sevgini, ehtiramı coşdurur, insanda zərif duyğular oyadır. Molla Cumanın "Bənövşəni" rədifli qoşması da sənətkarlıq keyfiyyətləri ilə seçilir:

Mən sənə nə dedim, zalım, bimürvət,
Qoy qurusun qolun, üz bənövşəni.
Süsənlə, sünbüllə, gülü-reyhanla
Dərib dəstə-dəstə düz bənövşəni.
Gözəllər seyrana çıxarlar bağa,
Maşallah, hüsnündən bağa nur yağa,
Dərib dəstə-dəstə düzər buxağa,
Bənövşə qız iylər, qız bənövşəni (Molla Cümə, 2006: 78).

Molla Cumanın dilində tez-tez "könül quşu" ifadəsinə rast gəlirik. Bu ifadə M.Şəhriyarın dilində də özünü göstərən maraqlı nitq vahidlərindəndir. "Könül quşu", əslində, bir yerdə qərar tutmayan, təlatümlü bir könülün özüdür, aşığın məkanı, ucsuz-bucaqsız xəyallar aləmidir, düşüncələrinin, demək istədiklərinin vətənidir:

Könül quşu havalardan
Durmaz, enər qərib eldə.
Həcər dəgər şüşə misli
Hər dəm sınar qərib eldə (Molla Cümə, 2006: 38).

Beləliklə, eyni söz və ifadələrin müxtəlif fikirlərə yönləndirilməsi bədii dilin inkişaf xüsusiyyətlərindən biridir.

**3. Bədii dilin milliliyə yüksək münasibəti.** Ədəbi-bədii dil tarixinin bütün zamanlarında milli dil vahidlərinə üstünlük vermək bədii dilin keyfiyyət göstəricilərindən biri kimi diqqəti cəlb edir. Orta dövr şairi sayılan Nəsimi yaradıcılığına baxaq:

Düşdü könül ala gözün ağınavü qarasinə,
Ayrıq anınla kimsənin ağı nədir, qarasi nə?
Gəldi fəqanə can yenə ney kimi, suzü dərd ilə,
Kim nə bilir bu xəstənin dərdi nədir, dəvasi nə? (Nəsimi, 2004: 52).

Nəsiminin bu əsərində otuz bir sözdən cəmi yeddisi alınmadır. Şairin elə əsərləri də vardır ki, onlarda bu nisbət əksinədir, yəni alınma sözlər kəmiyyət baxımından milliləri üstələyir, lakin milli təfəkkürün qüdrəti bu kəmiyyətin keyfiyyətə çevrilməsinə imkan vermir:

Mana sənsiz cahanü can gərəkməz,
Vüsalın var ikən hicran gərəkməz.
...Qəmindir könlümün təxtində sultan,
Bir iqlimə iki sultan gərəkməz.
...Gülüstanın gülü sənsiz tikandır,
Mana sənsiz gülü reyhan gərəkməz.
...Mana səbr eyləmək sənsiz, nigara,
Əgər müşkül, əgər asan – gərəkməz.
Əzəldə qılmışam eşqinlə peyman,
Bütün peyman, sınıq peyman gərəkməz (Nəsimi, 2004: 70).

Bu şeirdə milli sözlər təkrarlar hesabına müəyyən say təşkil etsə də, iyirmidən çox söz alınmadır. Lakin onlar milli vahidlərin əhatəsinə elə salınıb ki, öz sözlərimizin aydınlıq və təbiiliyi alınmaların mövqeyini sarsıda bilib. Bu anlamda, aşağıdakı örnək də maraqlıdır:

Surətin nəqşinə xəyal irəməz,
Gözlərin alasına al irəməz.
..Bu günü gör ki, rəngi çöhrəsinə
Nə qədər al edirsə, al irəməz.
Gərçi ayı üzünə bənzədərəm,
Qaşların şəklinə hilal irəməz.
Ey cəmalül-liqa, nə dilbərsən
Ki, rüxün hüsnünə cəmal irəməz.
Bu nə ziba camal olur, yarəb,
Ki, kəmalatına kəmal irəməz.
...Ey Nəsimi, sözün müfərrihdir,
Bu cəhətdən ana məlal irəməz (Nəsimi, 2004: 75).

Ümumtürk dilinin dəyərli faktlarından olan "irmək" (çatmaq) felinin qeyri-qəti gələcək zamanda işlənərək rədifə çevrilməsi Nəsimi dilində alınma sözlərə müqavimətin maraqlı və orijinal örnəyi kimi diqqəti çəkir. Ümumiyyətlə, bədii üslubda alınma sözlərin bolluğu ilə müşahidə edilən əsərlərin dilində bu sözlər elə məqamlara salınmışdır ki, əsasən, dilin axıcılığına xələl gəlməmişdir.

**4. Əski türk dili vahidlərinin və bir zaman fəal leksikaya daxil olsa da, çağdaş dövrümüzdə dildən çıxan və ya çıxmaqda olan sözlərin qorunması.** Bədii dilin məziyyətlərindən biri dilin tarixi faktlarına müəyyən qədər yer verməsidir. Bu anlamda, tarixən dilimizdə fəallığı ilə seçilən "oxumaq" sözünü göstərmək olar. Nəsiminin dilində bugün üçün mənası köhnəlmiş sözlərdən biri kimi "oxumaq" feli diqqəti çəkir. Məlumdur ki, çağdaş dilimizdə "təhsil almaq" və "mütaliə etmək" anlamlarında işlənən bu söz ədəbi dilimizin qədim və orta dövründə fərqli məna daşımışdır. Məsələn, "Kitabi-Dədə Qorqud" dastanının dilində o, ilk mənasından (məsələn, ismi-əzəm oxumaq) başqa, həm də "çağırmaq" mənasında işlənmişdir: *Bayböră bəg bazirganlarını yanına oxıdı, buyuruq etdi* (Kitabi-Dədə Qorqud, 2004: 53). Nəsiminin

dilində isə tamamilə fərqli bir mənzərə ilə qarşılaşırıq: “oxumaq” sözü “demək” mənasında özünü göstərir:

Nə hikmətdir, əya, ey hüsnü-ziba,
Səni aləmlərə sultan oxurlar?
Fəda qıl canını, sən, ey Nəsimi,
Ki, canı yar üçün qurban oxurlar (Nəsimi, 2004: 210).

Nəsiminin dilindəki maraqlı faktlardan biri də budur ki, “bənzər” sözü “bənziş” şəklində işlədilmişdir:

Surətdə gərçi bənzişi çoxdur Nəsiminin,
Mənidə adı hər həcərin kimiya degil (Nəsimi, 2004: 121).

Nəsiminin dilində “göydürmək” adlı feil də var ki, ilk baxışda hazırkı dilimizdə aktiv mövqeli “göynətmək” felinin arxaik variantı kimi görünür. Lakin sözün mənası bunu deməyə imkan vermir:

Xumari-mehriniz göydürdü canı,
Yetir şərbət vüsalından nəhanım (Nəsimi, 2004: 126).

“Göydürmək” sözü araşdırılmağa layiqli faktlardandır. Dilimizdə “göy” sözü əsasında bir sıra həqiqi və məcazi anlam daşıyan sözlər vardır. Nizami Gəncəvinin “Yeddi gözəl” əsərində dərdli adamların göy rəngdə geyinmələri, xalq arasındakı xəsis adamlar haqqında “necə də göydür” ifadəsi, “ağrımaq” mənasında “göynətmək”, *göy* sifətindən əmələ gələn “göyərmək” feillləri və s. kimi leksik-qrammatik vahidlər diqqəti çəkir. Məsələn, çağdaş dövr şairimiz Sabir Rüstəmxanlının aşağıdakı şerində həmin sözə baxaq:

Barmağın ucundan sözlər göyərib,
Daşın da dilini bilən çağımdır.
Ruhumda sehr var, sözə can verib
Özüm söz üstündə ölən çağımdır (Rüstəmxanlı, 2004: 130).

Nəsiminin dilindəki “göydürmək” feli tanmamilə fərqlidir. Belə ki, bu söz müsbət mənada işlənərək tərkibində “göy” hissəsi olan sözlərdən seçilir. Yəni mehrdən, məhəbbətdən canın ağrımağı yerinə düşmür. Fikrimizcə, bədii dil nə qədər incələnsə, yenə də azdır. Çünki araşdırmalar çoxalıb dərinləşdikcə yeni dil faktları və mənalarla qarşılaşırıq.

Sözügedən leksik-qrammatik və üslub faktları M.P.Vaqifin də dilində bol-bol işlənmişdir:

Xeyli vaxtdır ayrılmışıq yar ilən,
Gördük, amma tanışmadıq, ayrıldıq.
Qaldı canda gizli-gizli dərdimiz,
Bircə kəlmə danışmadıq, ayrıldıq! (Vaqif, 2004: 19).
Qərib-qərib durduq biganələrtək,
Soyuq-soyuq baxdıq divanələrtək.
Dönmədik başına pərvanələrtək,
Eşq oduna yanışmadıq, ayrıldıq!
Olmayaydı belə səfərə çıxmaq,
Biz yar ilə danışmadıq, ayrıldıq.
Halallaşıb, himmətləşib dost ilən,
Təmənnəşib görüşmədik, ayrıldıq (Vaqif, 2004: 20).

Birinci bənddəki "tanışmaq" sözü maraqlı leksik-qrammatik dil vahidlərindəndir. Bizim dilimizdə "tanımaq" felindən yaranan "tanış" ismi və "tanış olmaq" tərkibli feli vardır. Vaqifin dilindəki "tanışmaq" feli həm yığcamlığı, həm də səslənmə gözəlliyi ilə bədii estetiklik yaradan dil vahidi kimi yerinə düşmüşdür. Şerin ikinci bəndindəki "yanışmaq" feli də maraqlıdır. Dilimizdə milli mənşəli "yanmaq" feli işləkliyi və söz yaradıcılığında fəallığı ilə seçilir. Lakin dilimizdə həmin felin qarşılıq-birgəlik növdə işlənməsi ilə ilk dəfə Vaqifin dilində qarşılaşırıq. "Eşq oduna yanmaq" ifadəsi lirikada o qədər işlənmişdir ki, artıq qəlibə çevrilmişdir. Lakin ifadənin son sözünün "yanışmaq", yəni "birlikdə yanmaq" feli ilə ifadəsi bədii dildə təzə və təravətli bir vahid kimi səslənir. Uzun zaman araşdırma aparılsa da, "təmənnəşmək" sözünə lüğətlərdə rast gəlmədik. Nəhayət, Kubra Quliyevanın 2019-cu ildə çap olunmuş "Bədii ədəbiyyatda dialektizmlər" adlı kitabında "təmənnələşmək" və "təmənnəşmək" sözləri ilə qarşılaşdıq. "Təmənnələşmək" sözünün "sözləşmək", "təmənnəşmək" sözünün isə "hak-əhval tutmaq", "əhvallaşmaq", "görüşmək" anlamları qeyd olunmuşdur.Lakin bu sözlər "Azərbaycan dilinin dialektoloji lüğətində göstərilməmişdir.

Bundan başqa, bütöv bir sintaktik vahidin – misra və ya beytin müxtəlif şairlərin yaradıcılığında işlənməsi faktı da diqqəti çəkir. Bu mənada, Vaqifin eyni misrasına S. Vurğunun dilində rast gəlirik:

Vaqif, yad et səni yad eyləyəni,
Doğru sanma hər bir yaram deyəni.
Qoymaz göz önündən sevən sevəni,
Könüldən-könülə yollar görünür (Vaqif, 2004: 120).

Məlumdur ki, 50 illik yubileyi keçiriləndə Azərbaycanın ilk Xalq şairi S. Vurğun yataq xəstəsi idi və o öz yubileyində iştirak edə bilmirdi. Tədbirə gələn dost-tanışlarla, poeziya, elm və incəsənət adamları ilə radio vasitəsilə əlaqə saxlayan şair "Vaqif" dramında yazdığı mistalarla belə demişdir:

Gözüm gözünüzdən uzaq olsa da,
Könüldən-könülə yollar görünür (Vurğun, 2005: 20).

Faktlar göstərir ki, Vaqifin dilindən faydalanan şairlərimiz çoxdur. Onlardan biri də S.Rüstəmdir.

Vaqifin aşağıdakı şerinə nəzər salaq:

Vaqif, çoxdur dərdin, mən də bilərəm,
Bir gün görməyəndə, yəqin, ölərəm.
Ağlasan, ağlaram, gülsən, gülərəm,
Xəstəyəm, dərmanım neçün ağlayır? (Vaqif, 2004: 122).

Bu şerin üçüncü misrası eynilə S. Rüstəmin "Təbrizim" şerində təkrarlanmışdır:

Ağlasan, ağlaram, gülsən, gülərəm,
Yaşasan, yaşaram, ölsən, ölərəm.
Varımı səninlə yarı bölərəm.
Gəl bir də üzündən öpüm, Təbrizim,
Başına gül-çiçək səpim, Təbrizim (Rüstəm, 2005: 7).

Molla Cumanın dilində çağdaş dilimizdə işlənmə fəallığını azaldan milli leksik-qrammatik vahidlərin çoxu aktiv mövqeyi ilə diqqəti çəkir. Belə maraqlı sözlərdən biri "yaşırmaq" sözüdür. Bu söz həm olduğu kimi, həm də yerli tələffüzə uyğunlaşaraq "yöşürmək" şəklində aşığın dilində fəal yer tutur:

Çəkibən yaşmağı yüzün yöşürmə,
Sinəmin üstünə dağ qoyan dilbər.
Gedibən dərdimi həddən aşırma,
Allahı sevərsən, bir dayan, dilbər (Molla Cümə, 2006: 101).

Aşığın dilində çox sayda ümumtürk dili vahidləri işlənmişdir. Onlardan biri kimi "dəfə" numerativ sözünün əvəzində işlənən, çağdaş türk dilində fəallığı ilə seçilən "gəz" (kəz) sözüdür:

Cüməyəm, cigərim daşa döndərdim,
Xəlvət yerdə göz yaşımı əndərdim,
Üç *gəz* sənə salam-dua göndərdim,
Bir *gəz* dua göndərmədin mənə, yar (Molla Cümə, 2006: 121).

Əski türk dillərində felin əmr şəklində birinci şəxsin təkinin sonluğu kimi, *-ayım*[2] şəkilçisindən istifadə olunmuşdur ki, müasir Türkiyə türkcəsində indi də belədir. Lakin bizim dilimizdə sözügedən şəkilçi arxaik plana keçmişdir. Molla Cumanın dil-üslub xüsusiyyətləri üzərindəki araşdırmalar həmin şəkilçinin XIX yüzillikdə və XX yüzilin əvvəlində hələ də işlək olduğunu göstərir:

Ay ağalar, gəlin sizə *sorayım,*
Dərdimə dərd qatan burada kimdir?
Siz Allah, göstərin, onu *görəyim,*
Qəlbimi saxlayan qarada kimdir? (Molla Cümə, 2006: 136).

S.Rüstəmin dilində də elə sözlərlə qarşılaşırıq ki, onlar hazırda ədəbi dilimizdə işlək leksikaya daxil olmasa da, ümumxalq dili vahidlərindəndir. Məsələn, hazırda dilimizdə "yaxmaq" feli fəal deyil, lakin o, "yandırıb yaxmaq" şəklində işlənir. Şairin dilində isə həmin leksik vahid ayrılıqda "yandırmaq" anlamında özünü göstərir:

Deyirəm, heç kəsi yaxmasın odum,
Görməyim bir daha şair yasını.
Aparır özüylə hər köçən dostum
Bu şair qəlbinin bir parçasını (Rüstəm, 2005: 36).

Yuxarıdakı örnəklər bədii üslub nümayəndələrinin bir-birindən təsirlənərək eyni dil vahidlərini yeni üslub çaları ilə işlətdiklərini göstərir.

**5. Bədii dildə eyni misra və ya beyt daxilində sözlərin təkrar işlənməsinin mahiyyəti.** Bu mənzərəni bədii dildə, xüsusilə də poetik əsərlərin dilində tez-tez görmək mümkündür. İstər klasik, istərsə də çağdaş bədii dilimizdə təkrar örnəklər üslub gözəlliyi yaradan vasitə kimi tanınır. Nəsiminin dilindən aşağıdakı beyt bu mıənada səciyyəvidir:

Aləmdə bugün sənciləyin yar kimin var?
Gər var desən, yox deməzəm, var, kimin var? (Nəsimi, 2004: 193).

Bu bir beytdə dörd dəfə "var" ismi xəbəri işlənmişdir. Buna baxmayaraq, o, dilə heç bir ağırlıq gətirmir, əksinə, maraqlı və oynaq bir ritm yaradır ki, bu, Nəsimi dilinin özəlliklərindən biridir. Bu baxımdan, aşağıdakı beyt də diqqəti cəlb edir:

Eşqində Nəsimi çü qılır canını qurban,
Qurbanına qurban olayım, canım əfəndi (Nəsimi, 2004: 86).

Bu örnəkdə üç dəfə işlənən "qurban" sözü, iki dəfə işlənən "can" sözü bədiiliyi dərinləşdirən vasitə kimi nəzərə çarpır.

**6. Bədii dildə məişət nitqinə və dramaturgiya dilinə xas olan dialoq mədəniyyəti**. Dialoq mədəniyyətinin möhtəşəm örnəklərinə Nizami Gəncəvi yaradıcılığında rast gəlirik. Şair əsərlərini farsca yazsa da, hər halda ana dilində düşündüklərini qələmə almışdır. Dialoq mədəniyyəti ilə Molla Cuma yaradıcılığında da qarşılaşırıq:

Dedim: ay dilbərim, seyrəmi çıxdın?
Dedi: sevdalıyam, gəzməsəm, olmaz!
Dedim: mən dostuna nə mail baxdın?
Dedi: möhnətinə dözməsəm, olmaz! (Qurbani, 2006: 191).
Dedim ki, ismini Pünhan eylədim!
Dedi: danış görüm, sənə neylədim?
Dedim ki, eşqindən qəzəl söylədim,
Dedi: qələm gətir, yazmasam, olmaz! (Molla Cümə, 2006: 191).
Dedim: Molla Cümə qəmdə qalıbdır,
Dedi: ah, naləsi canım alıbdır.
Dedim ki, göz yaşım göllər olubdur,
Dedi: mən sonayam, üzməsəm, olmaz (Molla Cümə, 2006: 191).

XX yüzilliyin ikinci yarısında H.Arifin dilində də dialoq mədəniyyəti örnəkləri vardır:

Dedim: – Telin nə gözəldir! –
- Yox-yox, ona dəymə! – dedi.
Dedim: – Nə vaxt gəlim sizə?
- Qapımızı döymə! – dedi.
Dedim: – Nədir bu işvə, naz?
Dedi: – Yeri, şerini yaz!
Dedim: – Ay qız, belə olmaz.
- Get, oğlan, baş əymə! – dedi.
Dedim: – Qövr eləyir yaram,
Dedi: – Sənlə yoxdur aram.
Dedim: – Axı sənətkaram,
Çox özünü öymə! – dedi (Hüseyn Arif, 2004: 70).

**7. Bədii dilin hikmətli fikirlərlə zənginləşdirilməsi**. Molla Cumanın dili bir sıra tərbiyəvi fikirlər və hikmətli ifadələrlə zənginliyi ilə də seçilir:

Bədəsil dost olan şadiman gəzməz,
Nə hörmət eləsən, ürəyi qızmaz.
Əsil dost sizinlə dostluğu üzməz,
İstərsə boynuna yüz qılınc dəyə (Molla Cümə, 2006: 89).
Gerçək sözdür, mərd namərdə qarışmaz,
Vəfasıza vəfalı dost darışmaz (Molla Cümə, 2006: 95).
Verimli ağıldan heç ağıl olmaz,
İgidin öz ağlı başında gərək (Molla Cümə, 2006: 155).
Heç qara daşlardan cəvahir olmaz,
Cavahir mədənin daşında gərək (Qurbani, 2006: 155).
Dəryanın qəvvası ölməyə baxmaz,
İkicə sərçə bir qırğıdan qorxmaz (Molla Cümə, 2006: 161).
Bir misaldır, atalardan qalıbdır,

Yabaya dözməyən xırmana girməz (Molla Cümə, 2006: 422).
Elin arasında adam yoxlanır (Molla Cümə, 2006: 111).

Musa Yaqubun 1971-ci ildə yazdığı şerindəki "Yaxşı adamları qoruyaq gəlin!" misrası C. Novruzun "Sağlığında qiymət verin insanlara" misrasının anlam sanbalı ilə səsləşir. Sabir Rüstəmxanlının dilindəki aforistik səciyyəli aşağıdakı örnəklər də xarakterikdir:

Yurdun azadlığı sözdən başlanır,
Ürəkdən başlanır, gözdən başlanır (Rüstəmxanlı, 2004: 227).
Söz ki ucuzlaşıb dəyərdən düşür,
Elə bil bir igid yəhərdən düşür (Rüstəmxanlı, 2004: 227).
Harda ki əyrilər doğruya gülür,
Ora cəhənnəmin filialıdır (Rüstəmxanlı, 2004: 295-296).
Yataqda ölənə məzar narahat,
Torpaq da döyüşdə öləni sevir (Rüstəmxanlı, 2004: 297) və s.

**8. Qrammatik mövzuların bədiiləşdirilməsi faktları**. Maraqlıdır ki, bədii dildə qrammatik termin və ya sözlərin mövzu seçilməsi faktları vardır. Bu məsələ ilə ilk dəfə Aşıq Ələsgərin yaradıcılığında qarşılaşırıq. Aşıq o zamankı əlifbada (ərəb əilfbasında) əks olunan hərfləri nəzmə çəkmiş, onların dini-fəlsəfi mənalarını açmışdır:

"Se" – sabitdi doğru yola,
"Sim" – ucadı, bax calala,
"He" – mehribandı halala,
Münkir ondan xəcalətdi.
"Xe" – birdi, xaliqi-əkbər,
"Dal" – doğru doqquz fələklər,
"Zal" – zikr eylə dildə əzbər,
"Re" – rəsulumuz Əhməddi (Aşıq Ələsgər, 2004: 23).

Aşıq sözügedən şeirdə 24 hərf haqqında maraqlı fikirlər irəli sürərək elmiliklə bədiiliyi qovuşdurmuşdur. Əlifbadakı hərflər haqqında aşıq poeziyasında heç kəs Aşıq Ələsgər qədər məntiqli bədii fikir söyləməmişdir.

Çağdaş ədəbi dilimizdə Qabilin "Üç nöqtə" şeri də bu baxımdan, diqqəti çəkir. Şair təsdiq edir ki, fikrin ifadəsi üçün söz tapılmayanda üç nöqtə ən gözəl vasitəyə çevrilir.

Söz tapmasan, dada yetər üç nöqtə,
Əvəzində o danışar, o dinər.
Yersiz olsa, boş şey, hədər üç nöqtə,
Mənalarla kədərlənər, sevinər (Qabil, 2004: 48).

"Üç nöqtə" şeri müəllifinin ana dilimizi dərindən bilməsini və poetik mədəniyyətinin yüksək olduğunu göstərir. Bu durğu işarəsinin gizli mətləbləri ifadə etmək bacarığı, dilə gəlməyən sözləri bildirmək qabiliyyəti şairin nəzərindən qaçmamışdir:

İncə mətləb kodlarıdır üç nöqtə,
Hər biri bir qıfılbənddi, aç görək!
Lap bir məktəb açarıdır üç nöqtə,
Bu məktəbin təlimindən qaç görək!
Bir him-cimdir, bir qaş-gözdür üç nöqtə,
Qazdan ayıq xəbərdardı, ayıq ol!
Dilə gəlməz elə sözdü üç nöqtə,
Atalar da üçdən deyib, sayıq ol! (Qabil, 2004: 48).

Bədii dildə üç nöqtənin həsrət, intizar bildirməsi məqamları da vardır. Ana dilinin dadı-tamı çökmüş poetik dil bu məqamları daha dərindən və mənalı əks etdirir. Burada şairin həssaslığı, dünyagörüş və istedadı birləşir:

Ömür yolu düz önündən keçər hey,
Baxıb-baxıb dolan gözdü üç nöqtə.
Xatirələr bulağından içər hey,
Gözü yolda qalan gözdü üç nöqtə (Qabil, 2004: 48).

Mövzu-məzmun harmoniyasının gözəl örnəklərindən olan "Üç nöqtə" şerində fikir bütövlüyü məntiqli, aydın və konkret sözlərlə verilir, dilin qayda-qanunlarını bilən və kamilliklə mənimsəyən müəllif tərəfindən poetik keyfiyyətlə təqdim edilir:

Mənaların açmasıdır üç nöqtə,
Açıldıqca şərhə qalmaz ehtiyac.
Təxəyyülün uçmasıdır üç nöqtə,
Simurqa da daha olmaz ehtiyac (Qabil, 2004: 48).

Doğrudan da, üç nöqtənin mənasının açılmasımna ehtiyac hiss olunur. Bu durğu işarəsi haqqındahı mülahizələrin nəzmə çəkilməsi şairin poetik və nəzəri təfəkkürünün açarını təqdim edir:

Etirafdır, xəyanətdir üç nöqtə,
Üzümüzdə üç güllənin yeridir.
Anlayana kifayətdir üç nöqtə,
Köksümüzdə üç güllənin yeridir (Qabil, 2004: 48).

Diliçilik elmində üç nöqtənin elə bir mənası yoxdur ki, Qabilin "Üç nöqtə" şerində verilməsin. Adi bir durğu işarəsi haqqında belə mükəmməl fikirlərin əks olunduğu bu şerin dərsliklərə salınmasına ehtiyac vardır. Belə ki, bu əsər durğu işarələri haqqında verilən nəzəri biliklərin dərinləşməsinə, poetik-praktik Azərbaycan dilinin zənginləşməsinə kömək edər.

*Bədii üslubda məişət nitqi ilə ədəbi dilin vəhdətindən yaranan elə sözlər və elə ifadələr işlənir, sözlər elə düzülüb-qoşulur ki, düşünürsən: görəsən, onlar yüz illərdir, min illərdir ki, beləmi olublar? Bu qədər sadəlik və gözəllik yükünü bu sözlər necə daşıya bilir? Bu suallara cavabı məhz bədii dildə tapmaq olar.*

## Nəticə

Bir zaman Azərbaycan xalqının ümummilli öndəri Heydər Əliyev demişdir: "Hər bir xalq öz dili ilə yaranır. Ancaq xalqın dilini yaşatmaq, inkişaf etdirmək və dünya mədəniyyəti səviyyəsinə qaldırmaq xalqın qabaqcıl adamlarının, elm, bilik xadimlərinin fəaliyyəti nəticəsində mümkün olur". Bu mənada, bədii dilimizin səviyyəcə yüksəlməsində ədəbi şəxsiyyətlərin dərin və silinməz imzası vardır. Bu, bir gerçəklikdir ki, sənətkarlar sözləri yaşadır, sözlər isə sənətkarları.

## Ədəbiyyat

1. Nəsimi. (2004). Seçilmiş əsərləri. Bakı: Lider, 336 s.
2. Vaqif, M.P. (2004). Əsərləri. Bakı: Şərq-Qərb, 264 s.
3. Molla Cümə. (2006).Əsərləri. Bakı: Şərq-Qərb, 648 s.
4. Rüstəm, S. (2005). Seçilmiş əsərləri, 3 cilddə, I c. Bakı: Şərq-Qərb, 256 s.
5. https://news.day.az/culture
6. Əli Kərim. (2004). Seçilmiş əsərləri. Bakı: Lider, 2336 s.
7. Mikayıl Müşfiq. (2004). Seçilmiş əsərləri. Bakı: "Şərq-Qərb", 352 s.
8. Aşıq Ələsgər. (2004). Əsərləri. Bakı: "Şərq-Qərb", 400 s.

9. Qurbani. (2006). Əsərləri. Bакı: "Şərq-Qərb", 232 s.
10. Kitabi-Dədə Qorqud. (2004). Bakı: Öndər nəşriyyat, 376 s.
11. Rüstəmxanlı, S. (2004). Seçilmiş əsərləri. Bakı: Şərq-Qərb, 344 s.
12. Vurğun, S. (2005). Seçilmiş əsərləri. 5 cilddə, IV c. Bakı: Şərq-Qərb, 400 s.
13. Rüstəm, S. (2005). Seçilmiş əsərləri, 3 cilddə, II cild. Şərq-Qərb, 328 s.
14. Hüseyn Arif. (2004). Seçilmiş əsərləri. Bakı: Şərq-Qərb, 224 s.
15. Qabil. (2004). Seçilmiş əsərləri. Bakı: Şərq-Qərb, 248 s.

Göndərilib: 15.08.2023 Qəbul edilib: 24.10.2023

DOI: https://doi.org/10.36719/2663-4619/96/72-77

**Alıcan Abbasov**
Azərbaycan Dövlət İqtisad Universiteti
iqtisad elmlər doktoru
alıcan.abbasov@gmail.com
**Vəfa Nəcəfova**
Milli Aviasiya Akademiyası
necefli75@752mail.ru
**Murad Qasımov**
Milli Aviasiya Akademiyası
dissertant
muradqasimov@mail.ru

# KEYFİYYƏT MENECMENT SİSTEMİ HAVA NƏQLİYYATININ İNKİŞAFININ TƏNZİMLƏNMƏSİNİN İQTİSADİ MEXANİZMİ KİMİ

**Xülasə**

Məqalədə məhsulun keyfiyyəti və rəqabət qabiliyyəti anlayışları və onların mahiyyəti barədə müxtəlif elmi-nəzəri yanaşmalar öyrənilmiş və müvafiq ümumiləşdirmələr edilmişdir. Aviaşirktlərin rəqabət qabiliyyətinin yüksəldilməsində, uçuşun təhlükəsizliyinin təmin edilməsində, istehlakçıların tələbatının dolğun ödənilməsində, xərclərin azaldılmasında, biznes-proseslərin təkmilləşdirilməsində keyfiyyət menecment sisteminin (KMS) rolu ətraflı şərh olunmuşdur. İSO-9001 beynəlxalq standartların tələbləri tam nəzərə alınmaqla aviaşirkətlərdə KMS-nin qurulması və tətbiqinə dair elmi əsaslandırılmış təklif və tövsiyələr irəli sürülmüşdür.

***Açar sözlər:*** *keyfiyyət, rəqabət qabiliyyəti, keyfiyyət menecment sistemi, beynəlxalq standartlar, havayükdaşımaları bazarı, inteqrasilayaşmış menecment sistemi*

**Alijan Abbasov**
Azerbaijan State Economic University
doctor of economic sciences
alıcan.abbasov@gmail.com
**Vafa Najafova**
National Aviation Academy
necefli75@752mail.ru
**Murad Gasimov**
National Aviation Academy
PhD student
muradgasimov@mail.ru

# Quality management system development of air transport as an economic mechanism of regulation

**Abstract**

In the article, various scientific-theoretical approaches to the concepts of product quality and competitiveness and their essence were studied and relevant generalizations were made. The role of the quality management system (QMS) in increasing the competitiveness of airlines, ensuring flight safety, fully meeting the needs of consumers, reducing costs, and improving business processes has been explained in detail. With full consideration of the requirements of ISO-9001 international standards, scientifically based proposals and recommendations were put forward for the establishment and implementation of KMS in airlines.

***Keywords:*** *quality, competitiveness, quality management system, international standards, air freight market, integrated management system*

## Giriş

Aviaşirkətlərin yükdaşıma bazarında rəqabət qabiliyyətinin yüksəldilməsində keyfiyyət menecment sistemi əhəmiyyətli rol oynayır. İnkişaf etmiş bazar iqtisadiyyatlı ölkəkərin dövlət aviasiya orqanları aviaşirkətlərdə Keyfiyyət Menecment Sisteminin (KMS) mövcudluğunun məcburi olması tələbini irəli sürürlər.

İqtisadiyyatın digər sahələrində olduğu kimi hava nəqliyyatında da məhsulun keyfiyyəti və rəqabət qabiliyyəti şirkətin maliyyə-təsərrüfat fəaliyyətinin səmərəliliyini xarakterizə edən əsas göstəricilərindən biridir. Milli iqtisadiyyatın dayanıqlı və davamlı inkişafı, dünya təsərrüfat sisteminə sıx inteqrasiyası, beynəlxalq bazarlara çıxışı yüksək keyfiyyətli və rəqabət qabiliyyətli məhsullar istehsal etmədən mümkün deyil.

Keyfiyyət məhsulun təyinatına müvafiq olaraq istehlakçıların müəyyən tələbatını ödəməyə yararlı olmasını şərtləndirən xassələrin məcmusudur. Məhsulun keyfiyyətinin yüksəldiləməsi onun etibarlılığının artırılması və xidmət müddətinin uzadılması, istismar xərclərinin azaldılması, həm də nisbi mənada istehsalın həcminin artırılması deməkdir (Galaburda, 2016).

Rəqabət qabiliyyəti məhsulun keyfiyyəti ilə yanaşı, həm də əmtəənin satışı şərtlərinə (qiymət, göndərilmə, müddəti, servis xidməti, şirkətin imici, reklam və s.) tam cavab verməlidir. Başqa sözlə, məhsulun rəqabət qabiliyyəti - əmtəə bazarının şərtlərinə cavab verən və istehlakçıların tələblərini ödəyə bilən məhsulun istehlak xassələrinin məcmusudur. Məhsulun rəqabət qabiliyyəti istehlakçıların müəyyən qrupu üçün maraq kəsb edən və onların tələbatlarının ödənilməsini təmin edən, əmtəə bazarının şərtlərinə tam cavab verən məhsulun istehlak xassələrinin məcmusu ilə müəyyən edilir.

Keyfiyyət sabit qaldığı halda belə məhsulun rəqabət qabiliyyəti bazar konyukturu, reklam, biznesin xarici və daxili mühiti amillərinin təsiri hesabına dəyişilə bilər. Məhsulun rəqabət qabiliyyəti elə iqtisadi, texniki və istismar parametrləri ilə xarakterizə edilir ki, onlar bazarda analoji məhsulun müvafiq parametrlərini üstələyir.

Müasir dövrdə istehsalçının məhsullar bazarında qazandığı uğurun əsas amillərindən biri kimi keyfiyyət menecment sisteminin rolunun artırılması obyektiv zərurətə çevrilmişdir. Bazarda istehlakçı uğrunda gedən mübarizə əslində rəqabət qabiliyyətli məhsulların istehsalını artırmağı tələb edir. Bununla əlaqədar olaraq məhsulun rəqabət qabiliyyətinin yüksəldilməsi və ona nail olmaq üçün çəkilən xərclərin optimal səviyyəsinin müəyyənləşdirilməsi məsələsi meydana çıxır. Bu baxımdan bazar iqtisadiyyatlı ölkələrdə, xüsusilə Yaponiyada firma səviyyəsində keyfiyyətin menecment sisteminin tətbiqi sahəsində böyük təsrübə qazanılmış və uğurlu nəticələr əldə edilmişdir. Keyfiyyətin idarə olunmasının Yapon modeli firmanın bütün heyəti tərəfindən keyfiyyətin təmin edilməsinin vahid prosesidir və onun əsasını keyfiyyətə ümumi nəzarət təşkil edir (Galyamova, 2018: 135).

Azərbaycanın mülki aviasiya sahəsində innovasiya fəaliyyətinin dövlət tənzimlənməsi mexanizmini nəzərdan keçirərkən dövlətin innovativ-strateji funksiyasına önəm verilməlidir. Dövlət iqtisadiyyatın innovasiyalı inkişafında bilavasitə iştirak edir, yəni hökumət orqanlarından və dövlət qulluqçularından yüksək peşəkarlıq, strateji düşüncə və səy tələb edən ən mühüm, məsuliyyətli va ixtisaslı funksiyalardan birini - innovativ-strateji funksiyanı yerinə yetirir (Abbasov, Əhmədova, 2022: 5-14).

Keyfiyyət menecment sisteminin tətbiqi satılan məhsulun həcmini, şirkətin imicini və mənfəətini artırır, məhsulun rəqabət qabiliyyətini yüksəldir, müflisləşmə riskini azaldır və şirkətin dayanıqlı maliyyə vəziyyətini təmin edir. KMS istehsalçı və istehlakçının maraqlarını birləşdirir, həmçinin məhsulun keyfiyyətinə təsir edən bütün amilləri nəzərə almağa və şirkətdə yüksək keyfiyyətli məhsulların stabil istehsalını artırmağa imkan verir (Demyanovich, 2015).

1980-ci ildə avropa şirkətləri biznesin inkişafında məhsulun keyfiyyətinin yüksəldilməsi məsələsinə xüsusi diqqət yetirməyə başladılar ki, bunun nəticəsində keyfiyyət məhsulun rəqabət

qabiliyyətinin meyarına çevrildi. Keyfiyyətin idarəetmə sistem və metodlarının səmərəliliyinin yüksəldilməsinin zəruruliyi ona gətirib çıxartdı ki, 1987-çi ildə Beynəlxalq Standartlaşma Təşkilatı (İSO – İnternational Standarts Orqanization) KMS modelini təqdim etdi. Bu müxtəlif ölkələrə KMS-nin ümumi tələblər paketini standartlaşdırmağa və ticarət baryerlərinin aradan qaldırılmasına inkan verdi.

İSO-9000 standartlarının meydana çıxması keyfiyyətin idarəetmə sisteminin inkişafının məntiqi nəticəsi oldu. Bütün standartlar içərisində ən geniş yayılmışı İSO-9001 "Keyfiyyət sistemi" sayılır. Bu standart üzrə təhsil və sənaye müəssisələrini standartlaşdırmaq olar.

Nəqliyyatda Keyfiyyət Menecment sisteminə "Korporativ idarəetmə" kimi şirkətin fəaliyyətinin səmərəliliyinin yüksəldilməsi, sahiblərinin və digər maraqlı şəxslərin maraqlarının qorunması məsələləri üzrə şirkətin menecerləri ilə onun sahibləri arasında qarşılıqlı münasibətlər sistemi kimi baxılır (10).

Müasir havayükdaşımaları bazarı aviasiya şirkətlərindən KMS çərçivəsində göstərilən xidmətlərin keyfiyyətinin qorunub saxlanılması və yüksəldilməsi üzrə yeni mexanizmlər işləyib hazırlamağı tələb edir. Bu mexanizmlər öz növbəsində istehlakçılarda inam formalaşdırmalıdır ki, aviadaşıyıcılar götürdükləri öhdəlikləri keyfiyyətlə və təhlükəsiz səviyyədə yerinə yetirməlidirlər. KMS aviamüəssisələrin fəaliyyətinin mahiyyətini təşkil edən qarşılıqlı əlaqəli prosesləri bütöv halda əlaqələndirir, struktur bölmələrin fəaliyyətini biznesin əsas məqsədinə - havayükdaşımalarının təhlükəsizliyinin təmin edilməsindən alınan mənfəətin həcmini artırmağa yönəldir (Sharov, 2016: 398).

Beynəlxalq standartların məqsədi KMS-nin strukturunu, yaxud sənədlərini unifikasiya etmək deyil, Beynəlxalq standartlarda KMS-nə nəzərdə tutulan tələblər məhsula, yaxud xidmətə qoyulan texniki tələblərə əlavə sayılır. Nəqliyyat xidməti sferasında yüksək rəqabətin mövcud olması nəticəsində müxtəlif aktual tematik servis və innovasiyalardan istifadə etməyən şirkətlər havayükdaşımaları bazarında effektiv fəaliyyət göstərə bilmirlər (Shumayev, 2016).

İSO-9000 standartları əsasında işlənib hazırlanmış KMS sadəcə standartlar toplusu deyil, biznesin təşkilinin mühüm vasitəsidir, biznesin inkişaf fəlsəfəsidir.

Aviamüəssisələrdə KMS-nin qurulması və tətbiqinin spesifik xüsusiyyətləri vardır. Havayükdaşımaları prosesi tsikli xarakter daşıyır və öz davamiyyətinə görə kəskin fərqlənir. Hazırda hava yükdaşımalarının inkişafı innovasiyalara əsaslanır, müxtəlif texnoloji yeniliklər: peyk texnologiyalarından istifadə etməklə nəqliyyat vasitələrinin hərəkətinin avtomatlaşdırılmış idarəetmə mərkəzlərinin yaradılması; nəqliyyat vasitələrinin avtomatik idarə olunmasının tətbiqi; kağızsız sənət dövriyyəsinin təşkili, yeni nəsil nəqliyyat vasitələrinin istehsalı; effektiv logistika sisteminin yaradılması və s. tətbiq edilir. Bazar iqtisadiyyatlı ölkələrdə havayükdaşımaları bazarının inkişafı müasir logistika sisteminin tətbiqini nəzərdə tututr.

Bazar iqtisadiyyatında keyfiyyət menecment sistemi nəqliyyat müəssisələrinin dayanıqlı inkişafının mühüm amili və onların rəqabət qabiliyyətinin yüksəldilməsinin əsas vasitəsi hesab edilir.

*Nəqliyyatda istehsal göstəricisi iki qrupa ayrılır;* texniki vasitələrin keyfiyyəti; istismar işlərinin keyfiyyəti, yəni texniki vasitələrdən istifadənin keyfiyyəti. İstehsal keyfiyyətinin yüksəldilməsində nəqliyyat şirkətləri daha çox maraqlıdırlar, çünki bu zaman onların istehsal xərclərinə qənaət edlir. Nəqliyyatda istehlak keyfiyyət göstəricisi kimi "yük sahiblərinə və sərnişinlərə göstərilən nəqliyyat xidmətinin keyfiyyət göstəricisi" qəbul edilir.

Hava nəqliyyatı müəssisələrində keyfiyyət menecment sistemi aşağıdakı mərhələlər üzrə qurulur: yükün və xidmətin istehsalında keyfiyyət göstəricilər sistemi dəqiqləşdirilir; hər bir mərkəz üçün məhsulun, yaxud xidmətin keyfiyyətinə təsir edən konkret göstəricilər müəyyənləşdirilir; istehlakçının narazlığı haqqında informasiyanın təhlili texnologiyası hazırlanır, zərərlərə nəzarət təşkil edilir, standartların pozulması ilə bağlı idarəetmə qərarları qəbul edilir və icra olunur; bütün biznes-proseslər üçün keyfiyyət standartları hazırlanır; istehlakçının narazlıqlarının dəqiq uçotu təşkil edilir; həmin anda və perspektivdə sahə səviyyəsini nəzərə almaqla xərc nöqteyi-nəzərindən şirkət üçün məqbul sayılan keyfiyyət səviyyəsinin parametrləri müəyyənləşdirilir (Mezhdunarodnyy Standart İSO-9000, 2015: 69).

Aviasiya müəssilərində idarəetmənin təkmilləşdirilməsinin əsas istiqamətlərindən biri inteqrasiyalaşmış idarəetmə sisteminin tətbiqidir. İnteqrasiyalaşmış menecment sisteminin yaradılması və inkişafının əsasını beynəlxalq standartların tələbləri və reqlamenti təşkil edir. İri şirkətlərdə İnteqrasiyalaşmış Menecment Sisteminin formalaşması prioritet məsələdir. Bu onunla əlaqədardır ki, struktur bölmələrin rəhbərləri onların müəssisələrində artıq kağızların yaranması və məşğul (cavabdeh) şəxslər arasında səlahiyyətlərin bölünməsi prosesindəki çətinliklər ilə menecment sistemini əlaqələndirir.

Mülki aviasiya müəssisələri bir tərəfdən bu sahədəki müəssisələrlə, digər tərəfdən isə başqa nəqliyyat növlərinə aid olan şirkətlərlə rəqabət şəraitində fəaliyyət göstərirlər. Təbiidir ki, rəqabətədavamlılığın təmin edilməsi müasir innovasiya texnologiyaların tətbiqi ilə bilavasitə bağlıdır. Məhz buna görə də bütövlükdə nəqliyyatda, o cümlədən onun əsas sahələrindən biri olan mülki aviasiyada innovasiya fəaliyyətinin genişləndirilməsi aviamüəssisələrin rentabellik səviyyəsinin yüksəldilməsinin mühüm amili sayılır. Mülki aviasiya məhsulunun (daşıma xidmətinin) innovasiya yönümlü olması çox vacibdir, çünki mülki aviasiyada fəaliyyət coxşaxəlidir, müxtəlif istiqamətləri əhatə edir və ona görə də burada geniş spektrdə elmi-tədqiqat və təcrübə konstruktur işlərinin (ETTKİ) aparılması zəruridir (Akhmedova, 2023: 193-197).

Şirkətlərdə işin həçminin böyük olması və çətinliklər səbəbindən idarəetmə sisteminin bütün sahələrində eyni vaxtda KMS-nin tətbiqi praktiki mümkün deyil. Məhz buna görə İnteqrasiyalaşmış Menecment Sisteminin mərhələlər üzrə qurulması daha məqsədəuyğundur. İnteqrasiyalaşmış menecment sisteminin qurulması və praktiki fəaliyyətinin təşkili üzrə işlərin aparılmasının əsas istiqamətləri planlaşdırma, monitorinq və nəzarət hesab edilir. Hazırda iri şirkətlərin əksəriyyəti İnteqrasiyalaşmış Menecment sisteminin qurulması və tətbiqi strategiyasını özləri işləyib hazırlayırlar (Kurs IKAO po sisteme Upravleniya bezopasnostyu Aviatsii, (SUBA), 2019).

Aviamüəssisələrdə keyfiyyət menecment sistemi, onun təyinatı, fəaliyyət prinsipləri, iş proseslərinin qarşılıqlı fəaliyyəti, strukturu ətraflı təsvir olunmalıdır. Keyfiyyət sistemi üzrə protokolların yazılması üçün formanın qeydiyyatı və uçotunun aparılması mexanizmi mühüm amildir. Aviamüəssisələrdə KMS-nin effektiv fəaliyyəti üçün sənədləşdirilmiş informasiyanın zəruriliyini əsaslandırmaqdan ötrü keyfiyyət sistemi üzrə iş proseslərinin və sənədləşmənin idarə edilməsi prosedurları hazırlanmalıdır, hansıki sənədlərin işlənilmə qaydasını, təsdiqini, tətbiqini, dəyişilməsini və ləğv edilməsini müəyyənləşdirir.

Bir sözlə, keyfiyyət menecment sistemi üzrə vahid identifikasiya və məlumatlar sistemi işlənib hazırlanmalıdır.

İnteqrasiyalaşmış menecment sisteminin effektiv tətbiqi menecment sisteminin yaradılması və tətbiqinə çəkilən xərcləri azaltmağa, menecment sisteminin sertifikasiyası üzrə işlərin görülməsinə çəkilən xərcləri azaltmağa, sənədləşmənin həcmini azaltmağa və mürəkkəbliyini sadələşdirməyə, daxili auditin aparılması ilə məşğul olan işçilərin sayını ixtisar etməyə, keyfiyyət sisteminin yaradılması və tətbiqinə çəkilən müvəqqəti xərcləri azaltmağa imkan verir (Knivel, 2020).

İSO-9001 beynəlxalq standartların tələbləri əsasında qurulan inteqrasiyalaşmış menecment sistemində standartlar yalnız sklet, armatur hesab edilir, hansınıki konkret yaradıcı qərarlarla tamamlamaq lazımdır. Bu sistemin nəticələrinin effektivliyi qəbul edilmiş qərarların məqsədyönlü və mükəmməl olmasından daha çox asılıdır.

Aviamüəssisələrin fəaliyyəti ilə bilavasitə maraqlı tərəflərin: istehlakçılar, malgöndərənlər, rəqiblər, əməkdaşlar, hökumət, dövlət orqanları və beynəlxalq təşkilatların tələbatının müəyyən edilməsi keyfiyyət menecment sisteminin fəaliyyətini xarakterizə edən əsas meyardır. Ona görə də aviamüəssisələr öz fəaliyyətinin səmərəliliyini yüksəltmək üçün monitorinq və təhlil aparmaq yolu ilə maraqlanan tərəflər və onların tələbatı haqqında zəruri informasiyalar toplamalı və onlardan effektiv istifadə etməlidirlər. Keyfiyyət menecment sisteminin səməriliyinin yüksəldilməsinə maraqlı tərəflərin sayını (ahətə dairəsini) müəyyənləşdirmək məcburi tələblərə uyğun olaraq sifariş edilmiş xidmətlərin tətbiqi sferasında aviamüəssisələrin inkişafına onların təsirini mütləq nəzərə alımaq lazımdır.

Dünya təcrübəsi göstərir ki, mövcud müəssisələrdə KMS-nin İSO-9001: 2015 beynəlxalq standrların tələblərinə uyğun olaraq təkmilləşdirilməsi risklərin və proseslərin dəyişilməsinin idarə olunması amilini, həmçinin şirkətlərin effektiv fəaliyyətini ifadə edən bençmarkinqi nəzərə almaqla aviamüəssisələrin rəqabət qabiliyyətinin yüksəldilməsinə səbəb olur. Aviamüəssisələrin praktiki fəaliyyətində İSO-9001 Beynəlxalq Standrların tələblərinin düzgün tətbiqi keyfiyyətli idarəetmə sisteminin imkanları ilə müəyyən edilir, hansıki istehlakçıların təhlükəsiz uçuş üzrə tələblərini mütamadi nəzərə alır, bazarın təhlili metod və vasitələrini yaxşılaşdırmaq yolu ilə aviamüəssisələrin fəaliyyətinin təkmilləşdirilməsinə bütün heyəti səfərbər edir (Mezhdunarodnyy Standart İSO-9000, 2015: 69).

Keyfiyyət menecment sistemi üzrə aviamüəssisələrin siyasəti göstərilən xidmətlərin keyfiyyətini yüksəltmək, istehlakçıların tələbatının tam ödənilməsi istiqamətində kompleks tədbirlər həyata keçirmək və maraqlı tərəflərlə qarşılıqlı-faydalı münasibətlər qurmaqdır. Keyfiyyət menecment sistemi üzrə siyasət əslində məhsul və xidmətlərin keytfiyyətinin yüksəldilməsi strategiyasının məqsəd və prinsiplərinin məcmusudur.

## Nəticə

1. Nəqliyyat xidmətlərinin keyfiyyətinin yüksəldilməsi havayükdaşımaları bazarının seqment üçün mühüm göstəricidir. Nəqliyyat xidmətlərinə tələbat nəqliyyat növlərinin inkişaf səviyyəsindən və onların vahid sistemdə inteqrasiyasından, potensial müştərilərə göstərilən xidmətlərin çeşidi və keyfiyyətindən bilavasitə asılıdır.
2. Keyfiyyət menecment sistemi aviamüəssisələrin rəqabət qabiliyyətinin yüksəldilməsində, uçuşun təhlükəsizliyinin təmin edilməsində, istehlakçıların tələbatının dolğun ödənilməsində, xərclərin azaldılmasında və biznes-prorseslərin təkmilləşdirilməsində müstəsna rol oynayır.
3. Aviaşirkətlər tenderlərdə iştirak etmək və ya iri sifarişləri qəbul etmək üçün İSO-9001 beynəlxalq standartların tələbləri əsasında təkmilləşdirilmiş keyfiyyət menecment sistemi tətbiq etməlidirlər. Aparılmış tədqiqatlar göstərir ki, İSO-9001 beynəlxalq standartların tətbiqindən sonra Azərbaycanda fəaliyyət göstərən müəssisələrin gəlirləri 52 faiz artmış, istehsal xərcləri isə 45 faiz azalmış və istehlakçılara göstərilən xidmətlərin keyfiyyəti əhəmiyyətli dərəcədə yüksəlmişdir.
4. İri aviaşirkətlər üçün vahid inteqrasiyallaşmış idarəetmə sistemi yaradılmalı, aviaşirkətlərdə risklərin uçotu və qiymətləndirilməsi mexanizmi işlənib hazırlanmalı, İSO-9001 beynəlxalq standartların tələbləri nəzərə alınmaqla keyfiyyət menecment sistemi təkmilləşdirilməlidir.

## Ədəbiyyat

1. Galaburda, V.G. (2016). Upravleniya transportnoy sistemoy.
2. Galyamova, T.V. (2018). Organizatsiya perevozok na vozdushnom transporte. Teksty lektsiy/SpbGU GA. Spb, 135 s.
3. Abbasov, A.B., Əhmədova, G.T. (2022). İnnovasiya fəaliyyətində dövlət-xüsusi biznes tərəfdaşlığının inkişaf istiqamətləri. Bakı: "İpək Yolu" jurnalı. № 3, s.5-14.
4. Demyanovich, I.V. (2015). Upravleniye kachestvom transportnykh uslug v kontekste dostizheniya strategicheskikh tseley. Ekonomika i upravleniye v sfere uslug. №13.
5. Sistema Menedzhmenta Kachestva v AO Aviakompanii «Avrora». URL:https://www.fiyaurora.ru/
6. Shumayev, V.A. (2016). Osnovy logistiki. Uchebnyye posobiyeyu. Moskva.
7. Mezhdunarodnyy Standart İSO-9000. (2015). Sistema menedzhmenta kachestva. Osnovnyye polozheniya i slovar, 69 s.
8. Akhmedova, G.T. (2023). Aktualnyye aspekty sovershenstvovaniya i regulirovaniya innovatsionnoy deyatelnosti v sfere grazhdanskoy aviatsii Azerbaydzhana. ZH-l Finansovaya ekonomi-ka. Moskva, № 3, s.193-197.
9. Kurs IKAO po sisteme Upravleniya bezopasnostyu Aviatsii, (SUBA). (2019). Modul. № 4, Kiyev.

10. Knivel, A.D. (2020). Upravleniye bezopasnostyu poletov postavshchikov obsluzhivaniya vozdushnykh sudov. Aviation Explorer.
11. Shumayev, V.A. (2016). Osnovy logistiki. Uchebnyye posobiyeyu Moskva.
12. Sharov, V.D. (2016). Metodologiya upravleniya riskom bezopasnosti poletov na urovne aviapredpriyatiya. Dissertatsiya na soisk. Uchen.stepen.dok.tekhn.nauk. Moskva, 398 s.

Göndərilib: 13.09.2023 Qəbul edilib: 21.10.2023

DOI: https://doi.org/10.36719/2663-4619/96/78-84

**Mədinə Əmiraslanova**
Azərbaycan Milli Aerokosmik Agentliyi
Təbii Ehtiyatların Kosmik Tədqiqi İnstitutu
doktorant
madina.muxtarova.1992@mail.ru

# AEROFOTOÇƏKİLİŞİN İNKİŞAF TARİXİ VƏ AEROFOTOÇƏKİLİŞ MATERİALLARININ KEYFİYYƏTİNƏ TƏSİR EDƏN AMİLLƏRİN QİYMƏTLƏNDİRİLMƏSİ

**Xülasə**

Aerofotoçəkiliş obyektiv məkanı əldə etmək, öyrənmək və tədqiq etmək məqsədilə təyyarə, vertolyot, dron, pilotsuz uçuş aparatında quraşdırılmış aerofotokamerdən istifadə etməklə ərazinin Yer səthindən müəyyən yüksəklikdən çəkilişidir.

Belə nəticəyə gəlmək olar ki, əldə edilən və ya alınacaq aerofotoçəkiliş materiallarının keyfiyyət göstəricilərini bilmək lazımdır. Qiymətləndirmə göstərir ki, təsvirlərin keyfiyyət göstəricilərini kifayət qədər dəqiqliklə proqnozlaşdırmaq qeyri-mümkündür, çünki hər bir obyektiv unikaldır və öz keyfiyyət göstəricilərinə malikdir. Aerofotoaparatların kalibrlənməsi zamanı təkcə təhrifi deyil, həm də obyektiv-plyonka sisteminin ayırdetməsini müəyyən etmək lazımdır, onda görüntünün yerdəyişməsi, atmosferin təsirini və digər amilləri nəzərə almaq çətin olmayacaqdır. Məqalədə aerofotoçəkiliş tarixi və aerofototəsvirlərin keyfiyyət göstəricilərinin qiymətləndirilməsi araşdırılmışdır.

***Açar sözlər:*** *aerofotoçəkiliş, aerofotoçəkiliş materialları, uçuş aparatları, aerofototəsvir, keyfiyyət amilləri*

**Madina Amiraslanova**
Institute for Space Research of Natural Resources
PhD student
madina.mukhtarova.1992@mail.ru

# Development history of aerial photography and evaluation of factors affecting the quality of aerial photography materials

**Abstract**

Aerial photography is a photographing of an area from a certain height above the Earth's surface using an aerial camera mounted on an airplane, helicopter, drone, or unmanned aerial vehicle for the purpose of obtaining, studying, and exploring the objective space.

It can be concluded that it is necessary to know the quality indicators of aerial photography materials obtained or to be purchased. The evaluation shows that it is impossible to predict the quality of images with sufficient accuracy, because each lens is unique and has its own quality indicators. During the calibration of aerial cameras, it is necessary to determine not only the distortion, but also the resolution of the lens-film system, then it will not be difficult to take into account the displacement of the image, the effect of the atmosphere and other factors. The article examines the history of aerial photography and the assessment of quality indicators of aerial photography.

***Keywords:*** *aerial photography, aerial photography materials, aircraft, aerial photography, quality factors*

## Giriş

Məsafədən zondlamanın ən qədim növü olan aerofotoçəkiliş, pilotlu təyyarələr, pilotsuz uçuş aparatları (PUA), raketlər, hava şarları, uçurtmalar, paraşütlər və hətta göyərçinlər kimi bort platformalarında quraşdırılmış və ya portativ kamera ilə çəkilişdir. Vizual təbiətinə görə aerofotoçəkiliş müəyyən bir ərazinin mənzərəsinin müəyyən bir zamanda birbaşa görüntüsünü təmin edə bilər. Məlumatların toplandığı vaxtdan asılı olaraq aerofotoçəkiliş həm tarixi aerofotoçəkiliş, həm də müasir aerofotoçəkiliş kimi qruplaşdırıla bilər. İlk günlərdə aerofotoçəkiliş yüksək qiymət və risk səbəbindən məhdud istifadəyə sahib olmuşdur. 1900-cü illərin əvvəllərindən etibarən aerofotoçəkilişin faydalılığı elektriklə işləyən təyyarələrin tətbiqi ilə xeyli genişləndi (Morgan, Gergel, Coops, 2010: 49). Aerofotoçəkiliş materialları yer səthi haqqında zəngin sinoptik məlumatları ehtiva edir. Əvvəllki dövrlərdə peyk görüntüləri yer səthi məlumatlarının başqa bir ümumi mənbəyi olsa da, məhdud sayda istifadə səbəbindən Yer səthinin uzunmüddətli monitorinqi üçün faydalılığı ciddi şəkildə məhdudlaşdırılmışdır. Bunun əksinə olaraq, aerofotoçəkiliş bəzi hallarda 1930-cu illərin əvvəllərinə aid olan yer səthinin ən uzun, zamansız və məkan baxımından tam müşahidəsini təmin edir (Risbol, Briese, Doneus, Nesbakken, 2015: 204). Beləliklə, aerofotoçəkiliş yer səthinin xəritələşdirilməsi və yerli, regional və hətta milli miqyasda dəyişikliklərin izlənməsi üçün ideal məlumat mənbəyidir. Tarixi və kulturoloji tədqiqatlarda, arxeologiyada, sosioekologiyada, landşaft tədqiqatlarında, coğrafiyada, ekoloji tədqiqatlarda, torpaqdan istifadə planlamasında, meşə tədqiqatlarında və s. sahədə geniş tətbiq edilir. Bundan başqa aerofotoçəkiliş zamanı əldə edilən məlumatlar xüsusilə xəritəçəkmədə ərazilərin sərhədlərinin müəyyənləşdirilməsində, kənd təsərrüfarında, hərbi sahədə, arxeologiyada, ətraf mühitin öyrənilməsində, çaylarda və dənizlərdə suyun çirklənməsinin monitorinqində, kənd təsərrüfatı torpaqlarının və meşələrin inventarlaşdırılmasında, məhsulların vəziyyətinin qiymətləndirilməsində, şelf zonasında dəniz dibinin relyefinin və s. tədqiqi üçün geniş tətbiq olunur (Zhang, Barrett, Baros, Neville, Talasila, Sinclair, 2022: 2).

Landşaft dəyişikliklərini qiymətləndirmək və xəritələşdirmək üçün aerofotoçəkilişdən istifadə ekosistem idarəetməsinin vacib elementidir. Aerofotoçəkiliş kiçik ekosistemlər, meşəlik ərazilər və ya tək ağaclar kimi kiçik miqyaslı landşaft xüsusiyyətlərini xəritələşdirmək üçün idealdır, çünki onlar çox vaxt yüksək səviyyəli məkan və radiometrik detallara malikdirlər. Son bir neçə onillikdə peyk görüntülərinin yayılması aerofotoçəkilişin istifadəsinə və praktik əhəmiyyətinə təsir etmişdir (Erlandson, Gill, Gusick, Dorrler, 2019: 115).

Maraqlıdır ki, aerofotoçəkilişin tarixi XIX əsrin ortalarında başlamışdır. Fototexnikanın inkişafı ilə aerofotoçəkilişin böyük potensiala sahib olduğu aydın olmuşdur. 1855-ci ildə fransız G.F.Tournachon (Nadar) Parisdə hava şarı ilə 80 metr hündürlüyə qalxaraq yanında götürdüyü fotoqraf aləti ilə tarixdə ilk olaraq hava fotolarını çəkmişdir (Bulavitskiy, Zhukova, 2016: 3). Birinci Dünya müharibəsi təyyarədən aerofotoçəkilişlərin sürətli inkişafına və fərdi fotoşəkillərdən aerofotoşəkillərin praktik istifadəsinə keçməyə təkan verdi.

Ancaq o dövrdə hava şarı ilə uçuşlar çox bahalı idi, buna görə istifadə etmək sərfəli deyildi. Daha sadə və daha əlverişli bir yol lazım idi. Sonra XX əsrin əvvəllərində Almaniyadan olan Julius Neubronner öz metodunu təklif etmişdir. Kiçik kameranı poçt göyərçininə uyğunlaşdırdı, və bu metod Birinci Dünya müharibəsi zamanı istifadə edilmişdir (6).

Kaliforniyada George R.Laurence, 1906-cı ildə San Fransiskoda baş verən zəlzələdən və yanğından sonra 2000 dənə çərpələngə bərkidilmiş bir kameradan istifadə edərək şəhərin aerofototəsvirini əldə etmişdir. Xüsusi olaraq hazırlanmış geniş formatlı bu kamera ilə indiyə qədər çəkilən ən böyük aerofototəsvirlərdən biri olaraq qalan panoramik şəkillər istehsal etmək üçün istifadə olunmuşdur. Böyük və son dərəcə ağır olan kameranın havaya 17 fut qalxması üçün 2000 uçurtma lazım idi. Lourens aşağı səviyyəli aerofototəsvirlər əldə etmək üçün pilləkənlərdən və hündür qüllələrdən də istifadə etmişdir.

Raketə quraşdırılmış kamera ilə ilk uğurlu aerofotoçəkiliş 1897-ci ildə isveçli ixtiraçı Alfred Nobel tərəfindən edilmişdir. Hal-hazırda ən çox Nobel mükafatı laureatı kimi tanınır. 1906-cı ildə Almaniyadakı Albert Maul, sıxılmış hava ilə idarə olunan bir raket istifadə edərək daha etibarlı bir

metod inkişaf etdirdi. 1912-ci ildə Avstriya ordusuna təkmilləşdirilmiş raketini nümayiş etdirdi, lakin o vaxta qədər təyyarələr daha səmərəli hesab edilirdi.



**Şəkil 1: (solda) Alfred Nobel tərəfindən raket kamerasından istifadə edərək İsveç kəndlərinin hava fotoşəkili, (sağda) Albert Mole raketi və (mərkəzdə) Almaniyanın kəndlərindən birinin havadan çəkdiyi aerofototəsvirlərdir**

Təyyarədən çəkilmiş ilk hava fotoqrafiyası 1909-cu ildə Wilbur Wrayt tərəfindən çəkilmişdir. Birinci Dünya müharibəsi zamanı hər iki tərəfin istifadə etdiyi döyüş xəritələri aerotoçəkiliş təsvirləri əsasında tərtib edilirdi və müharibənin sonunda hər iki tərəf gündə ən azı iki dəfə bütün cəbhənin təsvirini alırdı. Termal infraqırmızı detektorlar da daxil olmaqla təyyarələrdə istifadə üçün xüsusi olaraq hazırlanmış kameralar istehsal edilmişdir (7).



**Şəkil 2: (solda) Birinci Dünya müharibəsi zamanı hərbi hava müşahidəçisi/fotoqraf (sağda) 1916-cı ildə döyüş səngərlərinin şaquli olaraq aerofotoçəkilişi**

Hal-hazırda aerofotoçəkiliş kameraları ümumiyyətlə rəqəmsaldır. Hal-hazırda rəqəmsal fotoqrammetriyada tamamilə rəqəmsal kamera sistemlərinin istifadəsinə keçilmişdir. Müasir rəqəmsal kameralar tərəfindən həyata keçirilən rəqəmsal fotoqrammetriya əhəmiyyətli dərəcədə yüksək performans, daha yüksək metrik dəqiqlik, həm panxromatik, həm də çoxkanallı (R, G, B, yüksək keyfiyyətli) görüntülər əldə etməyə imkan verir (Şəkil 3).




**Şəkil 3: Trimble şirkətinə məxsus AIC rəqəmsal fotokamera**

Aerofotoçəkilişin fərqli növləri mövcuddur və bunlar yüksəklikdən düz çəkiliş və ya meyillik nəzərə alaraq həyata keçirilən çəkilişlər, çəkiliş planları və ya perspektiv çəkilişlər adlanır. Hər bir halda, hava şərəfəyənləri çəkiliş edirlər. Bəzən hərəkət edən obyektləri silindir şəklində çəkilişlər də aparılır, bu prosesə panarama deyilir. Əsasən, aerofotoşəkillər bir obyektivli kamera ilə çəkilir. Amma bəzən çoxobyektivli kameralardan istifadə edilir. Həmçinin, tək hava çəkilişləri mövcuddur ki, bu zaman bir istiqamətdə və ya sahə boyu çəkilişlər edilə bilər. Bu hallarda çəkiliş marşrutu və ya sahəvi adlanır. Aerofotoçəkilişin istifadə edilməsindən asılı olaraq aerofototəsvirlərin müxtəlif növlərindən istifadə olunur. Ən çox istifadə olunan topoqrafik aerofotoçəkilişdir. Topoqrafik aerofotoçəkiliş, sonradan topoqrafik xəritələr və planlar yaratmaq üçün istifadə olunan aerofototəsvirləri əldə etmək üçün təyyarədən yer səthinin çəkilişinin texnoloji prosesidir (Bulavitskiy, Zhukova, 2016: 3).

Aerofotoçəkiliş işləri aparıldıqdan sonra aerofotoçəkiliş materiallarının keyfiyyəti qiymətləndirilir. Aerofotoçəkiliş materiallarının keyfiyyətinin qiymətləndirilməsi, həqiqətən əldə edilmiş nəticələrin texniki şərtlərin tələblərinə və mövcud standartlara uyğunluğunu müəyyənləşdirmək üçün həyata keçirilir. Aerofototəsvirlərin keyfiyyəti atmosferin vəziyyətindən, obyektin işıqlandırılmasından, aerofotoçəkilişin texniki şərtlərindən və s. asılıdır. Vizual qiymətləndirmə zamanı aeorofotoneqativlərdə mexaniki zədə, buludluluq, buludların kölgələri, parıltı aşkar edilməməlidir (Meisner, Cramer, Reulke, 2018: 297).

Geodata məlumatlarına tələbatın artması ilə yüksək məkan, spektral və ayırdetmə qabiliyyəti ilə aerofotoçəkiliş getdikcə inkişaf edir. Əldə edilən təsvirlərin kifayət qədər keyfiyyətli olub olmadığını qiymətləndirmək çox vacibdir, çünki təsvirlərin mozaikası ciddi bir zaman ardıcıllığı tələb edir və yenidən uçuş aparmaq daha çox vəsait tələb edir. Müxtəlif texnologiyalardan istifadə edərək görüntünün müxtəlif hissələrindən bərabər paylanmış nəzarət nöqtələrindən istifadə edərək, ötürmə matrislərini hesablayaraq və təsvirləri mozaika etmək üçün görüntü fırlanma bucağından istifadə edərək qiymətləndirməni aparmaq mümkündür (Zhang, Bangyu, Zhang, Xu, 2014: 2).

Aerofotoçəkiliş materiallarının keyfiyyəti fotoqrammetrik göstəricilərlə qiymətləndirilir. Aerofototəsvirlərin fotoqrammetrik keyfiyyəti alınan təsvirlərin parametrlərinin müəyyən edilmiş fotoşəkil çəkiliş parametrlərinə uyğunluğu ilə müəyyən edilir (Varnakov, Vedernikova, Savkin, 137). Aerofotoçəkiliş materiallarının fotoqrammetrik keyfiyyəti aşağıdakı meyarlara əsasən qiymətləndirilir: təsvirlərin uzununa və eninə üst-üstə düşmə faizi, aerofotoçəkiliş marşrutunun düz olması, tədqiqat sahəsinin orta müstəvisindən yuxarı olan fotoşəkilin faktiki hündürlüyü, tədqiqat sahəsinin sərhədlərinin müəyyən olmasıdır (Kalinin, Bondarenko, Strogiy, Sementsov, Kazachkov, Matveykina, Samoylova, 5). Bir marşrutda qonşu şəkillər ixtiyari istiqamətdə bir-birini müəyyən qədər örtürsə belə örtmə uzununa örtmə adlanır. Uzunununa örtmə relyefdən asılı olaraq dəyişir (60-90 %) (Əliyev, Qocamanova, Ömərov, Dənziyev, Qaziyeva, 2017: 5).

Aerofototəsvirlərin keyfiyyəti vizual qüsurların olmamasından ibarətdir və aerofotoçəkiliş obyektinin işıqlandırılmasından, atmosferin vəziyyətindən və istifadə olunan avadanlıqların vəziyyətindən asılıdır. Ərazilərin xəritələşdirilməsi üçün istifadə olunan aerofototəsvirlərdə buludlar, onlardan kölgələr, parıltı hər hansı digər pozuntular olmamalıdır. Şəkillər kifayət qədər aydın və ətraflı olmalıdır. Aerofotoçəkiliş materiallarının keyfiyyətinin qiymətləndirilməsi üzrə işlər başa çatdıqdan sonra onun təlimatların və texniki tapşırığın tələblərinə uyğunluğu barədə rəy verilir. Tələblərə uyğun gəlmədikdə təkrar aerofotoçəkiliş aparılır.

Aerofotoçəkilişin aparılmasına bir çox amillər təsir göstərir. Bu amillər aşağıdakılardır:

***Miqyas.*** Miqyas aerofototəsvirdəki iki təsvir arasındakı məsafələrin və yerdəki eyni iki nöqtə/cisim arasındakı faktiki məsafənin nisbəti, başqa sözlə f/H nisbəti (burada f kamera obyektivinin fokus uzunluğu və H hündürlükdür), şkalanın fotoşəkildən digərinə dəyişməsi uçuş hündürlüyünün dəyişməsi ilə əlaqədardır ki, miqyas dəyişikliyinə əlavə təsir göstərən digər amillər meyl etmə və relyef yerdəyişmələridir.

***Fotoqrammetrik kameralar.*** Fotoqrammetrik kameralar yüksək həndəsi və radiometrik dəqiqliyə malik xəritəçəkmə üçün qurulmuş xüsusi kameralardır. Bu kameralar dəqiqliklə qurulub və məqsədyönlü şəkildə çoxlu sayda fotoşəkilləri yüksək həndəsi dəqiqlik və keyfiyyətlə sürətlə ardıcıl olaraq çəkiliş aparmaq üçün nəzərdə tutulub.

***Aeroplyonkalar.*** Sabit imitasiya bazası üzərinə qoyulmuş çox qatlı emulsiyadır. Ümumiyyətlə aeroplyonkalar eni təxminən 10 düym və uzunluğu 200 ilə 500 fut arasında olan rulonlarda mövcuddur. Müxtəlif məqsəd və unikal vəziyyətlərə uyğunluğundan asılı olaraq istifadə olunan müxtəlif aeroplyonkaların növləri mövcuddur. Panxromatik və təbii rəngli plyonkalar ən çox istifadə olunandır. Bu iki plyonka və infraqırmızı birlikdə aerofotoqrafiyada istifadə olunan əsas bazanı təşkil edir (Şəkil 4).




**Şəkil 4: Aeroplyonkaların növləri**

***Vaxt.*** Aerofotoçəkilişin aparıldığı vaxt çox vacibdir. Təcrübəyə əsaslanaraq, aerofotoçəkiliş günəşin hündürlüyü üfüqdən 30 dərəcə yüksək olduqda və ya günortadan üç saat əvvəl və sonra aparılmalıdır.

***Mövsüm.*** İşığın əks etdirmə qabiliyyətinin mövsümi dəyişmələri, bitki örtüyünün mövsümi dəyişiklikləri və iqlim amillərindəki mövsümi dəyişikliklər kimi amillər mövsümün uyğunluğunu seçmək üçün əsas məqamlardır. Məsələn, fotoqrammetrik xəritəçəkmə, geoloji və ya torpaq tədqiqatı məqsədləri üçün yer mümkün qədər aydın görünməlidir.

***Atmosfer faktorları.*** Atmosferdə hissəciklərin (tüstü və ya toz) və qaz molekullarının mövcudluğu, xüsusən daha ağır hissəciklər tərəfindən səpilmə səbəbindən kontrastı azaltmağa meyllidir, buna görə də aerofotoçəkiliş üçün ən yaxşı vaxt səmanın aydın olduğu vaxtdır.

Ümumi uçuş keyfiyyətinin yoxlanılması əsasən yoxlama təhlili və müqayisəli analiz yolu ilə aparılır. Təsvirin görünüşünə dumanın, bulud kölgəsinin və digər faktorların olmasını, görüntü rənginin keyfiyyət tələblərinə cavab verib-vermədiyini yoxlamaq üçün insan-kompüter qarşılıqlı əlaqəsindən istifadə olunur (Zongbiao, Miao, Linbing, Jin, 2021: 142).

Aerofotoçəkiliş materiallarının keyfiyyəti aşağıdakı əsas amillərlə müəyyən edilir:

1. çəkiliş üçün təbii şərtlər - əsas olanlar işıqlandırma və atmosfer vəziyyətidir;
2. çəkilişin texniki şərtləri - aerofotoçəkiliş zamanı daşıyıcıdakı dəyişikliklər, bort kamerasının texniki xüsusiyyətləri;
3. texniki çəkiliş parametrləri, ekspozisiya vaxtı, sensorun həssaslıq parametrləri və s.;
4. aerofototəsvirlərin sonrakı işlənməsinin texnoloji parametrləri - radiometrik düzəliş, histoqramın çevrilməsi və s. (Anikeeva, Chibunichev, 2021: 777).

Bu amillərin təsiri görüntü keyfiyyətinin aşağı düşməsinə səbəb ola bilər. Aşağıda sadalanan amillərin təsiri nəticəsində aerofototəsvirlərin keyfiyyət probleminə aid nümunə verilmişdir (Şəkil 3).



**Şəkil 5: Atmosfer faktoru olan dumanın aerofototəsvirin dekodlaşdırma keyfiyyətinə təsirinin nümunəsi**

Hava dumanının aerofotoçəkilişə təsiri əsasən landşaft parlaqlığı intervalının azaldılmasında və nəticədə aerofototəsvirlərdə topoqrafik obyektlərin (xüsusilə qaranlıq olanların) aydın ayrıca reproduksiyasının mümkünlüyü ilə ifadə olunur. Şəkildə dumanın olması, ümumi işıq fonunun olması və kontrastın azalması kimi vizual olaraq müəyyən edilə bilər.

Aerofotoçəkiliş yer səthinin öyrənilməsinin əsas üsullarından biridir ki, bu da tədqiq olunan yer səthinin böyük sahələrini lazımi dəqiqliklə və təfərrüatla tez bir zamanda qeyd etməyə imkan verir. Aerofotoqrafiya obyektiv məlumat verir və vizual yoxlama zamanı fərqlənməyən ərazi obyektlərini müəyyən etməyə imkan verir. Aerofotoçəkilişdə yer səthindəki obyektlər haqqında məlumat onlarla birbaşa təmasda olmadan məsafədən alınır. Müxtəlif məqsədlər üçün alınan aerofototəsvirlərin keyfiyyətinin qiymətləndirilməsi problemi aktual məsələlərdəndir. Aerofototəsvirlərin vizual keyfiyyətinə təsir edən əsas amillərə təbii şərait, aerofotoçəkilişin texniki və texnoloji parametrləri və əldə edilmiş məlumatların sonrakı işlənməsi daxildir. Bu amillərin hər biri ayrı-ayrılıqda və ya birlikdə aerofototəsvirlərin keyfiyyətinə müəyyən şəkildə təsir göstərir. Aerofototəsvirlərin keyfiyyətinin qiymətləndirilməsi struktur və qradasiya xüsusiyyətləri baxımından aparılmalıdır.

## Ədəbiyyat

1. Morgan, J.L., Gergel, S.E., Coops, N.C. (2010). Aerial Photography: A Rapidly Evolving Tool for Ecological Management. Bioscience. № 60, pp.47-59.
2. Risbol, O., Briese, C., Doneus, M., Nesbakken, A. (2015). Monitoring Cultural Heritage by Comparing DEMs Derived from Historical Aerial Photographs and Airborne Laser Scanning. J. Cult. Herit. № 16, pp.202-209.
3. Zhang, S., Barrett, H.A., Baros, S.V., Neville, P.R.H., Talasila, S., Sinclair, L.L. (2022). Georeferencing Accuracy Assessment of Historical Aerial Photos Using a Custom-Built Online Georeferencing Tool. ISPRS Int. J. Geo-Inf, 20 p.
4. Erlandson, J.M., Gill, K.M., Gusick, A.E., Dorrler, A.E. (2019). Identifying Shell Middens with Historic Aerial Photos: An Example from California’s Santa Cruz Island. J. Isl. Coast. Archaeol. № 14, pp.113-122.
5. Bulavitskiy, V.F., Zhukova, N.V. (2016). Fotogrammetriya i distantsionnoye zondirovaniye territorii: ucheb. posobiye, Khabarovsk: Izd-vo Tikhookean. gos. un-ta, 113 s.
6. https://docs.geoscan.aero/ru/master/database/complex-module/aerospace-foto/aerospace-foto.html
7. https://papa.clubexpress.com/content.aspx?page_id=22&club_id=808138&module_id=158950 History of Aerial Photography
8. Meisner, H., Cramer, M., Reulke, R. (2018). Towards Standardized Evaluation of Image Quality for Airborne Camera Systems. Int. Arch. Photogramm. Remote Sens. Spatial Inf. Sci., XLII-1, pp.295-300.
9. Zhang, H., Bangyu, L., Zhang, J., Xu, F. (2014). Aerial Image Series Quality Assessment 35th International Symposium on Remote Sensing of Environment, 7 p.
10. Əliyev, V.V., Qocamanova, Z.N., Ömərov, S.X., Dənziyev, R.M., Qaziyeva, P.Ç. (2017). Fotoqrammetriya. Metodik göstəriş. Bakı, AzMİU, 52 s.
11. Zongbiao, T., Miao, L., Linbing, L., Jin, Z. (2021). Research on key points of quality inspection of aerial photogrammetry results and quality improvement measures. The International Archives of the Photogrammetry, Remote Sensing and Spatial Information Sciences, Volume XLIII-B4-2021 XXIV ISPRS Congress, pp.141-146.
12. Anikeeva, I., Chibunichev, A. (2021). Requırements for aerıal ımages qualıty, obtaıned for mappıng purposes. The International Archives of the Photogrammetry, Remote Sensing and Spatial Information Sciences, Volume XLIII-B2-2021 XXIV ISPRS Congress, pp.777-784.
13. Varnakov, D.N., Vedernikova, T.I., Savkin, I.N. (2021). Otsenka kachestva aerofotosnimkov pri provedenii fotogrammetricheskikh rabot. System analysıs and mathematıcal modelıng. Baykalskiy gosudarstvennyy universitet (Irkutsk), s.135-144.

DOI: https://doi.org/10.36719/2663-4619/96/85-89

**Nurlana Əliyeva**
AMEA Naxçıvan Bölməsi
Tarix, Etnoqrafiya və Arxeologiya İnstitutu
aliyevanurlana71@gmail.com

# NAXÇIVANA QARŞI İDDİALAR VƏ KİLSƏ TƏBLİĞATI

**Xülasə**

Qriqorian kilsəsinin XIX əsrdən bəri daha fəal şəkildə erməni terror siyasi təşkilatlarının, Ermənistan dövlətinin, eləcə də xarici ölkələrin dəstəklədiyi erməni lobbisinin siyasi alətinə çevrildiyi bəllidir. XIX əsrin başlanğıcında erməni kilsə xadimlərinin təhriki, dəvəti və birbaşa iştirakı ilə tarixi Azərbaycan torpaqları olan Naxçıvan əraziləri Rusiya imperiyası tərəfindən işğal edilimişdi. Qarşıda Cənubi Qafqazda heç bir zaman olmayan Ermənistan dövlətinin yaradılması və Naxçıvanın ona qatılması planları dururdu. Erməni kilsəsi bu prosesin əsas ilhamvericisi rolunda çıxış edirdi. Kilsənin planları Cənubi Qafqazda Azərbaycan dövlətçiliyinin ləğv edilməsi, mifik "Böyük Ermənistan"ın yaradılmasına hesablanmışdı.

***Açar sözlər:*** *Naxçıvan, Qriqorian kilsəsi, XIX əsr, erməni lobbisi, Cənubi Qafqaz*

**Nurlana Aliyeva**
Nakhchivan Section of ANAS
The Institute of History, Ethnography and Archaeology
aliyevanurlana71@gmail.com

## Claims against Nakchivan and the church propaganda

**Abstract**

It is clear that since the 19th century, the Gregorian Church has more actively become a political tool of Armenian terrorist political organizations, the Armenian state, as well as the Armenian lobby supported by foreign countries. At the beginning of the 19th century, with the instigation, invitation and direct participation of Armenian churchmen, the territories of Nakhchivan, which are historical Azerbaijani lands, were occupied by the Russian Empire. The next stage of this policy, there were plans to create the Armenian state, which had never existed in the South Caucasus, and to connect Nakhchivan to it. The Armenian Church acted as the main inspirer of this process. The plans of the church were calculated to abolish the statehood of Azerbaijan in The South Caucasus and create the mythical "Great Armenia".

***Keywords:*** *Nakhchivan, Gregorian Church, XIX century, the armenian lobby, South Caucasus*

## Giriş

Aparılmış çoxsaylı tədqiqatlar sübut etmişdir ki, Erməni Qriqorian Kilsəsinin Naxçıvanla bağlı iddialarının kökündə tarixi amillərdən daha çox, siyasi amillər dayanır. Hələ XVIII əsrdə Rusiya dövlətinin himayəsində ermənilərə Qafqazda dövlət yaratmaq üçün Moskvaya səfər edən erməni kilsə xadimləri İsrael Ori və onun köməkçisi keşiş Minas çarın birinci naziri hesab olunan boyar F.A.Qolovinə xristianlar adından müraciətnamə, I Pyotra ünvanlanmış məktub, habelə xeyli miqdar kəşfiyyat və casusluq materiallarını təqdim etmiş, bir qədər sonra isə imperatorun özü ilə görüşmüşdülər. Həmin müraciətnamə və məktublarda Naxçıvanla bağlı iddialar da əksini tapmış və regionun işğal edilməsi üçün müxtəlif üsullar təklif edilmişdi. Erməni kilsə xadimləri tərəfindən çar hakimiyyətinə tədqim edilən 18 səhifəlik planda Naxçıvan şəhərinin yaxınlığından axan Araz çayı "Erməni torpaqlarının hüdudu" kimi təqdim edilirdi. Yazılırdı ki, "Bura İran torpaqlarının başlanğıcı və sərhədidir. Bu çayda bərə keçidləri vardır və həmin keçidləri ələ keçirmək vacibdir. Çünki çay itidir və elə ki orada qoşun toplandı, hazır olan kimi o çayı keçər və yoluna davam edər Şamaxıdan

həmin çaya qədər düşmən olan adamlar heç yoxdur, yalnız xristianlar, təbəələr vardır. Buradakı ölkədə qoşunu yedirtmək və atları yemləmək üçün hər cür ehtiyatlar toplamaq olar. Və bütün qoşunu Naxçıvan şəhərinə toplamaq lazımdır" (2, s. 89)

Qriqorian kilsəsinin XIX əsrdən bəri daha fəal şəkildə erməni terror siyasi təşkilatlarının, Ermənistan dövlətinin, eləcə də xarici ölkələrin dəstəklədiyi erməni lobbisinin siyasi alətinə çevrildiyi bəllidir. XIX əsrin başlanğıcında erməni kilsə xadimlərinin təhriki, dəvəti və birbaşa iştirakı ilə tarixi Azərbaycan torpaqları olan Naxçıvan əraziləri Rusiya imperiyası tərəfindən işğal edilimişdi. Qarşıda Cənubi Qafqazda heç bir zaman olmayan Ermənistan dövlətinin yaradılması və Naxçıvanın ona qatılması planları dururdu. Erməni kilsəsi bu prosesin əsas ilhamvericisi rolunda çıxış edirdi. Kilsənin planları Cənubi Qafqazda Azərbaycan dövlətçiliyinin ləğv edilməsi, mifik "Böyük Ermənistan"ın yaradılmasına hesablanmışdı (2, s. 91).

XX əsrdə erməni kilsəsinin terror təşkilatları ilə bağlantılarına toxunan, onun terrorçu mahiyyətini ifşa edən ABŞ-dan olan tarixçi Samuel Uims bu barədə "Erməni xristian terror dövləti" əsərində çoxsaylı faktlar təqdim etmiş və əsərdə ABŞ hakimiyyət orqanlarına ritorik bir sual ünvanlamışdı:

*"Erməni terrorçuları tərəfindən Amerika torpaqlarına belə hücumlar edildiyi halda ABŞ hökuməti niyə bu kiçik dövlətə milyard dollar xarici yardım verir? Niyə Amerika kilsə qrupları "xristianlara humanitar yardımı" adlandırılan yardıma milyonlarla dollar xərcləyirlər, bir halda ki, Ermənistan kilsəsi və dövləti susur və bütün dünyada terrorun qarşısını almaq üçün heç nə etmir?"* (12).

Aparılan tədqiqatlar göstərir ki, XIX əsrin sonu - XX əsrin əvvəllərində yaxşı silahlanmış və təlim görmüş, güclü kapitala malik, dünya ictimaiyyətinin ictimai rəyini yalançı məlumatlarla azdıran ermənilərin məkrli niyyəti Osmanlı dövlətinin şərq əyalətlərində və Qafazda, o cümlədən Naxçıvanda faşist metodlarından istifadə edərək yerli əhalini vahiməyə salmaq, onları məhv etmək, öz tarixi-etnik ərazilərindən çıxartmaq, maddi və mənəvi mədəniyyət abidələrini dağıtmaq idi. Bu prosesdə nəinki ayrı-ayrı erməni terror-siyasi təşkilatları, erməni kilsəsinin özü də cinayətkar rol oynayırdı.

Beləliklə aydındır ki, erməni iddialarının arxasında duran əsas məqam ondan ibarətdir ki, bura tarixdə heç zaman mövcud olmamış "Böyük Ermənistan"ın bir hissəsi kimi göstərilsin, Naxçıvanın guya "tarixən daha geniş tarixi erməni ərazilərinin" bir hissəsi olduğu əsaslandırılsın. Təbii ki, Naxçıvan beynəlxalq səviyyədə Azərbaycan ərazisinin bir hissəsi kimi tanınır və ermənilərin Naxçıvanla bağlı iddialarını sübut edən heç bir fakt yoxdur.

Araşdırmalarımız göstərir ki, Erməni Apostol Kilsəsinin Naxçıvanla bağlı iddiaları hələ çar dövründən güclənməyə başlamışdır. Nazim Mustafa yazır ki, 1905-1906-cı illərdə erməni kilsəsinin və erməni siyasi partiyalarının maliyyələşdirdikləri silahlı dəstələr Naxçıvan qəzasında silah gücünə etnik təmizləmə siyasəti həyata keçirməyə çalışmış, yeni erməni anklavı yaratmaq cəhdləri göstərmiş, lakin bu yerli əhalinin ciddi müqaviməti nəticəsində baş tutmamışdı (4).

Erməni Qriqorian Kilsəsinin Naxçıvana qarşı əsassız iddialar hazırki dövrdə də davam etməkdədir. Erməni Qriqorian kilsəsinin ruhaniləri ən müxtəlif məqsədlərlə keçirilən toplantılarda Naxçıvanla bağlı əsassız və sərsəm iddialarını səsləndirirlər. Məsələn, 2006-cı ilin aprel ayının 14-də Bütün Ermənilərin Ali Patriarxı və Katolikosu II Qaregin Məsihin şanlı dirilməsi bayramı münasibəti ilə yaydığı müraciətində demişdi:

"*Sülh insan ruhunun həmişə mövcud olan saleh arzusudur ki, o, səmavi Atamızın gözündə bütün insanların qardaş olduğunu dərk etməklə həqiqətən gerçəkləşəcək və sarsılmaz olacaq. Allah sevgisi və qonşu məhəbbəti sayəsində ...bir-birinin mənəvi xəzinələrini və ya müqəddəs yadigarlarını təhqir etməyə yer qalmayacaqdır. Naxçıvanda məhv edilmiş minlərlə erməni xaçkarının haqlı kədər nidaları eşidiləcəkdir. ...Bu əziz Pasxa günündə Allaha dua edirik ki, insanları və insanların iradəsini Öz Həqiqət Ruhu ilə gücləndirsin, başqasının mənəvi dəyərlərini təhqir edən və başqalarının hüquqlarını tapdalayan hərəkətləri, addımları və istəkləri pisləsin"* (10).

II Qareginin çıxışının qeyd olunan hissəsində iki məqam diqqəti cəlb edir. Keşiş əvvəlcə başqalarının mənəvi xəzinələrini və müqəddəs yadigarlarını təhqir etməyin Allaha və İsa Məsihə qarşı çıxmaq olduğunu yazır və mədəni erməni din xadimi obrazını yaratmağa çalışır. O, zaman sual oluna bilər niyə Erməni Qriqorian kilsəsi və şəxsən II Qareginin özü İrəvanda, Ermənistanın digər bölgələrində, 30 il işğal altında saxlanılmış Azərbaycan ərazilərində ermənilər tərəfindən

müsəlman dini abidələrinin dağıdılmasına bir inanclı olaraq heç zaman etiraz etməmişdir. Axı hər kəsə bəllidir ki, erməni kilsəsinin ermənilər və Ermənistan cəmiyyəti üzrəində təsiri kifayət qədər böyükdür. Məgər 1926-cı ildə İrəvanın indiki Respublika meydanında o zamankı Abovyan küçəsində yerləşən VII əsrin tarixi memarlıq abidəsi sayılan Zal xan məscidi dağıdılarkən, onun üzərində Nikolay Bünyatyanın müəllifliyi ilə İnturist mehmanxanasıinşa edilərkən (5) II Qareginin mənsub olduğu Erməni Qriqorian Kilsəsi yox idimi?! Bəlkə XX əsrin əvvəllərində İrəvan şəhərində inşa edilmiş Çətirli (Dəmirbulaq) məscidinin 1988-ci ilin fevralında ermənilər tərəfindən yandırılması mənəvi irsin təhqir olunması deyil?! Bəlkə II Qareginin varisi olduğu Katolikos I Vazgen bundan xəbərsiz olub? Təbii ki, suallar ritorikdir.

İkinci məqam guya hansısa “minlərlə erməni xaçkarı”nın dağıdılması ilə bağlıdır. Bu ağ yalandan başqa bir şey deyildir. O dağıdılmış xaçkarlar Naxçıvan ərazisində mövcud deyildir. Nə II Qaregin, nə də onun rəhbərlik etdiyi kilsənin digər nümayəndələri belə xaçkarların mövcud olmasına dair Naxçıvan ərazisində bircə fakt belə göstərə bilməzlər. XIX-XX əsrdə Naxçıvana köçürülərək gətirilən ermənilərin məzarları isə elə onların öz nəvə və nəticələri tərəfindən sovet dövründə indi Ermənistan adlandırılan əraziyə müxtəlif bəhanələrlə köçürülmüşdür. Bu proses xüsusən XX əsrin 80-ci illərində güclənmişdi.

Maraqlı məqamlardan biri ondan ibarətdir ki, 2020-ci ildə Azərbaycan ərazilərinin azad edilməsi ilə nəticələnən 44 günlük Vətən müharibəsindən sonra kilsənin Azərbaycanın ayrılmaz tərkib hissəsi olan Naxçıvanla bağlı iddiaları daha da güclənmiş və iftiralarının sayı artmışdır. Erməni Qriqorian kilsəsinin rəsmi saytında 2020-ci ilin noyabr ayının 14-də yerləşdirilmiş və guya Qarabağda erməni kilsələrinin dağılmasından bəhs edən saxta müraciətdə də kilsənin Naxçıvanla bağlı iddiaları əksini tapmışdı. Müraciətdə yazılırdı:

*“Biz kədərləndik ki, noyabrın 9-dan 10-na keçən gecə Ermənistan Respublikası, Azərbaycan və Rusiya liderləri arasında Qarabağda hərbi əməliyyatları dayandırmaq üçün atəşkəs sazişi imzalandıqdan sonra azərbaycanlıların Şuşa şəhərinə daxil olublar. Şuşa kilsənin xarici və daxili divarlarında öz izini buraxaraq, Qazançı Müqəddəs ÜmumXilaskar Kilsəsini murdarlayıblar. Biz baş verənləri aşkar vandalizm və dözümsüzlüyün ifadəsi kimi qətiyyətlə pisləyirik. Azərbaycanda və onun tərkib hissəsi olan Naxçıvan Muxtar Respublikasında onilliklər boyu müxtəlif formalarda həyata keçirilən mədəni soyqırımı siyasətini Azərbaycanın himayədarı Türkiyənin addımlarından sonra davam etdirməsi yolverilməzdir”* (11).

Burada səslənən erməni yalanları da öz təsdiqini tapmır. Qazançı kilsəsini həm Birinci Qarabağ müharibəsi zamanı, həm də 44 günlük müharibə dövründə silah anbarına çevirən, dünyaya “xristian abidələri dağıdılır” mesajı verməyə çalışan tərəf Ermənistan olmuşdur. Müharibədən sonra Azərbaycan nəinki abidənin dağıdılmasına icazə verməmiş, əksinə, onun qorunması üçün addımlar atmışdı (9).

Həmin ərəfədə Erməni Kilsəsinin və lobbisinin rüşvət dəstəyi ilə “Christianity today” portalında yerləşdirilmiş yazıda isə saxta məlumatlar daha bəzəkli şəkildə təqdim olunmuşdur: *“Tarixən böyük erməni icmasının yaşadığı Naxçıvan bölgəsi Sovet İttifaqı tərəfindən Azərbaycana verildikdən sonra erməni sakinlər qovulmuş və 6000-dən çox xaç daşı dağıdılmışdır. Mədəni soyqırım kampaniyası 2002-ci ilə qədər davam etmişdir. Bütün bunlar sivil dünyanın gözü altında, tədqiqatçıların və fotojurnalistlərin şahidliyi ilə olmuşdur”* (6).

Naxçıvanda nəinki tarixən, ümumiyyətlə XIX-XX əsrlərdə ermənilərin Azərbaycan ərazilərinə kütləvi şəkildə köçürülüb məskunlaşdırılmasından sonra belə böyük bir erməni icması mövcud olmamışdır. İkinci yalan ondan ibarətdir ki, məqalədə Naxçıvanın guya Sovet İttifaqı tərəfindən Azərbaycana verilməsi iddia olunur. Naxçıvan Muxtar Respublikası sovetləşməyə qədər də Azərbaycanın tərkib hissəsi olmuş, burada qurulmuş məhəlli hökumətlər özlərini Azərbaycanın bir parçası hesab etmiş, xarici güclərin bu ərazini zor gücünə Ermənistana vermə cəhdlərini qəbul etməmişlər. İ.Musayevin də yazdığı kimi Naxçıvan bölgəsinin müsəlmanları özlərini Azərbaycanın ayrılmaz tərkib hissəsi sayır və hökumətdən silah-sursat alacaqlarına ümid edirdilər (3, s. 143).

2021-ci ilin sentyabrında Ermənistanda – Eçmiədzində (Üçkilsədə) Ermənilərin Ali Patriarxı və Katolikosu II Qareginin himayəsi altında keçirilən “Beynəlxalq Din azadlığı və Sülh” (“Conference:

International Religious Freedom and Peace") mövzusunda konfransın kommunikesində də Naxçıvanla bağlı Erməni kilsəsinin saxta iddiaları əksini tapmışdı. Konfrans iştirakçıları adından yayılan, əslində isə Qrriqoryan kilsəsində terror təşilatlarının və Erməni xüsusi Xidmət orqanlarının nümayəndələrinin iştirakı ilə yazılmış Kommunikedə qeyd edilirdi ki, *"Culfa, Naxçıvan və Azərbaycanın digər yerlərində dünya irsi əhəmiyyəti olan erməni tarixi yerlərinin sistematik şəkildə silinməsi ilə bağlı əsaslandırılmış hesabatlar narahatlığımızı daha da artırır"* (8).

Qətnamə hissəsində isə yazılırdı:

*"Azərbaycan hökumətini müstəqil qiymətləndirmə məqsədi ilə son vaxtlar Azərbaycanın nəzarətinə keçmiş Dağlıq Qarabağ ərazilərinə, o cümlədən Naxçıvan və Azərbaycanın digər yerlərindəki müvafiq ərazilərə beynəlxalq çıxışa və monitorinq missiyalarına dərhal və maneəsiz icazə verməyə çağırırıq"* (8).

Yazılanlar cəfəngiyyatdan başqa bir şey deyildi. Adıçəkilən ərazilərdə hər hansı erməni abidəsinin olmaması faktiki olaraq onların "sistematik silinməsi"ni də mümkünsüz edirdi. Faktiki olaraq ermənilərin bu saxta təbliğatlarına inanaraq muxtar respublikaya gələn həm rəsmi nümayəndələr, həm də tədqiqatçılar burada hansısa erməni izinin olması ilə bağlı bircə fakt və ya artefakta sahib deyildilər. Onlar aydın şəkildə görürdülər ki, Naxçıvan Muxtar Respulikasında nəinki Ermənilərə aid hansısa abidə dağıdılmamışdır, tam əksinə Azərbaycan dövlətinin diqqəti və qayğısı sayəsində muxtar respublika ərazisindəki abidələr qeydə alınmış, onların bir çoxunda bərpa, restavrasiya və təmir işləri aparılmışdı. XX əsrin 90-cı illərinin sonlarından etibarən baxımsızlıq ucbatından dağılmaqda olan bir sıra arxeoloji və tarixi abidələr tədqiqi edilmiş, 1997-ci ildə Azərbaycanın Avropa Mədəniyyət Konvensiyasına qoşulmasından sonra abidələrin konservasiyası və restavrasiyası istiqamətində məqsədyönlü addımlar atılmışdı. Heydər Əliyev 1997-ci ildə ABŞ-da səfərdə olarkən Dünya Bankının prezidenti ilə görüşündə ölkə ərazisində mövcud olan nadir tarixi abidələrin bərpası üçün kredit ayrılmasının zəruriliyini bildirmişdi. Ayrılan vəsait hesabına bərpa olunan abidələrdən ikisi məhz muxtar respublika ərazisində yerləşirdi (1, s. 133-134). Muxtar respublika ərazisində müxtəlif istiqamətlər mövcud olan, bu və ya digər formada daşına bilən tarixi abidələri məhv olmaqdan qorumaq, onların tədqiqini asanlaşdırmaq məqsədi ilə 2002-ci ilin iyulunda Naxçıvan şəhərində Açıq Səma altında muzeyin yaradılması haqqında qərar qəbul edilmişdi. Bu muzeydə Naxçıvan MR-sının müxtəlif ərazilərindən gətirilmiş sənduqələr, daş və qoç fiqurları, xatirə abidələri, daş fiqurlar, kitabələr, qayaüstü yazılar toplanmışdı (1, s. 149). 2005-ci il dekabrın 6-da Naxçıvan MR Ali Məclisinin sədri tərəfindən muxtar respublika ərazisindəki tarix və mədəniyyət abidələrinin qorunması və pasportlaşdırılması işinin tədqiqi ilə bağlı sərəncam imzalanmışdı.

2022-ci ilin noyabrında Bütün Ermənilərin Ali Patriarxı və Katolikosu II Qareginin xeyir-duası ilə və Şimali Amerika Erməni Kilsəsinin Qərb Yeparxiyasının Primatı Arxiyepiskop Hovnan Derderyanın dəstəyi ilə ABŞ-ın Los-Anceles şəhərində "Dağlıq Qarabağ bu gün və sabah" adlı konfrans keçirilmiş, 11-13 noyabr 2022-ci il tarixlərində keçirilən həmin toplantıda kilsə xadimləri tərəfindən yenidən Naxçıvanla bağlı əsassız və uydurma məlumatlar səsləndirilmişdi. Həmin məlumatlarda qeyd edilirdi ki, guya *"1997-2006-cı illərdə Naxçıvanın bütün ərazisində 89 kilsə, 6000-ə yaxın xaç daşı və 22000-dən çox məzar daşı dağıdılmışdır"* (8). Konfransda daha sonra vurğulanırdı ki, Azərbaycan hökuməti tarixi abidələrdən erməni izlərinin silinməsi ilə bağlı işçi qrupunun fəaliyyətini dayandırmalı, YUNESKO-nun beynəlxalq mədəni irs üzrə müstəqil peşəkar və monitorinq qruplarına və digər aidiyyatı təşkilatlara "Dağlıq Qarabağ" abidələrinin hazırkı vəziyyəti ilə bağlı monitorinq aparmağa imkan verməlidir. Müvafiq maraqlı tərəflər, xüsusilə də ATƏT-in Minsk Qrupunun həmsədrləri ibadət yerlərinə və qəbiristanlıqlara girişin əsas hüquqlarını təmin etməlidirlər (8).

Aparılan araşdırmalar göstərir ki, Naxçıvanla bağlı saxta faktları tez-tez dilə gətirən II Qaregin həm də traybalistdir. O, Ermənistanda doğulduğu Patrinc (1949-cu ildən bu kənd Voskexat adlandırılmışdır – N.Ə.) kəndindən bir sıra keşiş və yepiskopları təqdis etdiyinə görə qohumbazlıqda ittiham olunur.

2018-ci ildə Ermənistanda genişlənən kilsə etirazlarında dindar ermənilər II Qaregini "bidətçilərlə" – yəni homoseksual qadınlar, Anqlikan yepiskopları və masonlarla görüşdüyünə görə

tənqid etmişdilər. Hətta onun gizli ailə qurması və uşaq sahibi olması ilə bağlı ciddi ittihamlar səsləndirilmişdi (7).

## Nəticə

Erməni kilsəsinin Naxçıvana olan iddialarının əsas göstəricilərindən biri Katalikosluğun tabeliyində müxtəlif ölkələrdə fəaliyyət göstərən kilsələrin və yeparxiyaların adlandırılmasında Naxçıvan adından istifadə edilməsidir. Heç də təsadüfi deyildir ki, Qriqorian kiləsinin Rusiya ərazisində fəaliyyət göstərən yeparxiyası Rusiya və Nor-Naxçıvan Yeparxiyası adlandırılır. Bu yolla Qriqorian kilsəsi həm də beynəlxalq ictimai rəylə manipulyasiya edir. Yeparxiyanı Naxçıvan adlandırmaqla məsələnin mahiyyətinə dam bələd olmayan şəxslərdə "Naxçıvan ermənilərə aiddir" fikrini formalaşdırır. 2013-cü ildə Erməni Qriqorian kilsəsinin Rusiya yeparxiyası üçün Moskvada inşa olunan kilsə-iqamətgaha da Naxçıvan adının verilməsi məhz bu kontekstdə qiymətləndirilməlidir. Şübhəsiz ki, xristian abidəsinin "Yeni Naxçıvan" adı ilə təqdim olunması ermənilərin illərdən bəri iddiasında olduğu Naxçıvan mövzusunun tərkib hissəsi idi. Bu elmi, siyasi, dini cəhətdən də yanlış bir mövqe və təxribat xarakteri daşıyan addım olmuşdur.

## Ədəbiyyat


1. Əkbərov, Q.İ. (2017). Heydər Əliyev və Naxçıvan Muxtar Respublikasında milli-mənəvi dəyərlər məsələsi. Naxçıvan: Əcəmi, 208 s.
2. Məmmədov, Ş. (2017). Erməni kilsəsinin Naxçıvan torpaqlarına qarşı işğalçılıq siyasəti. AMEA Naxçıvan Böməsinin Xəbərləri. № 3, s.86-92.
3. Musayev, İ. (1996). Azərbaycanın Naxçıvan və Zəngəzur bölgələrində siyasi vəziyyət və xarici dövlətlərin siyasəti (1917-1921-ci illər). Bakı: BDDU, 328 s.
4. Mustafa, N. (2023). Şərur və Dərələyəzdə qırğınlar: Erməni cinayətləri: soyqırım, deportasiya, terror. URL: https://genocide.preslib.az/az_a1-5.html
5. A conference entitled "Nagorno Karabakh Today and Tomorrow" was held. (2020-2022). Armenian Church, November 17.URL: The Mother See strongly condemns: Armenian Church, November 14. URL: https://beta.armenianchurch.org/en /news/the-mother- see-strongly-condemns/4451
6. A Plea to Save Artsakh's Armenian Heritage. (2020). Christianity today, November 17. URL: www.christianitytoday.com/ct /2020/november-web-only/karekin-save-artsakh-armenian-churches-nagorno-karabakh.html
7. Atanesian, G. (2018). Armenia's uprising spreads to its church: Eurasia.net, July 20, URL: https://eurasianet.org/armenias-uprising-spreads-to-its-church
8. International Religious Freedom and Peace. (2021). 9-10 September. Mother See of Holy Etchmiadzin, Armenia Communique: Armenian Church, September 13. URL: https://beta.armenianchurch.org /en/news/conference-communiq/10039
9. Kalbizada, E. (2023). Claims and propaganda of the armenians about Shusha after the 44-day war: Musavat, URL: http://www.musavat.biz/ru/news/claims-and-propaganda-of-the-armenians-about-shusha-after-the-44-day-war_995991.html?d=1
10. Message of His Holiness Karekin II on the Occasion of the Feast of the Glorious Resurrection of Christ. (2006). Armenianchurch. URL: https://beta.armenianchurch.org/en/news/Message-of-His-Holiness-Karekin-II-on-the-Occasion-of-the-Feast-of-the-Glorious-Resurrection-of-Christ/464
11. The Mother See strongly condemns. (2020). Armenian Church, November 14. URL: https://beta.armenianchurch.org /en/news/the-mother-see-strongly-condemns/4451
12. Weems, S.A. (2002). Armenia: Secrets of a "Christian" terrorist state. The Armenian Great Deception Series. Dallas: John Press, Shortned version, 76 p.


Göndərilib: 05.09.2023 Qəbul edilib: 08.10.2023

DOI: https://doi.org/10.36719/2663-4619/96/90-95

**İradə Əliyeva**
Azərbaycan Tibb Universiteti
iradaazeri@mail.ru
**Nüşabə Əliyeva**
Azərbaycan Tibb Universiteti
nushabe.aliyeva@bk.ru

# ÜNSİYYƏT VƏ SÖZÜN GÜCÜ

**Xülasə**

Dünyanın bütün dahiləri ünsiyyət zamanı sözün insan zehninə, ağlına, ruhuna və qəlbinə təsirini, sözün ən güclü faktor olmasını zaman-zaman vurğulayıblar. Söz istər pozitiv, istər neqativ anlamda insan həyatını başdan-başa yönləndirən, insan həyatını uğurlu ya uğursuz edən böyük bir gücdür. Sözün gücünə söykənən, ona güvənən, ondan ruhlanan hər kəs xoşbəxt bir yaşama sahiblənəcək.

Məqalədə qoyulan məsələlərin tutumunu genişlətmək, ona Qərb yönü verib dünya arenasına çıxa bilmək üçün sitatlar ingiliscə verilib. Sitatları ingiliscə vermək, onları Azərbaycan dilinə tərcümə etmək məqaləyə ancaq hörmət qazandırar.

Sözün gücünə dair söylədiklərimiz okeanda bir damladır. Söz adlı nəhəng bir okean nə insan düşüncəsi ilə, nə də insan sözü ilə əhatələnməz.

***Açar sözlər:*** *ünsiyyət, sözün gücü, ruh, qəlb, ingiliscə sitat, azərbaycanca tərcümə, frazeoloji feil, Qərb yazarları*

**Irada Aliyeva**
Azerbaijan Medical University
iradaazeri@mail.ru
**Nushaba Aliyeva**
Azerbaijan Medical University
nushabe.aliyeva@bk.ru

## Communication and the power of a word

**Abstract**

All the world's geniuses have periodically emphasized the effects of words on the human mind, mind, spirit, and heart during communication and the strongest factor in the word. Words, whether positive or negative, are a powerful force that can lead a person's life from the start to a successful or unsuccessful one. Anyone who relies on the power of the word, relies on it, and is encouraged by it, will have a happy life.

The article quotes in English to expand the position of the issues laid down in the article, to give it a Western direction and to be able to go to the world arena. Giving them in English will only honor the article by translating them into Azerbaijani.

What we say about the power of the word is a drop in the ocean. A giant ocean called the Word is not surrounded by human thinking or human word.

***Keywords:*** *communication, power of the word, spirit, heart, English quotation, Azerbaijani translation, phraseological verb, Western writers*

## Giriş

Söz ulu Tanrının insanlara bəxş etdiyi üstün bir nemətdir. Dərmanın insan bədənində icra etdiyi funksiyaları söz də insan mənəviyyatında icra edir. Doğulduğu gündən dünyadan köçdüyü günədək dərmansız keçinə bilməyən insan söz olmadan keçinə bilməz. Dərman insanı sağaldır, söz isə canlı

bir varlıq olan insana ilahi bir yaranış, mənəviyyat, ləyaqət paltarı geydirir. Dünyada ən güclü varlıq olan sözün qarşısında dərman olduqca gücsüzdür. Dərman yalnız fiziki anlamda bədəni sağaldır, o, insan ruhuna, qəlbinə, mənəviyyatına, ədəbinə, tərbiyyəsinə, bir sözlə, insanın gözlə görülməyən faktorlarına sirayət edə bilmir. Tanrı onlara sirayət etmə funksiyasını ancaq sözə ayırıb. Söz ruhu və qəlbi dilləndirir, coşdurur, balansa salır, balansdan çıxarır, istiqamətləndirir. Qədim yunan filosofu Qorgi 25 əsr öncə sözdəki gücü dərmanın gücü ilə müqayisə edərək yazırdı (1):

***The effect of speech upon the condition of the soul is comparable to the power of drugs over the nature of bodies. For just as different drugs dispel different secretions from the body, and some bring an end to desease and others to life, so also in the case of speeches, some distress, others delight, some cause fear, others make the hearers bold, and some drug and bewitch the soul with a kind of evil persuasion.***

*Sözün ruhun durumuna təsiri dərmanın bədən üzərindəki gücü ilə müqayisə oluna bilər. Necə ki fərqli dərmanlar bədəndən fərqli ifrazatları qovur, bəziləri xəstəliyə son verir, bəziləri həyat verir, eyni şəkildə sözün də bəziləri narahat edir, bəziləri zövq verir, bəziləri qorxuya səbəb olur, bəziləri dinləyənləri cəsarətləndirir, bəziləri də bir növ şeytani inandırma ilə ruhu ovsunlayır.*

Səslənmə və yazı tutumu ən kiçik olanların biri olan söz güclü bir ustad olmaqla ilahi hünərlərə nail olur. "Veda"lar, Avesta, Bibliya, Quran kimi dini qaynaqları, dahi şairlərin, yazarların, filosofların və alimlərin bəşərin təkamülünə yön verən, ruhu və qəlbi vəcdə gətirən əsərlərini bizlərə çatdıran yalnız sözdür. Gözə görünməz bir xəzinədən qaynaqlanan hər söz minlərlə anlayışa yüklənir. Beş hərfli təkcə "vətən" sözündə minlərlə anlayış yatır. 5 ədədi millyonlarla ədədə dönə bilirsə, onu bir insan yazsa da, səsləndirsə də, o ədəd insana xas bir varlıq deyil, ilahi bir varlıqdır. Deməк, 5-i milyonlara yetirən insan əqli deyil, sözdəki gücdür, bu gücü də ortaya qoyan Tanrıdır, bir başqası deyil. Hansı şair, hansı yazar, hansı filosof, hansı alim 3 hərfli "ana" sözünün gücünü, daşıdığı ağırlığı, çatdırdığı mənanı aça bilər. Aristotel kimi nəhəng bir filosof, Nizami kimi platonik bir şair, Huqo kimi böyük bir yazar, Eynşteyn kimi dahi bir alim bu işin önündə aciz olublar. Necə ki dünyanı bir beşik kimi yırğalayan Tanrı gücü ortada var, sözün gücü var olacaq, heç bir insan oğlu o gücü yenə bilməz. Sözü yenə filosof Qorgiyə veririk (1):

***Speech is a powerful master and achieves the most divine feats with the smallest and least evident body. It can stop fear, relieve pain, create joy, and increase pity.***

*Söz güclü bir ustaddır və ən kiçik və ən az görünən bədəni ilə ilahi hünərlərə çatır. O, qorxunu dayandıra bilər, ağrını toxtada bilər, sevinc yarada bilər və şəfqəti artıra bilər.*

Sözün gücü çox böyükdür, əgər zamanında deyilə, vaxtından öncə və vaxtından sonra deyilməyə. Vaxtından öncə və vaxtından sonra dərilən bir meyvə təravətini, faydasını itirdiyi kimi, zamanında deyilməyən söz də gücünü, potensialını, faydasını, gərəkliliyini itirmiş olur. Gücü olmayan söz fayda yerinə ziyana yol açır, barış yerinə savaşa gətirib çıxarır, uğur yerinə uğursuzluğa səbəb olur. Söz var ordunu savaşa qaldırır, söz var məğlubiyyəti zəfərə döndərir, söz var bir imperiyanı çökməkdən qoruyur. Demək, ordunu səfərbər edən, zəfərə yol açan, imperiyanı qoruyub saxlayan sözün gücüdür. 19-cu əsr fransız yazarı, naşiri Emil de Jirarden zamanında deyilən sözü yaxşı seçilən bir söz adlandırır (1):

***The power of words is immense. A well-chosen word has often sufficed to stop a flying army, to change defeat into victory, and to save an empire.***

*Sözün gücü cox böyükdür. Yaxşı seçilən bir söz çox vaxt qaçan bir ordunu dayandırmağa, məğlubiyyəti zəfərə döndərməyə, bir imperiyanı qurtarmağa bəs olmuşdur.*

*Hər hansı bir alət usta əllərdə olarkən usta işlər gördüyü kimi, sözlər də usta dillərdə səslənərkən usta olaraq səslənər. Demək, sözün gücü sözdə gizli yatır, onu alovlandıran, ona enerji verən,onu pozitiv ya neqativ edən,onu ucaldıcı ya aşağılayıcı edən yalnız insandır,insanın pozitiv ya da neqativ yanaşmasıdır.Sözün taleyi,ortaya qoyacağı sonuc sözdən asılı deyil,onu səsləndirən insandan birbaşa asılıdır. Usta əllərdən çıxan söz,güclü söz dinləyəni özünə çəkir,onu əsir alır,yaratdığı auradan çıxmağa qoymur. Səslənən söz görünməz enerjiyə çevrilərək, dinləyicinin qanına keçməklə bütün orqanlarına, o sıradan ruhuna və qəlbinə nüfuz edir, bu yolla da dinləyici ofsunlanır. Göründüyü kimi, söz ofsunlayan bir gücə sahibdir. Aristoteli yunanca, Qurani-Kərimi*

*ərəbcə, Nizamini farsca,Danteni İtalyanca, Füzulini azərbaycanca, Şekspiri ingiliscə, Höteni almanca, Huqonu fransızca və Dostoyevskini rusca oxuya bilənlər bir okean zövqünə dalaraq, dahi kəlamların ovuna çevrilirlər. Ömrünün 60-cı ilini yaşayan Diana Setterfild adlı tanınmış ingilis xanım yazar "On üçüncü hekayə" anlamında The thirteenth tale" adlı romanında yazır (Diane, 2018: 137):*

***There is something about words. In expert hands, manipulated deftly, they take you prisoner. Wind themselves around your limbs like spider silk, and when you are so enthralled you cannot move, they pierce your skin, enter your blood, numb your thoughts. Inside you they work their magic.***

*Sözlərin nəsə bir özəlliyi var. Usta əllərdə ustaca istiqamətləndirilərək sizi əsir alırlar. Hörümcək ipəyi kimi bədən üzvlərinizə dolanırlar və siz tərpənə bilməyəcək qədər sehirləndikcə dərinizi dələrlər, qanınıza girərlər, düşüncələrinizi keyləşdirərlər. Onlar içinizdə öz sehirkar işlərini görərlər.*

*Yuxarıdakı sitatda "əsir alırlar" anlamında "take prisoner"ingilizcə frazeoloji feil olub, "məftun edirlər" mənasını verir. İngilis dili mütəxəssisi professor Oruc Musayevin "İngiliscə-azərbaycanca lüğəti"ndə "to take prisoner" ("əsir almaq") frazeoloji məsdəri yer alır (Musayev, 2014: 886).*

*Qeyd edək ki, bir qrup Azərbaycan dilçi aliminin tərtib etdiyi "Azərbaycan dilinin izahlı lüğəti"nin 2-ci cildində "əsir" adı altında "əsir almaq" frazeoloji məsdəri yer almır, bu məsdər ədəbi dildə və yazıçıların əsərlərində işlək olsa da (Azərbaycan dilinin izahlı lüğəti, 2006: 138).*

*İnsan bədənində nələr var, hamısı öləridir, təbiətdə olan hər canlı və cansız varlıq kimi. Bu, təbiətin yazılmamış bir qanunudur. Amma bu öləri insan elə söz (əsər) yaza bilər ki, o sözün gücü, ağırlığı, əbədiyaşarlığı öz sahibini poeziya və nəsr əsərlərində, dissertasiyalarda, elmi-publisistik məqalələrdə, insanların xatirələrində qoruyub saxlayır. Neçə əsr öncə ölən bir ədibin böyük bir8 kəlamını indi oxuyuruqsa, ədibin keçirdiyi sevincini, üzüntüsünü, gözləntilərini, istəklərini qanadlı sözlər bizlərə çatdırırlar. Demək, əbədiyaşar sözün gücü, potensialı, enerjisi daim özündə qalır. Onlar səsləndəndə aşkara çıxıb güc və enerji paylayırlar. Doğrudan da, bu bir möcüzədir, bir sehirdir, ağlı heyrət ilə baş-başa qoyan bir müəmmadır. Diana Setterfild adı çəkilən kitabda bu reallığı belə açıqlayır:*

**"People disappear when they die. Their voice, their laughter, the warmth of their breath. Their flesh. Eventually their bones. All living memory of them ceases. This is both dreadful and natural. Yet for some there is an exception to this annihilation. For in the books they write they continue to exist. We can rediscover them. Their humor, their tone of voice, their moods. Through the written word they can anger you or make you happy. They can comfort you. They can perplex you. They can alter you. All this, even though they are dead. Like flies in amber, like corpses frozen in the ice, that which according to the laws of nature should pass away is, by the miracle of ink on paper, preserved. It is a kind of magic".**

*İnsanlar öləndə yox olurlar - onların səsləri, gülüşləri, nəfəslərinin istiliyi, ətləri, sonda da sümükləri. Onlara dair bütün xatirələr bitir. Bu həm qorxunc, həm də təbiidir. Ancaq bəziləri üçün bu yox olmanın bir istisnası var. Çünki onlar yazdıqları kitablarda varlıqlarını davam etdirirlər. Biz onları yenidən kəşf edə bilərik-onların yumorlarını, səs tonlarını, əhval-ruhiyələrini. Onlar yazılı sözlərlə sizi qəzəbləndirə ya da xoşbəxt edə bilər, sizi toxtada bilər, sizi çaşdıra bilər, sizi dəyişə bilərlər. Bütün bunlar olur, onlar ölmüş olsalar da. Kəhrəbadakı milçəklər kimi, buzda donmuş cəsədlər kimi təbiət qanunlarına görə keçib getməli olan şeylər kağız üzərində mürəkkəbin möcüzəsi ilə qorunub saxlanılır. Bu, bir növ sehirdir.*

Yer üzündə insanla yanaşı bütün canlı və cansız varlıqlar danışa bilir. Ağac yarpağı, kölgəsi və meyvəsi ilə, bulud yağışı ilə, gündüz işığı ilə, gecə qaranlığı ilə, quşlar civiltisi ilə, at kişnəməsi ilə, külək vıyıltısı ilə. Bu siyahını minlərlə dəfə artırmaq olar. Bunların hər biri qavrama və emosiya daşıyıcılarıdır. Yazar sözünü söz ilə deyirsə, bəstəkar sözünü bəstəsi ilə, rəssam sözünü tablosu ilə deyir. Bunların da hər biri qavrama və emosiyaya yüklənir.

Bir insan rəssamın çəkdiyi bir tabloya baxırsa, tablo onunla danışaraq, qavrayış və emosiyaya dayanan informasiyalar ötürür. Yazarın tutumu böyük olduqca, sözlərinin tutumu böyük olduğu kimi, rəssamın tutumu böyük olduqca, çəkdiyi tabloların informasiya tutumu da böyük olur. Belə ki, Rafael, Leonardo da Vinçi kimi italyan rəssamlarının dünyanın aparıcı muzeylərində saxlanan tablolarının hər biri tamaşaçıya milyonlarla söz deyə bilər və tamaşaçının intellekti böyük olduqca, bu sözlərin də sayı artar. Ölməz və gerçək bir sənət örnəyi onunla ünsüyyət quran intellektli bir izləyicini mat qoyur. Ona ard-arda tutumlu informasiyalar ötürməklə. Rəngkarlıq üslubunu yazı üslubu ilə bir tutan 18-ci əsr ingilis rəssamı Coşua Reynolds yazır (5):

**Style in painting is the same as in writing – a power over materials: whether words or colors by which conseptions or sentiments are conveyed.**

*Materiallar üzərində güc baxımından rəsmdəki üslub yazıdakıyla eynidir: sözlər ya rənglər ilə qavrayışlar və emosiyalar ötürülür.*

Bir rəngkarlıq əsərində sözlər və emosiyalar rənglər ilə çatdırırlır. Belə ki, "Qırmızı rəng hərəkətlilik və canlılığın, yaşıl rəng dinclik və güvənin, qara rəng güc və ehtirasın, mavi rəng sakitliyin, lacivərdi rəng uğur və gücün, ağ rəng sevinc, saflıq və xəyalın, qəhvəyi rəng sadəlik və səssizliyin, turuncu rəng həyəcan və coşqunun, bənövşəyi rəng özünə güvənin göstəriciləri arasında yer alırlar" (6).

İnsan taleyinə söz qədər təkan verici, onu söz qədər yönləndirici, həyat axarına söz qədər iz qoyucu heç nə yoxdur. İnsan düşüncəsinin səslənən forması olan söz təbiətin əsrlər boyu qapalı qalan sirlərini ard-arda açır, Aya, günəşə və ulduzlara yönələrək onların proqramlarını yaxından izləyir, dərindən öyrənir, Yerin təkini və üstünü kosmosdan incələyir.

İnsan həyatını cənnətə döndərib ona məna qatan sözdür, insan həyatını cəhənnəmə döndərib ona zəhər qatan da sözdür. İnsanı toxtatmaqla ümid qapılarını onun üzünə açan sözdür, insanı məyus edərək onu ümüdsizlüyə sürükləyən də sözdür. Müəllimin biliyini, bacarığını və duyğularının ən incə qatlarını tələbənin zehninə yeridən sözdür, insan zehnini çaşdıran, ona yanlış proqram verən, onu doğru yoldan azdıran da sözdür. Danışanla dinləyicini ünsüyyətə gətirən, danışanı dinləyiciyə isidən və istədən, danışanın düşündüyünü dinləyiciyə diktə etdirən sözdür. İnsan zehninə ən güclü emosiyalar ötürən, insanı vəcdə gətirərək ona zövq daddıran sözdür, insanı öfkələndirərək onu davranış balansından çıxaran da sözdür. Deməк, söz ən güclü pozitiv olduğu kimi, ən güclü neqativdir. İstər pozitivlikdə, istər neqativlikdə söz liderdir, hər iki axında sözü yenə bilən heç nə yoxdur. Bu öndərliyi sözə yaşadan sözün gücü və sehridir. Sözün canında sehir olmasaydı, insan davranışında meydan sulaya bilməzdi. Avstriyalı nevroloq və psixoanalizin banisi, 1939-cu ildə dünyadan köçən Ziqmund Freyd "Gündəlik həyatın psixopatologiyası" anlamında "Psychopatathology of everyday life" kitabında sözün gücündən söz açarkən yazır (Sigmund, 2021: 191):

**Words have a magical power. They can bring either the greatest happiness or deepest despair. They can transfer knowledge from teacher to student. Words enable the orator to sway his audience and dictate its decisions. Words are capable of arousing the strongest emotions and prompting all men's actions.**

*Sözlərin sehirli bir gücü var. Onlar ya ən böyük xoşbəxtlik ya da ən dərin ümüdsizlik gətirə bilərlər. Onlar biliyi müəllimdən tələbəyə ötürə bilərlər. Sözlər danışanın öz dinləyicilərinə təsir etməsini və qərarlarını diktə etməsini mümkün edirlər. Sözlər ən güclü duyğuları oyatmağa və bütün insanların hərəkətlərinə təkan verməyə qadirdirlər.*

Söz düşüncədə ya nitqdə səslənmədikcə, onun gücü kölgədə qalan solğun çiçəyi xatırladır. Söz o ikisində səslənən kimi, gücü alovlanır, üzü günəşə baxan çiçək kimi. Söz insan qəlbini alovlandıra bildiyi üçün ən sərt qəlblərdən göz yaşı axıda bilir və bunu sözdən başqa heç nə edə bilmir. 50 yaşını yaşayan amerikalı yazar Patrik Roflus yazmışkən (8):

**Words are pale shadows of forgotten names. As names have power, words have power. Words can light fires in the minds of men. Words can wring tears from the hardest hearts.**

*Sözlər unudulmuş adların solğun kölgələridir. Adların gücü olduğu kimi, sözlərin də gücü var. Sözlər insanların zehinlərində od yandıra bilərlər. Sözlər ən sərt ürəklərdən göz yaşlarını qopara bilərlər.*

Dili dil edən, ona status verən, dünyanı üç mindən çox danışılan dilini ortaya qoyan, insan zümrəsini xalqlara bölən, başqa sözlə, insanlara xalq adını verən sözdir, sözün daşıyan, ötürən, cəzb edən, yenilməz və ölməz olan gücüdür. Ulu öndər Heydər Əliyev haqlı olaraq buyururdu ki (Heydər Əliyev və mədəniyyət, 2008: 132):

***Dil – millətin mənəviyyat bayrağı, milli mənlik və qürurudur. Dİl yoxdursa, xalq da yoxdur.***

Qida olmasa, qidadan törənən insan ölər, demək, qida mədənin yemidir. Amma insanı canlı varlıq edən qida olsa da, onu üstün mənəvi varlıq edən qida deyil, sözdür. Baxın, 2009-cu ildə vəfat edən amerikalı sahibkar, motivasiya natiqi Cim Rohn sözün zehin, anlama və fərqində olma ilə bağlılığından nə yazır (10):

**Words do two mayor things: they provide food for the mind and create light for understanding and awereness.**

*Sözlər iki önəmli iş görürlər: Zehni qida ilə təmin edir, anlama və fərqində olma üçün işıq yaradırlar.*

**"Söz"dən düzələn frazeoloji feillər.**

Azərbaycan dilində abstrakt (gözlə görünməyən) isimlərlə qramatik əlaqəyə girərək, frazeoloji vahidlər yaradan feillər çoxdur. Belə abstraktlardan biri "söz" anlayışıdır. "Söz"dən 30 frazeoloji feil təqdim olunur, açıqlaması ilə (Azərbaycan dilinin izahlı lüğəti, 2006: 247):

Söz açılmaq – danışmağa başlanmaq, söz açmaq – danışmağa başlamaq, söz altında qalmamaq – deyilən sözə qarşı deməyə sözü olmaq, söz atmaq – birinin fikrini bilmək üçün bir söz demək, söz çıxartmaq – şayiə yaymaq, söz dəymək – birinin sözündən incimək, söz döyüşdürmək – yersiz mübahisə etmək, söz düşmək – danışılmağa başlanmaq, söz gəlmək – qınanmaq, söz gəzdirmək – xəbərçilik etmək, söz güləşdirmək – yersiz mübahisə etmək, söz qaytarmaq – deyilən sözə kobud söz demək, söz qoşmaq – şeir demək, söz salmaq – kimdənsə ya nədənsə danışmaq, söz tutmaq – birinin sözündən təsirlənmək, söz vermək - nəisə etməyə razılaşmaq, söz yürütmək – danışmaq; sözə baxmaq – deyilən sözü icra etmək, sözə gəlmək – mübahisə etmək; sözü azdırmaq – birinin fikrini yayındırmaq, sözü bir yerə qoymaq – vədələşmək, sözü keçmək – sayğılı olmaq, sözü uzatmaq – artıq danışmaq, sözü yerə düşmək – bir istəyi icra edilməmək, sözü yerimək – sayğılı olmaq; sözündən çıxmaq – dediyini etməmək, sözünə baxmaq – deyilən sözü icra etmək, sözünə qulaq asmaq – deyilən sözü icra etmək; sözünü ağzında qoymaq – sözünü yarıda qoymaq, sözünü kəsmək – sözünü yarıda qoymaq. Sözə dair söylənən 30 frazeoloji feil tam siyahı deyil, Azərbaycan türklərinin danışıq dilində, habelə yazarlarımızın əsərlərində söz ilə bağlı əlavə olaraq yüzə yaxın frazeoloji feil var. Bu da "söz" anlayışının xalqın təfəkküründə dərin iz salmasından xəbər verir.

**Füzulinin söz dünyası.**

Böyük şairin "Söz" qəzəlində böyük sözün mahiyyətini açan 4 məsələ üzərində dayanırıq. Birinci olaraq vurğulanır: Sözün dəyərini artıranın dəyəri artar, söz nə dəyərdə olsa – sahibi də o dəyərdə olar. İkinci olaraq vurğulanır: Sözə canlılıq ver ki, əcəl yuxusu olan ölüm səni tutanda söz səni yuxudan oyatsın (elə söz de ki, öləndən sonra o söz səni diri saxlasın). Üçüncü olaraq vurğulanır: Söz könüllər almaq üçün ənbər qoxulu bir gözəldir, qeyb duvağından arabir üzünü göstərər. Dördüncü olaraq vurğulanır: Söz sirlər xəzinəsinin qoruyanıdır, min-min sirli incini arabir safa düzüb aşkar edər. Qəzəlin 4 beytinin klassik azərbaycanca oxunuşu və filoloji tərcüməmiz (Məhəmməd Füzuli əsərləri, 2005: 151):

**Artıran söz qədrini sidq ilə qədrin artırar,**
**Kim, nə miqdar olsa, əhlin eylər ol miqdar söz.**
**Ver sözə ehya ki, tutduqca səni xabi-əcəl,**
**Edə hər saət səni ol uyğudan bidar söz.**
**Bir nigari-ənbərinxətdir könüllər almağa,**
**Göstərər hər dəm niqabi-qeybdən rüxsar söz.**

**Xazini-gəncineyi-əsrardır, hər dəm çəkər**
**Rişteyi-izharə min-min gövhəri-əsrar söz.**

*Sözün dəyərini artıran öz dəyərini artırar,*
*Söz nə dəyərdə olsa, sahibini o dəyərdə edər.*
*Sözə canlılıq ver ki, səni ölüm yuxusu tutanda,*
*Söz hər zaman səni həmin yuxudan oyatsın.*
*Söz könüllər almağa ənbər xətli bir gözəldir,*
*Qeyb duvağından üzünü arabir göstərər.*
*Söz sirlər xəzinəsinin qoruyanıdır, arabir*
*Min-min sirli incini sapa düzüb aşkarlar.*

Füzulinin sözün böyüklüyünə dair böyük fikirləri çoxdur. Şair bir qitəsində buyurur ki, sözündə olan feyz (Tanrıdan olan güc) onun baxtını üstün ad üçün simvol etmişdir. Şair demək istəyir ki, onun sözünün gücü Tanrıdan qaynaqlanır. Doğrudan da, üstün poeziya və incəsənət örnəkləri Tanrıdan güc almayınca, ürəkləri fəth etməklə əbədiyaşar ola bilməz. Füzuli dərviş (yoxsul) olsa da, özünü sultan (şah) sayıb. Onu poeziya sultanı edən sözləridir – gücü Tanrıdan alan sözləri (Məhəmməd Füzuli əsərləri, 2005: 360):

**Gör nə sultanəm məni-dərviş kim, feyzi-süxən**
**Eyləmiş iqbalimi asari-nüsrət məzhəri.**
Dərviş olan mən gör nə sultanam ki, sözün feyzi
Üstün adın izi üçün baxtımı simvol etmişdir.

## Nəticə

Məqalənin aktuallığı odur ki, bütün zamanların olduğu kimi, günümüzün də ən dəyərli incisi, insan həyatını tam yönləndirici olan Sözdən söz açır, ikinci aktuallığı odur ki, yeni və təkrar olunmamış bir səpkidə sözün yenilməz gücü, qarşısı alınmaz sehri incələnir. Üçüncü aktuallığı odur ki, mövzunu yönləndirən sitatlar dünyanın dominant (aparıcı) dili olan ingiliscə və məqalə müəllifinin azərbaycanca düzgün filoloji tərcüməsində verilir.

Ümid edirik ki, məqalədə toxunulan məsələlər kommunikasiya, dilçilik və psixologiya kimi elm sahələrini öyrənən alim və doktorantların diqqətini çəkəcək.

## Ədəbiyyat

1. https://www.azquotes.com / Top 8 Quotes by Gorgias, Jirarden
2. Diane, S. (2018). Thirteenth Tale, The United Kingdom, Harcover Paperback Kindle, 406 p.
3. Musayev, O. (2014). İngiliscə-Azərbaycanca lüğət. Bakı: “Şərq-Qərb”, 1320 s.
4. Azərbaycan dilinin izahlı lüğəti. (2006). II cild. Bakı: “Şərq-Qərb”, 792 s.
5. https://www.quotemaster.org / Quotes about Pover of vords/ J.Reynolds
6. https://www.forumgercek.com /Renkler ve Ressamlar
7. Sigmund, F. (2021). Psychopathology of Everyday Life, Umited Kingdom, Fingerprint Publishing, 240 p.
8. https://www.bookroo.com/ 185 Best Quotes/Patrick Rothfuss
9. Heydər Əliyev və mədəniyyət. (2008). Üç cilddə (3-cü cild). Bakı: “Nurlar”, 536 s.
10. https://www.insightstate.com/ 50 Famous Quotes/Jim Rohn
11. Azərbaycan dilinin izahlı lüğəti. (2006). IV cild. Bakı: “Şərq-Qərb”, 328 s.
12. Məhəmməd Füzuli əsərləri. (2005). Bakı: “Şərq-Qərb”, 400 s.

Göndərilib: 19.08.2023 Qəbul edilib: 06.10.2023

ELMİ İŞ Beynəlxalq elmi jurnal. İmpakt Faktor: 2.255. 2023 / Cild: 17 Sayı: 11 / 96-100 ISSN: 2663-4619
SCIENTIFIC WORK International scientific journal. Impact Factor: 2.255. 2023 / Volume: 17 Issue: 11 / 96-100 e-ISSN: 2708-986X

DOI: https://doi.org/10.36719/2663-4619/96/96-100

**Famil Mədətov**
Bakı, Azərbaycan
familmadatov11@gmail.com

# FUAD KÖPRÜLÜNÜN ELMİ İRSİNDƏ "KİTABİ-DƏDƏ QORQUD" DASTANININ YERİ

**Xülasə**

Oğuz türklərinin ortaq abidəsi olan "Kitabi-Dədə Qorqud" dastanı eyni zamanda bəşər mədəniyyətinin də zəngin mənəvi xəzinəsidir. Abidənin öyrənilməsi həm yerli, həm də dünya alimlərinin daim diqqət mərkəzində olmuşdur. Bununla bağlı çoxsaylı elmi tədqiqatlar aparılmış və sovet rejiminin süqutu nəticəsində bir sıra türk xalqlarının öz istiqlaliyyətlərinə nail olmasından sonra bu, daha geniş vüsət almışdır. Məlumdur ki, sovet ideologiyası zaman-zaman türk xalqlarının tarixi keçmişini əks etdirən, milli dəyərlərin və genetik yaddaşın daşıyıcısı olan folklorun bir sıra nümunələrini, o cümlədən də "Kitabi-Dədə Qorqud"u yasaq etmiş və bununla da əsrlərdən gələn mənəvi bağları süni şəkildə qırmağa çalışmışdır. Bütün maneələrə baxmayaraq, bu dastan sovet imperiyasının təsir dairəsində olan Azərbaycanda da nəşr olunmuş, haqqında çoxsaylı tədqiqatlar aparılmışdır.

Dastanla bağlı F.Köprülünün araşdırmaları özünün elmi-nəzəri sanbalı, tarixi-mədəni dəyəri ilə seçilir. Bir tədqi

qatçı kimi F.Köprülü "Kitabi-Dədə Qorqud"un ideya-bədii cəhətdən mükəmməl sənət örnəyi kimi türk xalqlarının düşüncəsində mühüm rol oynadığını ayrı-ayrı yazılarında da dönə-dönə vurğulamışdır. O, *"Türk ədəbiyyatının mənşəyi"*, *"Ozan"* adlı məqalələrində, *"Türk edebiyyatında ilk mutasavvıflar"* adlı kitabında epos yaradıcılığı ilə bağlı qiymətli fikirlər irəli sürmüşdür.

***Açar sözlər:*** *F.Köprülü, "Kitabi-Dədə Qorqud", dastan, ənənə, ozan, qopuz*

**Famil Madatov**
Baku, Azerbaijan
familmadatov11@gmail.com

## The place of the epic "The Book of Dada Gorgud" in the scientific heritage of Fuad Koprulu

**Abstract**

"The Book of Dada Gorgud" epic, which is a common monument of the Oghuz Turks, is also a rich spiritual treasure of human culture. The study of the monument has always been the center of attention of both local and world scientists. Numerous scientific studies have been conducted in this regard, and after the fall of the Soviet regime, a number of Turkic nations achieved their independence, and it became more widespread. It is known that the Soviet ideology from time to time banned a number of examples of folklore, which reflect the historical past of the Turkish people, are carriers of national values and genetic memory, including "The book of Dada Gorgud", and thereby tried to artificially break the spiritual ties that have come from centuries. Despite all the obstacles, this saga was published in Azerbaijan, which was under the influence of the Soviet empire, and numerous studies were conducted about it. F.Koprulu's research on the epic stands out for its scientific-theoretical and historical-cultural value. As a researcher, F.Koprulu has repeatedly emphaized in his seperate writings that "The Book of Dada Gorgud" plays an important role in the thinking of the Turkish people as an ideal and artistic example of art. In his articles "The Origin of Turkish Literatue", "Ozan", and his book "The First Sufis in Turkish Literatue", he put forward valuable ideas about epic creation.

***Keywords:*** *F.Koprulu, "The Book of Dada Gorgud", epic, ozan, gopuz*

## Giriş

**Məsələnin qoyuluşu.** "Kitabi-Dədə Qorqud" dastanı görkəmli alim Fuad Köprülünün elmi irsində xüsusi yer tutur. Alimin dastanla bağlı tədqiqatları onun ideya-məzmun xüsusiyyətlərini öyrənmək baxımından olduqca dəyərlidir.

**İşin məqsədi.** F.Köprülünün elmi irsində "Kitabi-Dədə Qorqud" dastanının yerini müəyyən etmək, alimin dastanla bağlı apardığı araşdırmalara nəzər yetirmək.

Məlumdur ki, "Kitabi-Dədə Qorqud" eposunun tədqiq tarixi alman şərqşünası Fridrix Ditsin adı ilə bağlıdır. İstanbulda səfir kimi fəaliyyət göstərmiş F.Dits 1815-ci ildə Drezden kitabxanasından XV əsrdə yazıya köçürülmüş əlyazmanı aşkara çıxarmaqla bu sahədə ilk addımı atmış olur. Abidəni elmi dövriyyəyə gətirən alman tədqiqatçı onun ilk araşdırıcısı kimi qorqudşünaslıq tarixinə öz adını yazdırmışdır. Belə ki, o, dastanın "Basatın Təpəgözü öldürdüyü boy"unu almancaya tərcümə etmiş və əlyazması ilə birlikdə nəşr etdirmişdir (Zhirmunskiy, 1974: 519). Daha sonralar yenə alman şərqşünası T.Neldeke eposu bütün boyları ilə birlikdə almancaya çevirməyə çalışsa da, böyük zəhmət tələb edən bu işin öhdəsindən gələ bilməmiş, tərcümə işini yarımçıq halda 1892-ci ildə V.V.Bartolda həvalə etmişdir. V.V.Bartold 1894-1904-cü illərdə dastanın I, II, III və IV boylarını rus dilinə çevirmişdir (Bartold, 1968). Bundan başqa Texas Universitetində dastan F.Sumer, A.E.Uysal, W.S.Walker tərəfindən ingilis dilində də nəşr olunmuşdur ki, bu da dünyada türk xalqlarının milli mədəniyyətini öyrənməyin mümkünlüyü baxımından mühüm əhəmiyyətə malik bir hadisə kimi dəyərləndirilməlidir (The book of Dede Korkut. A turkish epic 1992).

Dastanla bağlı F.Köprülünün araşdırmaları özünün elmi-nəzəri sanbalı, tarixi-mədəni dəyəri ilə seçilir. O, *"Türk ədəbiyyatının mənşəyi"* (Köprülüzadə, 1925: 5-78), *"Ozan"* (Köprülüzadə, 1934: 273-292) adlı məqalələrində, *"Türk edebiyyatında ilk mutasavvıflar"* (Köprülü, 2013) adlı kitabında epos yaradıcılığı ilə bağlı qiymətli fikirlər irəli sürmüşdür.

F.Köprülünün "Kitabi-Dədə Qorqud"la bağlı tədqiqatlarının Azərbaycan folklorşünaslığı üçün aktuallığını artıran cəhətlər sırasında həm də dastanın tarixi Azərbaycan torpaqları ilə bağlılığının inandırıcı faktlarla göstərilməsindədir. O, istər eposla bağlı məxsusi olaraq yazdığı məqalələrində, istərsə də digər əsərlərində, yeri gəldikcə, bu konseptini əsaslı şəkildə sübut etməyə çalışmışdır. F.Köprülü əldə olunmuş nüsxələr əsasında dastanda cərəyan edən hadisələrin Qaraqoyunlu və Ağqoyunlu imperiyalarında olduğunu qəbul edir və buna müvafiq olaraq buradakı rəvayətlərin oğuzların Bayandır boyu ilə əlaqəsinin məlum olduğunu göstərir. O, "Altun küpəli oğuz bəyləri"nın Qaraqoyunlu və Ağqoyunlu ordularında bulunması ilə fikrini bir daha təsdiq etmiş olur.

Bir tədqiqatçı kimi F.Köprülü "Kitabi-Dədə Qorqud"un ideya-bədii cəhətdən mükəmməl sənət örnəyi kimi türk xalqlarının düşüncəsində mühüm rol oynadığını ayrı-ayrı yazılarında da dönə-dönə vurğulamışdır. O, *"Türk ədəbiyyatında ilk mütəsəvviflər"* kitabında yeri gəldikcə bu haqda mülahizələr irəli sürmüşdür. Tədqiqatçı əski türk tarixini bədii boyalarla əks etdirən bütün əsərlər içərisində "Kitabi-Dədə Qorqud"un xüsusi yerini göstərərək yazır: *"O dövrə aid bütün xalq nümunələri, yaxud dini-əxlaqi mövzulu hekayətlər, Battal Qazi kimi qəhrəmanlıq mənqibələri (rəvayətləri), "Dədə Qorqud" boylarının yanında çox təsirsiz və sönük qalırdı. Bir cümlə ilə ifadə etsək, alplar dövrü Anadolusunun bütün zövq və əxlaq xüsusiyyətlərini ən çox nəzərə çarpacaq şəkildə bu əsərdə olduğunu söyləyə bilərik"* (Köprülü, 2013: 356).

Göründüyü kimi, F.Köprülü "Kitabi-Dədə Qorqud"un möhtəşəmliyini, bədii cəhətdən mükəmməlliyini daha əyani göstərmək üçün onu digər məşhur əsərlərlə müqayisə edir və üstünlüyü birinciyə verir. O, hətta bu ölməz dastanı türk ədəbiyyatı ilə müqayisə edərkən göstərirdi ki, tərəzinin bir gözünə "Kitabi-Dədə Qorqud"u, digər gözünə bütün türk ədəbiyyatını qoysan, "Kitabi-Dədə Qorqud" tərəfi ağır gələr.

Tədqiqatçının *"Azərbaycan yurd bilgisi"* məcmuəsində nəşr olunan silsilə məqalələri də xüsusi elmi dəyərə malikdir. Əhməd Cəfəroğlunun redaktorluğu ilə çap olunan bu dərgidə Azərbaycan mühacir ziyalıları milli folklorumuzun tədqiqinə həsr olunmuş məqalələri ilə çıxış edirdilər. Jurnalın Türkiyə təmsilçisi olan F.Köprülü də dastanda cərəyan edən hadisələri və tarixi həqiqətləri əks etdirən məqamlara toxunur. O, *"Dədə Qorqud kitabına aid qeydlər"* adlı ümumi başlığı ilə *"Altun küpəli oğuz bəyləri"*, *"Başa dönmək, aynalmaq"* və *"Ozan"* kimi məqalələrində dastan mətninə

əsaslanmaqla qədim inancları, adət-ənənələri və türk toplumunun zəngin tarixi keçmişini tədqiq edir. Məqalələrin Azərbaycan folklorşünaslığı üçün aktuallığını artıran cəhətlərdən biri də burada Azərbaycanla bağlı tarixi həqiqətlərə daha çox yer verilməsidir (Azərbaycan yataqxanası haqqında məlumat, 1932: 84-91).

Silsiləyə daxil olan ilk məqalə *"Altun küpəli oğuz bəyləri"* adlanır. Bu ifadəyə F.Köprülü eposun İstanbul nəşrində rast gəlmişdir. Elə həmin bu ad tədqiqatçının diqqətini xüsusilə cəlb etmiş, əski zamandan üzü bəri oğuz bəylərinin altun küpə taxmalarının tarixi mənbələrdə necə əks olunması məsələlərinə münasibət bildirmişdir. Türklərin sırğa taxmaq adəti ilə bağlı suallara cavab tapmaq üçün F.Köprülü tarixi qeydlərə, tədqiqatçıların bu istiqamətdə yazdığı araşdırmalara nəzər yetirir. O, islamın qəbul edildiyi dövrə aid əcəm mənbələrində əsarət və köləlik mənasında məcazi bir şəkildə işlənən bu sözün E.M.Quatremer tərəfindən araşdırıldığını tədqiqat obyektinə çevirir. E.M.Quatremer Məğrizi tərcüməsindəki qeydlərdən birində "Vassaf", "Camiüt-Təvarix", "Mətləüs-Sadeyn", "Dövlətşah təzkirəsi", "Həbibüs-Siyər", "Əkbənamə" kimi tarixi mənbələrə, N.Gəncəvinin "İskəndərnamə", S.Şirazinin "Bustan" və "Gülüstan" kimi bədii əsərlərə nəzər yetirmiş, buradan çıxış edərək əski iranlılarda qulağa sırğa taxmaq adətinin əsarət və köləlik əlaməti olduğunu göstərmişdir. Digər tədqiqatçı Kazimirski də bu sözü əsarət və köləlik mənasında izah etmişdir. Lakin F.Köprülü E.M.Quatremerin gətirdiyi nümunələrdə "qulağa küpə taxmaq" adətini yalnız məcazi mənada işlətməsini, bu xüsusda heç bir məlumat verməməsini göstərmiş, bununla onun bu məsələnin tarixi aspektini nəzərdən qaçırmış olduğunu ortaya qoymuşdur. F.Köprülü tarixi mənbələr əsasında İranda qulağa sırğa taxmaq adətinin mövcud olduğunu göstərir. Belə ki, tədqiqatçı Səalibidə Siyavuşun küpələrindən bəhs olunmasını, İbn-əl Bəlhi Keyaniyan zamanında dövlətin pul ilə alınmış kölələrinin qulaqlarına küpə taxmalarını göstərməklə bu ənənənin İranda Əhəmənilər zamanından başlayaraq mövcud olmasını bir daha təsdiq etmiş olur. Bütün bu qeydlərdən sonra F.Köprülü qulağa sırğa taxmaq adətinin türklərdə mövcud olmasını əldə etdiyi tarixi mənbələrlə göstərir. O, Çin qaynaqlarına əsasən qırğızlarda qulağa sırğa taxmaq adətinin mövcud olması qeyd edir, bu adətin mənşəyi, mahiyyəti və digər türk xalqlarında müşahidə olub-olunmadığı barədə dəqiq məlumatların olmadığına da diqqəti yönəldir. Bir sıra mənbələri ciddi tədqiq etmiş F.Köprülü qulağa sırğa taxmaq adətinin lap əski zamanlardan türklərlə bağlı olmasını və onun heç bir İran təsiri olmadan qədim zamanlardan bəri bu toplumda mövcudluğunu elmi faktlarla sübuta yetirmişdir. Bununla bərabər o, bu mühüm elmi əsərini mövzu ilə bağlı yazılmış ilkin tədqiqatlardan sayaraq sonrakı araşdırmalar üçün müəyyən mənada yardımçı missiyası daşıdığını da vurğulamağı vacib saymışdır (Azərbaycan yataqxanası haqqında məlumat, 1931: 84-91).

Alim məqalənin yekununda qulağa sırğa taxmaq adətinin tədqiqini yalnız türklərlə məhdudlaşdırmır, onun digər xalqlarda da mövcud olması ehtimalının tarixi-etnoqrafik mənbələrin köməyi ilə müəyyən olunmasını vacib sayır və yalnız bundan sonra bu ənənənin daha təfərrüatlı qavranılacağının mümkünlüyünü göstərir. Dildə işləklik qazanmış və böyük məna yükü daşıyan elə sözlər, söz birləşmələri var ki, onlar keçmiş haqqında təsəvvür yaratmaq üçün bir meyar, açar rolunu oynayır. F.Köprülü də dil faktları əsasında türk xalqlarının əski inanc, adət-ənənə və bir sıra ictimai-bədii yaşantılarının müəyyən edilməsinin mümkünlüyünü öz tədqiqatılarında gerçəkləşdirmişdir. Bu gün də dilimizdə işlənən "qulağa sırğa eləmək" idiomu ilə əski qırğızlarda təsadüf olunan qulağa sırğa taxmaq adəti bu iki türk xalqlarını həm də məişət ənənəsi baxımından yaxınlaşdırır.

"Kitabi-Qədə Qorqud" dastanının IV boyu olan "Qazan bəyin oğlu Uruz bəyin dustaq olduğu boy"unda Uruzu düşməndən azad etməyə gedən, bu yolda Qazana dəstək olanlardan biri də *"...qulağu altun küpəli, Qalın Oğuz bəglərini bir-bir atdan yıqan Qazılıq Qoca oğlı bəg Yeynəkdir"* ki, o da bu əski ənənənin daşıyıcısı kimi diqqəti cəlb edir ("Kitabi-Qədə Qorqud", 2004: 93).

F.Köprülünün bu məqaləsi elmi əhəmiyyətinə, qaldırılan problemlərin ümumtürk səciyyəsi daşımasına, mədəni əlaqələrin dil faktları əsasında öyrənilməsinə görə elmi-nəzəri dəyər kəsb edir.

Tədqiqatçının "Azərbaycan yurd bilgisi" jurnalında nəşr olunmuş silsilə məqalələrindən ikincisi "Dədə Qorud Kitabına aid qeydlər: başa dönmək, aynalmaq" ("Dede Korqud kitabına aid notlar: başa dönmek, aynalmak") adlanır. Tədqiqatçı bu məqaləsində də bundan əvvəlki yazısında olduğu

kimi, dil faktı əsasında dastanda islamiyyətdən əvvəlki zamanlardakı türk adətlərinin mövcudluğunu əsaslandırır. F.Köprülü qeyd edir ki, dastanın ikinci boyu olan "Salur Qazan evi yağmalandığı boyu"nda Qazan xan gürcüləri məğlub edərək oğlu Uruzu xilas edir, daha sonra qırx qul və qırx kəniz azad edir ("Kitabi-Qədə Qorqud", 2004: 51).

Dördüncü boyda da yenə düşmənə qələbə çalan Salur oğlu Uruzu xilas etdikdən sonra qırx qul və qırx kəniz azad edir ("Kitabi-Qədə Qorqud", 2004: 93-94).

Dastandakı bu qeydlərdən çıxış edən F.Köprülü göstərir ki, XIV əsrdə Şərqi Anadolu və Azərbaycanın müsəlman əhalisi arasında qul və kəniz azad edilərkən onlar kimə görə azad edilirdisə, elə onun da başına döndərilirdi. Bu gün bir sıra adətlərin kökündə əski ənənələrin olduğunu tədqiq edən F.Köprülü bunu qədim və müasir mədəniyyətlər arasındakı irs-varislik əlaqəsinin nəticəsi olduğunu qəbul edir: *"Anadolu və Rumeli türkləri arasında bugün belə mövcud olan bir adətlə "Dədə Qorqud kitabı"ndakı bu qeydləri asanlıqla müqayisə edə bilərik; hər hansı bir səbəblə bir sədəqə veriləcəyi zaman onu namına sədəqə verilən şəxsin başı ətrafında üç dəfə çevirmək ortaq bir adətdir"* (Azərbaycan yataqxanası haqqında məlumat, 1932: 84).

F.Köprülü bu tədqiqatında müqayisəli-tarixi metoddan, yəni dastandakı "başa dönmək", "başına çevirmək" adəti ilə onun eynisi olan və daha çox Azərbaycan türkləri arasında işlənən "başa dönmək, başına dolanmaq" ifadəsini müqayisə müstəvisinə çıxarır, semantik cəhətdən onların eyni məzmun ifadə etdiyini nümunələr əsasında bizə göstərir.

Qeyd edək ki, *"Böyük türk lüğəti"ndə* başına dönmək ifadəsini kiminsə qayğısını çəkmək şəklində göstərilmişdir (Azərbaycan yataqxanası haqqında məlumat, 1932: 84). Lakin F.Köprülü həmin fikirlərin elmi cəhətdən səhv olduğunu məntiqi cəhətdən əsaslandırmışdır. O, əslində bu sözün qurban olmaq mənasını ifadə etdiyini Azərbaycan şairləri olan Əfşarlı Kazım, Mövlana Sahifinin şeirlərindən nümunələr gətirməklə əyani şəkildə bir daha təsdiqləmiş olur.

F.Köprülünün "Azərbaycan yurd bilgisi" dərgisində "Kitabi-Dədə Qorqud"la bağlı silsilə məqalələrindən üçüncüsü *"Ozan"* adlanır. Bu tədqiqat ilə eyni məzmuna malik olan və bəzi düzəlişlərlə ondan daha müfəssəl xarakterə malik "Ozan" adlı digər məqaləni F.Köprülü bundan iki il sonra 1934-cü ildə nəşr etdirmişdir ki, biz də öz tədqiqatımızı da məhz bu araşdırma üzərində aparacağıq.

F.Köprülü "ozan"ın istənilən səviyyədə tədqiq edilmədiyi, hətta oxunuşunun belə şübhəli qaldığı bir vaxtda oğuzların "xalq şair-musiqişünası" mənasında işlətdikləri bu kəlmənin etimologiyası ilə bağlı alimlərin fərqli fikirlərini qələmə alır. O, göstərir ki, Çağatay lüğətindən "ozan" sözünü götürən Pavet de Kourtell və V.V.Radlov onun "uzan", V.V.Bartold isə "ozan" şəklində olduğunu qəbul edir. Daha sonra tədqiqatçı "Qamusi-türki" müəllifi ilə T.Kovalskinin də "uzan" oxunuşunu qəbul etdiyini, bundan fərqli olaraq, A.N.Samoyloviçin göstərilən fikirlərin heç birini düzgün saymadığını vurğulayır (Azərbaycan yataqxanası haqqında məlumat, 1932: 88). Bundan başqa, E.M.Quatremer "Məmlüklər tarixi"ndə ozanlar haqqında qiymətli fikirlər irəli sürmüşdür ki, onun bu tədqiqatı heç bir türkloqun diqqətini çəkməsə də, həmin mənbədən ilk dəfə F.Köprülünün "XVI əsrin sonuna qədər türk saz şairləri" kitabında istifadə etməsi mühüm elmi addım idi. F.Köprülü E.M.Quatremerin adı çəkilən əsərindən R.Dozinin bəhs etməsini nəzərə alaraq, heç olmasa bu alimin əsəri vasitəsilə həmin mənbələrlə tədqiqatçıların tanış ola bilmə şansının olmasına nəzər-diqqəti cəlb edir. Bütün bunlara baxmayaraq, göstərilən mənbələrin araşdırma obyektindən kənarda qalması problemi bugün də davam etməkdədir. Q.Şəhriyarın araşdırmalarına istinadən deyə bilərik ki, ozan-aşıq sənətinin öyrənilməsi üçün mühüm qaynaqlardan olan həmin əsərlər hələ də öz tədqiqatçısını gözləməkdədir (Şəhriyar, 2015: 77).

F.Köprülü E.M.Quatremerin araşdırmasının elmi dəyərini qəbul etməklə bərabər, onun "ozan"ın mənşəyi ilə bağlı bəzi nöqsanlarını da düzəldir. O, E.M.Quatremerin "ozan"ı davul və nağara kimi telsiz musiqi alətinin adı zənn etməsinin səbəbini onun bu sözün türk mənşəli olduğunu bilmədiyindən qaynaqlanmış olması ilə əlaqələndirir.

"Ozan" istilahının qaynaqlara əsasən XIV əsrə gedib çıxdığını göstərən F.Köprülü bununla həmin sözün başlanğıcının XIV əsrlə məhdudlaşmayıb daha əski dövrlərə də gedib çıxa biləcəyinə şübhə etmirdi. E.M.Quatremer Səlcuq imperiyasına tabe olan Misir-Türk məmlüklərində ozanların

olmasını, onların əski oğuz dastanlarını, "Kitabi-Dədə Qorqud" hekayələrini telli sazları ilə (F.Köprülü bu musiqi alətinin qopuz olması ehtimalını irəli sürür – F.M) tərənnüm etmələrini yazmışdır.

F.Köprülünün qopuz haqqında mülahizələri də folklorşünaslıqda xüsusi elmi çəkiyə malik olması ilə diqqəti cəlb edir. O, müxtəlif mənbələr əsasında qopuzun türk xalqlarının qədim musiqi aləti olmasını göstərmişdir. O, C.Huarta istinadən qopuzun əski uyğur mətnlərində təsadüf edildiyini göstərmiş, M.Kaşqarinin "Divani lüğət-it türk" əsərində də qopuz sözünün kobzamaq, kobzatmaq, kobzaşmaq, kobzalmaq şəkillərində olduğuna diqqəti cəlb etmişdir. Qeyd edək ki, Ukrayna və Polşa xalqlarının musiqi sənətkarlarına verdikləri "kobzar" adı türklərdə olan "qopuzçu"nun təsiri ilə yaranmışdır (Qasımlı, 2011: 54). F.Köprülü geniş elmi təsəvvür yaratmaq üçün Altay türklərində baxşıların əsrlərdən bəri istifadə etdiyi musiqi aləti haqqında V.V.Radlovun araşdırmasını nəzərdən keçirərək yazırdı: "Baxşı, şamanların davulu yerinə bir növü kaman, daha doğrusu baso violonçeldən istifadə edirdilər ki, təqribən üç, üç yarım qədəm yüksəkliyində olan bu alətə qopuz deyirdilər" (Koprulu, 1989: 103).

## Nəticə

Nəticə olaraq onu deyə bilərik ki, türklərin zəngin epos ənənələrinin tarixən mövcud olduğuna şübhə etməyən F.Köprülü bu yaradıcılıq nümunələrinin əsasən şifahi formada olduğu üçün unudulub getməsi fonunda əski həyatı təbii və səmimi duyğularla əks etdirən "Kitabi-Dədə Qorqud"un nə qədər böyük mənəvi-estetik sənət örnəyi olduğunu öz tədqiqatlarında bir daha ortaya qoymuşdur.

**İşin elmi yeniliyi.** F.Köprülünün "Kitabi-Dədə Qorqud" dastanı ilə bağlı araşdırmaları tədqiqata cəlb olunmuşdur.

**İşin tətbiqi əhəmiyyəti.** Məqalə "Kitabi-Dədə Qorqud" dastanının türk xalqlarının zəngin ədəbi abidəsi kimi araşdırılması baxımından mühüm əhəmiyyətə malikdir.

## Ədəbiyyat

1. Zhirmunskiy, V.M. (1974). Tyurkskiy geroicheskiy epos (izbr.) Leningrad: Nauka, 725 s.
2. Sumer, F., Uysal, A.E., Walkner, W.S. (1992). The book of Dede Korkut. A turkish epic. London: University of Texas Press, 212 p.
3. Köprülüzadə, F.M. (1915). Türk ədəbiyyatının mənşəyi. Milli təşkilatlar jurnalı. № 4, 78 s.
4. Köprülüzadə, F.M. (1934). Bardlar, türk dili və ədəbiyyatı üzrə tədqiqatlar, s.273-292.
5. Köprülü, F. (2013). Türk ədəbiyyatında ilk sufilər. İstanbul: Alfa, 556 s.
6. Azərbaycan yataqxanası haqqında məlumat. (1932). İstanbul. URL: https://tdkturkdunyasi.gov.tr/tam-metin-pdf/163/tur
7. Samət, Ə. Nəşrə hazırlayanı və redaktoru Hacıyev, T. (2004). "Kitabi-Qədə Qorqud". Bakı: Öndər nəşriyyatı, 376 s.
8. Köprülüzadə, M.F., Validi, A.Z., Hacızadə, M., Ağaoğlu, M. (1932). Azərbaycan yataqxanası haqqında məlumat. Əbdürqədir bəyin iştirakı ilə. İstanbul: Burhanəddin mətbəəsi, № 1, 456 s.
9. Azərbaycan yataqxanası haqqında məlumat. (1931). İstanbul. URL: https://tdkturkdunyasi.gov.tr/tam-metin-pdf/163/tur
10. Şəhriyar, Q., Köprülüzadə, M.F. (2015). Onun "Dədə Qorqud kitabı"na aid qeydlər" əsəri, Bakı: Elm və təhsil, 164 s.
11. Qasımlı, M. (2011). Ozan-aşıq sənəti. Bakı: Uğur nəşriyyatı, 304 s.
12. Koprulu, F. (1989). Literary studies: Istanbul: Otuken, № 1, 470 p.

Göndərilib: 29.07.2023 Qəbul edilib: 03.10.2023

DOI: https://doi.org/10.36719/2663-4619/96/101-106

**Nərmin Şərbətova**
Azərbaycan Dövlət Rəssamlıq Akademiyası
n.quliyeva91@mail.ru

# DAXİLİ DİZAYNDA (İNTERYERDƏ) ERQONOMİK YERLƏŞMƏ

**Xülasə**

Məqalə daxili dizaynda erqonomikanın tədqiqinə həsr olunub. Son illər daxili dizaynda erqonomika anlayışına əsaslanaraq düzgün, funksional yerləşdirmə yəni planlaşdırma metodları ilə çertyoj və layihələrin hazırlanması prosesi aktiv şəkildə yayılmışdır. Bu tədqiqatda yer alan məqalələrdə, sahə üzrə mütəxəssis olaraq inkişaf etmək istəyənlər üçün daxili dizaynda istifadə oluna biləcək mebel və avadanlıqların düzgün yerləşdirilməsi və ölçü standartları əsasında layihələndirməsi haqqında ətraflı məlumat verilmişdir. Məqalədə erqonomikanın insanın psixoloji və fiziki anatomiyası nəzərə alınmaqla düzgün və rahat mühit ölçülərinin yaradılmasının vacib amil olması mühüm şərtlərdən biri olması öz təsdiqini tapır.

***Açar sözlər:*** *erqonomika, interyerdə erqonomik yerləşmə, erqonomik mebel, erqonomik standartlar, layihələndirmə və tikinti*

**Narmin Sharbatova**
Azerbaijan State Academy of Fine Arts
n.quliyeva91@mail.ru

## Ergonomic placement in interior design

**Abstract**

The article is dedicated to the study of ergonomics in interior design. In recent years, the process of preparing drawings and projects with proper, functional placement, its planning methods, based on the concept of ergonomics, has been actively spread in interior design. The article in this study provide detailed information on the proper placement and design of furniture and equipment that can be used in interior design based on size standards for those who want to develop as specialists in the field. In the article, it is confirmed that ergonomics is one of the important conditions for creating the right and comfortable environment, taking into account the psychological and physical anatomy of a person.

***Keywords:*** *ergonomics, ergonomic placement in the interior, ergonomic furniture, ergonomic standards, design and construction*

## Giriş

Erqonomika elmi - gündəlik məişəti necə qurmaq, bununla yanaşı insanın fiziki və psixoloji xüsusiyyətləri nəzərə alınmaqla insanın iş mühitinin qurulmasını öyrənən bir sahədir. İnteryerlərin dizayn edilməsində erqonomika evdə, işdə mebelin maksimal dərəcədə rahat qurulmasına yönəldilib ki, bu da insanların rahatlığını, fəaliyyət və istirahətini təmin etsin. Onun şüarı, yəni çağırışı – interyerin dizayn həllində komfort, rahatlıq, təhlükəsizlik, mebel yerləşim planının rahatlığıdır.

Uzun illər dizaynerlər Lyudviq Neff, Peter Noyfert "Layihələndirmə və tikinti" adlı kitabından istifadə etmişlər. Bu kitab 70-ci illərin əvvəlində dərc olunmuşdur. Bu kitabda olan bir çox normalar bu gün də aktuallığını qoruyaraq müasir dizaynda da istifadə olunmuşdur. Buna baxmayaraq bu kitabın bəzi prinsipləri də köhnəlmişdir. Kitabın dərc olunduğu dövrdəki standartlara görə layihə, yəni ev dörd əsas məsələyə uyğun təyinatla hazırlanırdı: İstirahət, iş günündən sonra gecə yuxusu, yemək qəbulu və hazırlanması, əşyaların yerləşdirilməsi, gigiyena prosedurlarının yerinə yetirilməsi.

50 il ərzində dizaynerin təfəkkürü Le Corbusierin "ev – yaşayış üçün bir maşındır" fikrinə əsasən bütün otaqlar 3-4 standart bir formada bölünürdü. Amma bu gün interyerin dizaynı şəxsiyyətə yönəlmişdir. Layihə ev sahiblərinin istəyi və xarakterinə uyğun hazırlanır.Erqonomika evi komfortlu, təhlükəsiz və gözəl etməyə kömək edir. Onun əsasında anatomiya, psixologiya və digər elmlər durur ki, bu da insanı öyrənməyə yönəlmişdir.

**Erqonomika anlayışı.** Erqonomika – mühəndislik, layihələndirmə elmidir. Bu elm insanların müxtəlif texniki avadanlıqla təchiz edilmiş iş yerlərini və evlərini necə qurmaq qabiliyyətinə malik olduqlarını tədqiq edir. İnsanın olduğu mühitin estetik cəhətdən düzgün qurulması çox böyük əhəmiyyət kəsb edir. Buna görə də erqonomika elmi ilə məşğul olan alimlər dizaynerlərlə işlərini qurmağa çalışırlar. Dizaynerlər müəssisə otaqlarının, ofis binalarının, yaşayış evlərinin planlarını, interyerlərini qurma işi ilə məşğul olurlar (Vladimir, Manusevich).

**İnteryerin dizayn edilməsində erqonomikanın rolu.** Bir insan öz yaşayış yerini necə qurursa, bu onun haqqında çox şey deyir. Bəzi əşyaların evdə olub-olmaması, onların təyinatı, xarici görünüşünü özü seçir. İnteryerdə erqonomika - bu təkcə estetika deyil, həm də praktik, maksimal dərəcədə komfortlu yerləşmədir.

Sovet məkanında bir çox mənzillər "təki evim olsun" prinsipi əsasında tikilirdi. Bu evlər ilk on il üçün normal şəkildə yaşamaq üçün tikilmiş evlər idi. Müasir dövrdə yaşayış evində daha çox sayda və sadəcə gözəllik yaradacaq əşyalar deyil, daha çox funksional özəlliklərə sahib insanın erqonomik rahatlığını təmin edəcək rahat, vizual olaraq həm sadə, həm də gözü yormayacaq müasir standartlara cavab verən ev avadanlıqlarının və mebellərinin istifadəsi, yerləşdirilməsi vacib olmağa başlamışdır. İnsan məişətinin erqonomik şəkildə yerləşdirilməsi müəyyən prinsiplərə əsaslanmalıdır. İstifadə üçün hər bir əşyanın müəyyən edilmiş yerləri olmalıdır. İlk öncə insan hərəkət edərkən heç bir əşyaya toxunmadan rahat hərəkət etməlidir. Yaxşı olar ki, funksional mebel əldə edəsiniz: qatlanan, hərərkət edən, muxtəlif əşyaları qoya biləcəyiniz gizli qapaqlı oturacaqlar və yumşaq mebellər, eyni anda ferqli iş funksiyalarına sahib əşyalar.Evin içərisində düzgün zonaların yaradılması maksimal erqonomikanı əldə etməyə imkan verəcəkdir. Müxtəlif otaq və zonaların düzgün işıqlandırılması çox vacib amillərdən biridir. Bu insanların fiziki və psixiki sağlamlığına, iş bacarığına təsir edən başlıca ünsürlərdən biridir (Panero, Zelnik).

**İnteryerdə erqonomik mebelin yerləşdirilməsi.**İnteryerdə mebelin düzgün yerləşdirilməsi üçün bəzi qaydalar mövcuddur. Mebellər arasında keçidlərin məsafəsi 70-100 sm olmalıdır. Balaca otaqlarda çox az sayda mebel yerləşdirmək lazımdır və onları divar boyunca yerləşdirmək daha düzgün və rahat həll olacaqdır. Çox kiçik otaqlarda mətbəx avadanlıqları komplekt şəklində yerləşdirilməlidir. Açılıb-yığılan (transformer) mebellər interyerin iki-dörd müxtəlif əşyasını özündə birləşdirərərk bir çox funksiyanı yerinə yetirir. İri mebellər, daha geniş otaqlar üçün nəzərdən tutulur ki, onlar kiçik mebelləri əvəz etsin.

**İnteryer dizaynda erqonomikanın əsas qaydaları (3):**

1. Artıq olan nə varsa götürmək, maksimum boş yer saxlamaq;
2. Mebel vizual və fiziki cəhətdən heç nəyə mane olmamalıdır. İnsan evdə rahat hərərkət etməlidir. Hərərkət zamanı heç bir əşyaya toxunmamalıdır;
3. Kiçik otağı dizayn edərkən mümkün qədər açılıb-yığılan mebeldən istifadə olunmalıdır;
4. Təmirə başlamazdan əvvəl hansı otağa nəyi yerləşdirmək lazım olduğunu əvvəlcədən müəyyənləşdirmək lazımdır.
5. İnteryerdə ən əsas amilin nə olduğunu analız etmək və evdə heç bir funksiya daşımayan gözəl obyektlərdən imtina etmək lazımdır;
6. Qabarit mebelləri künclərə yerləşdirmək lazımdır;
7. Nəyi harda saxlamağı öncədən fikirləşin. Məsəslən: tozsoran, təmilzik avadanlıqları, ütü masası, mətbəx avadanlıqları,elektrik cihazları kimi göz yora biləcək elementlər;

Düzgün erqonomik yerləşmə təhlükəsizlik deməkdir. Erqonomik dizaynda iti künclərin olmamasına xüsusi diqqət yetirilir. Hər hansı bir dolabın qapısını açmağa heç nə mane olmamalıdır. Detallar arası keçidlərin 70sm, yaşlı insanlar olan otaqlarda isə bu məsafələrin 1m-dən az olmamasına çalışmaq lazımdır. Bundan əlavə vintilyasiya sisteminin də düzgün yerinə yetirilməsi

önəmli məqamlardan biri hesab olunur. İnteryerdə istifadə olunacaq elektrik avadanlıqlarının sayını və yerini düzgün müəyyənləşdirmək lazımdır. Texniki təhlükəsizlik baxımından uzadıcılardan istifadə etməyin. Əvvəlcədən düşünülmüş və planlaşdırılmış şəkildə hər bir lazımi nöqtədə 1-2 və daha artıq elektrik mənbəyi yerləşdirmək vacibdir (4).

**Dəhlizdə erqonomik yerləşmə. Evə giriş.** Evdə nə qədər çox adam yaşayırsa giriş hissə bir o qədər geniş olmalıdır. Bir- iki nəfər yaşayan evdə giriş üçün 90 sm kifayət edir. Üç nəfərdən ibarət olan ailənin rahat hərəkət etməsi üçün minimum 100-110 sm olması əlverişli olacaqdır. Giriş hissəyə üst geyim və ayaqqabılar üçün dolab yerləşdirmək isdəyirsinizsə dolabın dərinliyinə diqqət yetirmək lazımdır. Ayaqqabıları kompakt şəkildə yerləşdirmək isdəyirsinizsə standart formada və ya transformasiya oluna bilən ayaqqabı rəfləri qoymaq lazımdır ki, ən az 20 cüt yerləşdirmək mümkün olsun. Açar və digər giriş üçün lazımlı avadanlıqları yerləşdirmək üçün gizli dolablar və ya yığılmış mebel daxilində xüsusi hissələr yaratmağı unutmayın. Tavan işıqlanmasında gur işıqlanma məqsədəuyğun olacaqdır. Dəhliz mebelinin dizayn edilməsində əsas qayda paltarı soyunub-geyinmək üçün lazım olan qədər yer saxlamaq, ayaqqabıları yığmaq üçün 30 sm dərinlikdə dolabların olmasıdır. Dəhliz çox kiçik olduqda sezon paltarlarını asmaq üçün asılqanların olması mebelin erqonomik və faydalı istifadə olunmasına imkan verəcək (Runge).




Dəhlizdə düzgün ara məsafələrinin saxlanılması əsas şərtlərdən biri hesab olunur. Dəhlizdə saxlanılacaq ən az məsafənin 90-100 sm-dən az olmaması önəmlidir. Düzgün məsafələr təyin edildikdə burada hərəkət də bir o qədər rahat və erqonomik olacaqdır.Dəhlizdə qapılar çölə doğru açıldıqda, burada ara məsafəsin 140-180 sm dən az olmamasına diqqət yetirmək lazımdır.

**Hamam otağında (sanitar qovşaqda) erqonomik yerləşmə.** Bir araya sığışdırılmış sanitar qovşağı mənzilin ərazisinin iki- üç kvadrat metrəsinə qənaət etməsinə yardım etmiş olar, amma evdə ailə üzvlərinin sayı çox olarsa, bu bir o qədər də rahat olmaz. Ailədə kiçik yaşlı uşaqlar, yaşlı adamlar, əlil insanlar olarsa hamam otağına tutacaqlar qoyulmalı, yer olarsa iki- üç pilləkən də qoymaq lazımdır. Daha təhlükəsiz olması üçün duş kabinası da yerləşdirmək lazımdır. Əsasən duş kabinalarının yerləşdirilməsi kiçik ölçülü sanitar qovşaqları üçün əlverişli bir seçim olacaqdır. Bu zaman boğulma riski azalmış olacaq. Kabinalar üçün sürüşkən və ya qatlanan qapıların istifadəsi əlverişli olacaqdır.Bir araya sığışdırılmış sanitar qovşaqlarında yerləşdirilən əşyalar arasında ən azı 50 sm məsafə qoyulur. Unitazın qapi önündə yerləşdirilməsi duzgün erqonomik yerləşmə olmayacaq (Vladimir).

**Hamam otağının dizayn edilməsinə verilən erqonomik parametrlər:** Sanitar texnikası divardan 75 sm məsafədə yerləşdirilir; Duşla əl- üz yuyan arasında məsafə - 30 sm; Duşdan və yaxud vannadan rəflərə qədər olan məsafə - 70- 90 sm; Döşəmədən əl- üz yuyana qədər 80- 100sm; Əl- üz yuyanın qabağında boş məsafə ən az 55 sm olmalıdır. İnteryerdə bacardıqca 170 $sm^2$ boş yer saxlamaq ideal olardı.

**Mətbəx və yemək otağında erqonomik yerləşmə.** Əvvəllər bir çox mənzillərdə mətbəx çox da geniş götürülmürdü.Bura yalnız yemək bişirmək üçün nəzərdə tutulurdu. Əsas olaraq soyuducu, qaz plitəsi yerləşdirilirdi. Müasir texnikanın müxtəlifliyi, çox olması belə mətbəxlərdə yerləşdirilmədə problemlər yaradır. Mətbəx üçün qarnitur dəst standart modellərdən seçilməlidir. Bu da mətbəxdə rahat hərəkət etməyə imkan verir. Divarda (mümükün olan yerlərdə) tavana qədər rəflər yığılır. Pəncərə önündən əlavə stol kimi istifadə etmək olar. Qab-qacaq və digər mətbəx

əşyalarını yığmaq üçün balaca künc divanların altından istifadə olunur.Mətbəxin önündə açıq eyvan olanda onların arası çox vaxt götürülür və genişləndirilir. Bəzən də yemək otağı ilə mətbəx arasında olan arakəsmə aradan qaldırılır və genişləndirilir.

Eerqonomikanın ilk tədqiqatçıları **"üç bucaq"** adlı termin yaratmışdılar. Bu termin mətbəx mebelinin yerləşdirilməsi üçün nəzərdə tutulmuşdur. Bu nəzəriyyəyə görə yuyulma zonası ilə bişirmə zonası arasında 1,2 m- dən 2,7 m qədər məsafə olmalıdır. Bu məsafənin cəmi 4-8 metrə bərabərdir (7).

1) Qab yuma zonası, 2) buz dolabı, 3) qaz plitəsi




A) B ) C) D ) E)



A) L obrazlı mətbəxdə üçlü yerləşmə; B) U obrazlı mətbəxdə üçlü yerləşmə;
C) Ada obrazlı mətbəxdə üçlü yerləşmə; D) Paralel obrazlı mətbəxdə üçlü yerləşmə;
E) xətti obrazlı mətbəxdə üçlü yerləşmə;

**Qonaq otağında erqonomik yerləşmə.** Müasir qonaq otağı çox funksiyalı bir məkandır. İndiki qonaq otaqları təkcə ailə ilə istirahət etmək, dostlarla görüşüb dincəlmək üçün nəzərdə tutulmur. Çox vaxt burada yatmaq üçün bir neçə yer, iş kabineti, qida qəbul etmək üçün zonalar və bir çox dolablar yerləşdirilir. Otağın mərkəzini doldurmaq olmaz. Kiçik stellaj vasitəsilə oturaq zonasını ayırmaq lazımdır, işləmək üçün bir künc seçilə bilər. Amma elə etmək lazımdır ki, qonaq otağında rahat hərəkət etmək mümkün olsun. Əşyalar arasında məsafə 70 sm-dən az olmamalıdır. Otağın ən az 50%- i boş qalmalıdır. Əgər otaq kiçikdirsə, iri qoltuqlar əvəzinə kompakt divan yerləşdirmək lazımdır. Televizor otağın vizual mərkəzi hesab olunur. Ona baxmaq üçün məsafə televizorun diaqonalının 3-4-nə bərabər olmalıdır. Mebeli də həmin mərkəzə simmetrik olaraq qoymaq lazımdır. Otaqda ən əsası "perspektivi" müəyyən etmək lazımdır: ön plan və arxa plan.Qonaq otağına giriş keçidləri 90 sm-dən az olmamalıdır. Evdəki əşyalar yolu tutmamalıdır. Oturanların rahat ünsiyyət qurması üçün ara məsafəsi 2 metrdən çox olmamalıdır. Divandan jurnal masasına məsafə elə qoyulmalıdır ki, oturan rahat əlini uzadıb götürə bilsin. Qonaq otağında hər şeyi yerləşdirdikdən sonra 2-3 kvadrat metr yer qaldıqda yemək zonası da müəyyən edilir. Yemək zonası 60-ın 120 sm-ə bərabər stoldan və 3-4 oturacaqdan ibarət olur və yaxud iki hündür oturacaq və qatlanan stol yerləşdirilir. Kreslo, stul və divanın kürək tərəfini çıxış tərəfə qoymaq olmaz, çünki orada oturan adamlarla diskomfort yaradacaq (Stadnichenko).

**Yataq otağında erqonomik yerləşmə**. Yataq otağı ele bir istirahət məkanıdır ki, onun da özünə məxsus erqonomik xüsusiyyətləri var. Bu otaqda digər otaqlara nisbətən az vaxt keçirdirik. Buna baxmayaraq əlavə əşyaların bura yığılması doğru olmaz. Çarpayını çox vaxt biz divarın mərkəzindən yerləşdiririk, yanlarına isə kiçik dolablar qoyuruq (bir və ya iki ədəd), kamod və yataq

dəstlərini yığmaq üçün dolab və ya otaq sakinlərinə özəl qarderob otağı yerləşdirmək olar. Qarderob otağının minimum olçüsü 160 sm-dən az olmamaqla götürülməsi məsləhətlidir. Dolabların daxili funksional və yeni texnologiyalarla təşkil olunduqda əşyaların yerləşimi daha rahat olacaqdır. Yəni standartlara uyğun olaraq yataq otağı daxilində sakinlərə özəl sanitar qovşaq yerləşdirilməsi də erqonomiklik və rahatlıq cəhətdən ağıllı həll olacaqdır.Bütün bu sadaladığımız əlavə yerləşmələr təbii ki, otağın olçüləri geniş olduqda mümkün olacaqdır. Əgər yataq otağı kiçik olçülərə sahibdirsə o zaman otağın hər hansı bir künc sahəsində tavana qədər uzanan dolablar yerləşdirmək olar. Başqa bir yerləşmə isə yer itirmədən və vizual olaraq göz yormadan çarpayı arxasında otağın olçülərinə uyğun kiçik qarderob sahəsinin yığılması olacaqdır. Bundan əlavə çarpayı üzərindən və ətrafınca da dolablar yerləşdirərək saxlama zonasını artıra bilərsiniz. Pəncərə kənarını isə oturub kitab oxuyacağınız bir guşə olaraq dəyərləndirə bilərsiniz. İki nəfərlik çarpayı yerləşdirərkən hər iki tərəfdən keçmək üçün yer qoyulmalıdır. Çarpayı ilə divan arasında 50 sm məsafə 70 sm-dən az olmamalıdır. Çarpayının altına toz yığılmaması üçün alt hissəsi bağlı olan model seçmək olar. Bundan əlavə çarpayının altını mövsümdən kənar paltarlar, döşəkçələr və digər istifadə olunmayan əşyaları yığıb saxlamaq üçün xüsusi konstruksiya ilə açılıb bağlanan dolablara bölünmüş bir hissə kimi dəyərləndirmək olar. Çarpayı başlığına yaxın hissələrdə ucu sərt elementlərdən qaçmağa çalışın. Çarpayı ətrafında yerdən hündürlüyü 25 sm olmaqla elektrik yuvaları, bundan əlavə çarpayı ətrafında yerləşdirəcəyiniz işıqları yandırıb söndürmək üçün elektrik açarları yerləşdirmək erqonomik və rahat bir həll olacaqdır.Əgər otaq kiçik olçülərə sahibdirsə, çarpayının yerini təyin etdikdən sonra kənarda qalacaq məsafələrin 50 sm-dən az olmamasına diqqət yetirin.Yataq otağında televizor yerləşdirmək isdəsəniz o zaman çarpayının hündürlüyü (x) və buna əlavə olaraq 35 sm ilə yəni x+35sm - toplam hündürluk həmin televizorun yerləşdirilməsi üçün mərkəz nöqtə hesab olunacaq (9).

**Yan keçidlər:** 1) Optimal olaraq (bizim və xarici mənbələrə əsasən) 70 sm-lik keçidlər hesab edilir; 2) Əgər dolab varsa, o zaman əlavə olaraq 60 sm məsafə daha saxlamaq lazımdır, xüsusilə dolab qapıları açılıb-bağlanan yelləncək formada olduqda; 3) Yatağın yan tərəfindəki minimal keçidlər-50 sm. Bu hissədə üstəlik istilik radiatoru və pərdələr varsa o zaman bu məsafə çarpayıdan radiatora qədər 50 sm olacaqdır.

**Çarpayının aşağı tərəfindəki keçidlər:** 1) Optimal ölçü 60-70 sm hesab olunur. Əgər burada alçaq və açıq şəkildə hündürlüyü 80-90 sm bir tumba yerləşdirilmişdirsə o zaman məsafə 50sm götürülə bilər; **Komod olduğu halda təyin olunmuş keçidlər:** 1) Əgər yataq otağına qoyduğunuz istiqamətdən asılı olmayaraq açılışı çarpayıya doğru olan komod varsa o zaman bu məsafələr rəhat istifadə üçün 100-120 sm olmalıdır; 2) Minimum məsafə 60 sm ola bilər, lakin siz siyirmədən istifadə etdiyiniz halda onun önündə deyil yan tərəfində dayanmalı olacaqsınız (10).

**Uşaq otağında erqonomik yerləşmə.** Uşaq otağının dizayn edilməsində erqonomikanın əsas prinsipi təhlükəsizlikdir. İnteryerdə iti künclər, sürüşkən döşəmə istifadəsi düzgün hesab edilmir. Yerdə istifadə olunan xalçaları ele seçmək lazımdır ki, uşağın hərərkət anında ilisib yıxılmasına səbəb yaratmasın. Məkanın 70% ərazisi uşağın inkişafı üçün faydalı hesab olunan – idman, oyunlar, təhsil, yerdə qalan 30%-i isə mebel üçün nəzərdə tutulmalıdır. Bele olduğu halda uşaq otaqda rahatlıqla hərərkət edərək, qaça və oynaya biləcək. Bu da uşağın fiziki cəhətdən sağlam inkişafına müsbət təsir edəcəkdir. Əgər bir otaqda iki uşaq varsa, hər biri üçün ayrılıqda sahə seçilir. Kiçik qabaritli otaqlarda isə iki mərtəbəli çarpayı yerləşdirməklə oyun sahəsi üçün ərazi qazanmış oluruq. Bu tip çarpayıların modelindən asılı olaraq uşağın 1 yaşdan 4 yaşa qədər istifadə edə bilməsi mümkündür (11).

**Kabinet və yaxud iş yerində erqonomik yerləşmə**. İş yerində hər şey elə təşkil olunmalıdır ki, diqqəti yayındıracaq əlavə nə isə olmasın. İş zonası üçün ayrıca otaq layihələndirmək hər kəsdə alınmır. Əgər evdə əlavə iş sahəsinə çevirə biləcəyiniz boş otaq varsa o zaman siz burada rahat iş görə bilmək üçün erqonomik yerləşmə edə biləcəksiniz. Ev kiçik olduğu və otaq sayı az olduğu halda yataq otağı, istifadə olunmayan eyvan sahəsi, hətta qonaq otağında bele bu cür funksional iş zonası yarada bilərsiniz. Bəzi insanlar var ki öz işlərini yalnız evdən, çölə çıxmadan öz şəxsi iş zonasında görür. Bele olduğu halda əlavə iş otağı ayırmaq vacib şərtlərdən biri hesab olunur. Bu cür

otaqlar üçün nəzərdə tutulan iş masası, stul xüsusi hündürlükdə seçilir. Bu otaqlar yaxşı işıqlandırılmalıdır. İş otaqlarında tavanda ümümi işıqlanmalardan istifadə edib masa və ya iş masasını isə aksentləşdirici yəni masa üstü lampalar və ya bir başa iş masasını işıqlandıracaq işıqlanmalardan istifadə edə bilərsiniz. Yaxşı olardı ki, işıq ön tərəfdən və ya soldan düşsün. Komyüterdən istifadə zamanı işığın düşməsinə diqqət yetirmək lazımdır. Düzgün işıqlanma nəticəsində həmin insanın məhsuldar iş səviyyəsini artırmış olacaqsınız. Mebelin ölçüləri insanın fiziologiyasından asılıdır. Masanın uzunluğu 120 sm olaraq istifadə olunur. Bu, kompüterlə iş zamanı dirsəkləri rahat qoya bilmək üçün imkan yaradır. İş sahəsində hər bir element əllə götürülə biləcək zonalara qoyulmalıdır. İşıq lampası elə yerləşdirilir ki, işləyərkən kölgəsi iş səthinə düşərək maneəçilik və narahatçılıq yaratmasın. Gözlərimiz üçün ən rahatı təbii işığın iş zonasına düşməsidir. Masa pəncərəyə yaxın yerləşdirilməlidir. Kürəyi pəncərəyə doğru oturmayın, əks halda baxışlar həmişə otağın qaranlıq küncünə yönələcəkdir. Bu da gözlərə mənfi təsir göstərərcəkdir. Manitorla göz səviyyəsi arasında məsafə 50 sm olmalıdır. Adi stulda və yaxud söykənəcəksiz oturacaqda oturmaq erqonomik və rahat olmayacaqdır (12).

**İş zonası üçün nəzərdə tutulmuş oturacaq üçün verilən tələblər:** 1) Hündür, arxa tərəfə yönəlmiş kürəklik, baş altı hissəvə dirsəkləri qoymaq üçün yerinin olması; 2) Oturacağın hündürlüyü – 74 sm, ölçüsü 40/40 sm; 3) Alt hissəsində 5 təkər yerləşdirilir; 4) Oturan zaman ayaqlar rahat şəkildə döşəməyə çatır.

## Nəticə

Hal-hazırda yaşayış məkanı daha böyük funksiyalar yerinə yetirməyə başlayıb. Noyfertin zamanından fərqli olaraq, evin dizaynına başqa tələblər qoyulur. Mətbəxdə bir çox məişət avadanlıqları quraşdırılır, uşaq otağı bir çox funksiyaları yerinə yetirir. Qonaqları qəbul etmək və yerləşdirmək üçün yer ayrılır.Bundan əlavə rahatlığı ilə ofisdən heç də fərqlənməyən ev üçün iş yeri də yerləşdirilir. Evdə sakinlərin xobbilərinə uyğun özəl sahələr yaradılır. Hamam təkcə duş qəbul etmək üçün deyil, həm də rahatlaşıb istirahət edə biləcəyiniz zonanı da özündə birləşdirir.

Bütün bunlar göstərir ki, mühitdə düzgün standartların nəzərə alınması insanların rahat və məhsuldar həyat tərzinin başlanğıcı olacaq.

## Ədəbiyyat


1. Vladimir, R., Manusevich, Y. “Ergonomika v dizayne sredy”
2. Panero, Dzh., Zelnik, M. “Osnovy ergonomiki. Chelovek, prostranstvo, inter'yer: spravochnik po proyektnym normam”.
3. “Human Dimension. Interior Space: A Source Book of Design Reference Standards” Julius Panero, Martin Zelnik.
4. “Evaluating the effect of perceived mental workload on work body postures”. International Journal of İndustrial Ergonomics.
5. Runge, V.F. “Ergonomika i oborudovaniye inter'yera”. Uchebnoye posobiye.
6. Vladimir, B. Prosto ergonomika.
7. Noyfert: “Stroitel'noye proyektirovaniye”.
8. Stadnichenko, L.I. “Yergonomika”.
9. https://www.mdcreative.ru/sovety/arhitektura/le-corbusier
10. "Man-machine" system. Operator's working place. Arrangement of working place elements. General ergonomics requirements
11. https://mebel169.ru/articles/kak-pravilno-sproektirovat-interer-s-tochki-zreniya-zakonov-ergonomiki/
12. https://standartgost.ru/g/%D0%93%D0%9E%D0%A1%D0%A2_12.2.032-78


Göndərilib: 01.09.2023 Qəbul edilib: 21.10.2023

DOI: https://doi.org/10.36719/2663-4619/96/107-112

**Mehriban Hacızadə**
Azərbaycan Dillər Universiteti
mehribanhacizade7@gmail.com

# BƏDİİ İFADƏ VASİTƏLƏRİ. METAFORA

**Xülasə**

Dilin lüğət tərkibinin zənginləşdirilməsi üçün tükənməz mənbə olan metaforik vahidlərin mahiyyətinin dərindən öyrənilməsi dildə,o cümlədən Azərbaycan dilində də dünyanın metaforik təsvirini verməyə,metaforik sahələrin onun semantik məkanında təmsil edilmək dərəcəsini tədqiq etmək imkanı verir.

Metafor dilçilikdə məcazi məna daşımaqla ən məhsuldar bədii ifadə vasitəsi olaraq mühüm yer tutur. İstər Azərbaycan, istərsə də ingilis dilində dilin lüğət tərkibinin zənginləşməsində metaforlar əhəmiyyətli rol oynayırlar. Eyni zamanda metaforlar bir sıra üslubların (elmi, publisistik, bədii) formalaşmasında mühüm rola malikdirlər.

Metafordan bəhs edərkən ilk növbədə məna və anlayış məvhumu nəzərə alınmalıdır. Məna sözün bildirdiyi fikir, anlayış isə zehni obrazdır. Metafora dilçilik üçün çox vacibdir, fikir və yaradıcılıq mənbəyidir. Metafora-yalnız dilçilik sahəsində elmi araşdırmalar aparan tədqiqatçıların deyil, psixoloqların, filosofların, sosioloqların da diqqətini cəlb etmişdir. Metaforlar həm üslubi-semantik, həm də leksik-semantik cəhətdən araşdırılmışdır. Metafora hər zaman tədqiqat obyekti olmuşdur.

Bütün bunlar metaforun dilçilik üçün vacib bir fenomen olduğunu sübut edir. Dil təbiətinə görə ikili xarakter daşıdığından bir tərəfdən əşyaya, digər tərəfdən isə "simvolik aləmə" aiddir.

Dil – metaphor vasitəsilə effektli şəkildə öyrənilir. Metaforun tədqiqi fərdi idrakın obrazlılığı ilə tamamlanır.

***Açar sözlər:*** *metafora, məna, anlayış, mental obraz, üslub, bədii ifadə*

**Mehriban Hajizadeh**
Azerbaijan University of Languages
amikhajizade7@gmail.com

## Means of figurative expression. Metaphor

**Abstract**

Metaphor is the most productive means of figurative expression in linguistics. Metaphors play an important role in enriching the vocabulary of the language, both in Azerbaijan and in English. At the same time, metaphors have an important role in the formation of a number of styles (scientific, public, figurative).

When talking about a metaphor, the meaning and concept of the abstract should be taken into account first. The meaning is an expressed idea, and the concept is a mental image. Metaphor is very important for linguistics, it is the source of ideas and creativity. Metaphor has attracted not only the attention of linguistics, but also the attention of psychologists, philosophers, and sociologists. Metaphors were investigated both stylistically-semantically and lexically-semantically. Metaphor has always been an object of tade.

All this proves that metaphor is an important phenomenon for linguistics. Since language has a dual character by its nature, it is effectively learned through language – metaphor as an aid to the object on the one hand, and to the "symbolic world" on the other hand. The study of metaphor is completed by the imagery of individual cognition.

***Keywords:*** *metaphor, meaning, concept, mental image, style, figurative expression*

## Giriş

Metaforanın öyrənilməsinin əsası Aristotel tərəfindən qoyulmuşdur. Metaforik köçürmə dinləyiciyə müsbət təsir göstərən və mübahisəni gücləndirən əhəmiyyətli bir dil vasitəsi olaraq qəbul edilirdi. Aristotelə görə, iki cismin oxşarlığı metaforik köçürmənin əsasını təşkil edir (Aristotel, 1982:55).

F.Nitzşeyə görə isə, metafora ən təsirli, təbii, dəqiq və sadə dil vasitəsidir (Nitsshef, 1990: 390). Sonralar metafora problemi ritorikadan psixologiya və dilçiliyə keçdi. Beləliklə, müqayisəli metafora anlayışı yarandı. Metafora gizli bir müqayisə şəklində təqdim edildi. Müqayisə nəzəriyyəsində metaforik ifadə iki və ya daha çox cismin müqayisə edilməsi ilə əlaqələndirilirdi.

M.Blekə görə, metaforadan istifadənin iki əsas səbəbi var: müəllif metaforik mənaya birbaşa kvivalent tapmaq mümkün olmadıqda və ya sırf stilistik məqsədlərlə metaforaya müraciət edir.

Metaforik köçürmə, onun fikrincə, semantik məna və stilistik potensialın özünəməxsusluğunu özündə birləşdirir (Blek, 1990: 156).

Bədii ifadə vasitələri bədii dilin tərkib hissələrindən biridir. Bədii ifadə vasitələrində sözlər həqiqi mənada yox, məcazi mənada işlənir. Buna görə də onlara məcazlar da deyilir. Bunlar obrazlılığın leksik səviyyədə göstəriciləri hesab olunur.

Məcazların əsas növləri aşağıdakılardır:

1. epitet
2. təşbeh
3. metafora
4. metanomiya
5. simvol
6. sinekdoxa

**Epitet.** Bədii əsərdə müəyyən bir fikri daha qüvvətli və qabarıq şəkildə çatdırmaq üçün onu ifadə edən sözə başqa bir təyin edici söz əlavə olunur. Həmin söz epitet adlanır. Epitet yunan sözü olub “əlavə” deməkdir. Klassik ədəbiyyatda gözəl üçün işlədilən “gül üzlü”, “qələm qaşlı”, “sərv boylu”, “ahu baxışlı” və s. kimi ifadələr epitetdir.

**Məsələn:**” Döyüşə aslan ürəkli oğullar gedir”.

Təyinedici xüsusiyyətinə görə epitetə bədii təyin də deyilir. Qara saçlı ifadəsində qara sözü epitet sayılmır, çünki məcazi mənada işlənməmişdir. Burada həmin söz adi təyindir. Saçın qaraolması təbii haldır. Amma qara bəxtim ifadəsində qara sözü epitetdir və obrazlılığın leksik səviyyədə göstəricisidir. Epitet birinci (asılı) tərəfi məcaziləşmiş olan I növ təyini söz birləşməsidir.

**Təşbeh.** Bənzətmə deməkdir. Bir əşya və ya hadisənin daha qüvvətli əlamətə malik başqa əşya və ya hadisəyə bənzədilməsinə təşbeh və ya bənzətmə deyilir. Təşbehin bənzəyən, bəzədilən, bənzətmə qoşması,bənzətmə əlaməti kimi tərkib hissələri var.

“Əli şir kimi güclüdür”. Burada Əli – bənzəyən, şir – bənzədilən, kimi – qoşma, güclü isə bənzətmə əlamətidir. Klassik ədəbiyyatdan bir nümunə :” Ey yanağı lalə Kiki al gözəl! Siyah zülfün zanəxdana yaraşmır”. M.P.Vaqifin bu misralarında yanaq – bənzəyən, lalə – qoşma, al–isə bənzətmə əlamətidir. Təşbehin son iki tərkib hissəsinin iştirakı olmadan işlənməsi hallarına da rast gəlirik.

**Məsələn :** Aşıq Ələsgərin ” Almadı yanağın, büllur buxağın” misrasında yanaq almaya, buxaq büllura bənzədilmiş, lakin bənzətmə əlaməti (sifət)və qoşma işlədilməmişdir. Bu cür təşbehlərə mükəmməl təşbeh deyilir. (Misradakı təşbehlər tam şəkildə belə qavranılır: ya ağın alma Kiki qırmızı, buxağın büllur kimi ağdır.)

**Metafora** (istiarə, köçürmə, gizli bənzətmə). Köçürmə mənasını bildirir. Bir əşya və ya hadisənin əlamətinin başqa bir əşya və ya hadisə üzərinə köçürülməsinə deyilir. Metafora da təşbeh kimi bənzətmə, oxşatma əsasında yaradılır. Lakin təşbehdən fərqli olaraq, bu bənzətmə “gizli” olur: Metaforada qarşılaşdırılan tərəflərdən biri iştirak etmir. Həmin tərəfin bir əlaməti o biri iştirak edən tərəfin üzərinə köçürülür. Məsələn: H.Cavidin “Yoxmudur səndə, gülüm heç insaf?” misrasında sevgili gülə bəzədilmiş, lakin onun adı çəkilməmişdir. Bu misranı “Ey gül kimi gözəl və ətirli sevgilim, səndə heç insaf yoxmudur?” şəklində təşbehə çevirmək mümkündür. Bədii dildə insana, canlıya aid əlamətin təbiət üzərinə köçürülməsi yolu ilə yaranan metaforalar daha çoxdur.

**Metonomiya.** Ad dəyişmə mənasını bildirir. Nəzərdə tutulan bir söz əvəzinə, onunla bağlı olan başqa sözün, anlayışın işlədilməsinə deyilir. Məsələn: "Sabiri əzbər bilir" ifadəsində "Sabiri" sözü şairin əsərləri mənasında işlənmişdir. "Təbriz bizi yaxşı qarşıladı", "Sinif sakitdir" cümlələri də metonomiyaya nümunə ola bilər.

**Simvol.** Rəmz, gizli işarə mənasını bildirir. Simvolda fikir müəyyən işarə ilə və üstüörtülü şəkildə ifadə olunur. Məsələn: klassik ədəbiyyatda tülkü hiyləgərliyin, qurd acgözlüyün, şir igidliyin simvoludur. Eləcə də müasir ədəbiyyatda göyərçin sülhün, əmin – amanlığın simvoludur. Bədii ədəbiyyatda qılınc mübarizə simvolu kimi verilir. Məcazlar istər nəzmlə, istərsə də nəsrlə yazılan bütün bədii əsərlərdə işlənir.

**Sinekdoxa.** Metanimiyanın bir növü də sinekdoxadır. Sinekdoxada bir əlamət bütöv anlayışı, sözün bir hissəsini, tamı əvəz edir.

**Məsələn:** Q.Zakir şeirlərinin birində Şuşa polis rəisini "yarımsaqqal" adlandırır. S.Rəhimovun "Saçlı", "Qaloş" kimi obrazları sinekdoxa sayılır.

Metafora dilçilikdə geniş tədqiq edilmişdir. Bu sahədə tədqiqatlar antik dövrlərdən başlanmış və müasir dövrdə daha dərin öyrənilən problemlərdən biridir. Həm Azərbaycan, həm də ingilis dilçiliyində metaforaya dair bir sıra tədqiqatlar aparılıb.

İlkin mərhələdə metafora məcazlar sistemində öyrənilmiş, metanomiya və metafora olaraq iki növdə fərqləndirilmişdir.

Sözün ümumi mənası "semantik variant" adlandırılır. Müxtəlif mənalar məhz bu ümumi məna vasitəsilə bir-birinə bağlanır. Sözün ümumi mənası sözün nüvəsini təşkil edir.

Çoxmənalı sözlərin mənalarının bir qismi semantik assosiasiyalar (metafora, metonimiya, funksional köçürmə)əsasında meydana çıxmış olur. Bu halda «ümumi məna» və ya əsas məna ilə əlaqə qırılır. Məcazi mənalar ümumi mənanın semantik variantları kimi çıxış edə bilmir. Burada əsas məsələ sözün mənası və onun forması arasındakı əlaqə, bir sözün mənaca başqa sözlərlə bağlılığı, məna və məfhum arasındakı münasibətidir. Dildə işlədilən sözlər həm həqiqi, həm də məcazi mənada işlənə bilir. Bu iki məna arasında müəyyən əlaqənin mövcudluğuna görə söz özünün həqiqi mənasında, əsasən, məcazi mənada işlədilir, buradan da yeni məna çalarları yarada bilir. Sözlərin məcazi mənada işlədilməsinin bir şəkli də metaforadır (Mehdiyeva, 2022: 37).

Metafora insan tərəfindən yaradılır və bu zaman insanın şüurunda müxtəlif bilik sahələri arasındakı münasibət və əlaqələr qarşılaşdırılır, bir sferadan digərinə keçid yaradılır. Metafora modellərinin yaradılmasında iki qütbdən istifadə edilir. Bu qütblərdən birində duran semantik sahənin vahidi özünün ilkin, yəni metaforlaşmamış mənasında olur, digər qütbdə metaforlaşmış məna sahəsini təşkil edir. Məkan metafora məsələsinə üç istiqamətdə yanaşmaq olar. Birinci istiqamət məkan mənası olmayan sözlərin məcazlaşaraq yer bildirməsi, ikinci istiqamət məkan ifadə edən vahidlərin metaforlaşması yolu ilə məkan metaforalarının yaranması, üçüncü istiqamət məkan bildirən leksemin, vahidin məcazlaşaraq əvvəlki məkan mənasını itirməsidir.

Bildiyimiz kimi, əksər insanlara görə metafora şair, yazıçı, başqa sözlə, yaradıcı insanlar üçün bir vasitədir. Çox az insan bizim metaforik ifadələrdən gündəlik nitqimizdə istifadə etdiyimizdən xəbərdardır. Bu, hər kəsin bu haqda nə düşündüyü fikrindən daha çox asılıdır. Corc Lakof və Mark Conson 1980-cı ildə yazdıqları məşhur "Metaphors we live by" ("Yaşadığımız metaforalar") əsəri ilə metaforalara hər zaman hər yerdə işlənə bilməsini iddia edərək konseptual metafora nəzəriyyəsini ilk olaraq ortaya qoydular. Metaforaya koqnitiv yanaşmanı sərgiləyən həmin nəzəriyyəyə qədər metaforalara müxtəlif yanaşmalar olmuş, onlar haqqında xeyli yazılmış və ya deyilmiş fikirlər mövcud olmuşdur (Lakoff, Johnson, 1980).

Hər şeydən öncə, metaforalar haqqında bədii dilin ifadə vasitəsi olmaqla çoxlu təriflər vardır. Ən çox yayılan tərif belədir: metafora kimi, bənzər tipli müqayisə bildirən sözlərdən istifadə etmədən birbaşa müqayisə yolu ilə köçürmə deməkdir (Kovecses, 2010). Metafora haqqında ilk elmi fikir e.ə. IV əsrdə yaşamış qədim yunan filosofu və alimi Aristotelin "Poetika" əsərində qeyd olunmuşdur. Aristotel ilk dəfə olaraq metaforalara elmi şəkildə yanaşaraq onların ətraflı təsvirini vermişdir.O qeyd edirdi ki,metafora bir əşyaya başqa bir əşyanın malik olduğu adın verilməsindən ibarətdir ki, burada köçürmə ya cinsdən növlərə, yaxud növlərdən cinsə qədər, ya da ki növlərdən

növlərə qədər ola bilir, daha çox oxşarlıq zəminində qurulur (Kövecses, 2010). İngilis maarifçisi, ədəbi tənqidçisi İ.A.Riçardz daha da irəli getdi. O, dilə metaforalardan danışarkən bu gün də istifadə olunan bir terminologiya gətirdi. Onun fikrincə, metafora mövzu və vasitə adlanan iki termindən ibarətdir. İkincisi, məcazi mənada işlənən termindir və bu iki terminin təməl adlanan əlaqələri vardır.

Alman dilçisi H.Paul qeyd edir ki, metaforalar oxşarlıq və ya müqayisənin çox müxtəlif növlərinə əsaslana bilər, məsələn, forma oxşarlığına: head of a cabbage-kələmin başı, the teeth of a saw-mişarın dişi. Bu oxşarlıq funksiyaya əsaslana bilər. Köçürülmüş məna kontekstdən asanlıqla tanına bilir: the head of the school-məktəbin başçısı, the key to the mystery-sirrin açarı.

Oxşarlıq mövqe ilə də daşınıla bilər: foot of a page-səhifənin ayağı. Metaforik köçürmənin çoxsaylı halları zaman və məkan arasındakı oxşarlığa da əsaslana bilər: long distance-long speech-uzun məsafə-uzun çıxış, a short path-a short time-qısa cığır-qısa vaxt (Arnold, 1973: 131).

Dilçilikdə metaforaya həsr olunmuş tədqiqat işlərində C.Lakofun irəli sürdüyü koqnitivmetod geniş istifadə olunur. Bu metodda metaforanın yaranmasını ehtiva edən metaforlaşma və ya məcazlaşma koqnitiv mexanizm kimi götürülür və mexanizmdə iki bilik sisteminin qarşılıqlı təsiri əsasdır. Birinci struktur mənbədir, ikinci isə metaforlaşma məqsədini özündə birləşdirir.

Metaforlaşma prosesində yeni mənanın yaranması həmişə birbaşa inikasla getmir. Köçürmə dərhal baş vermir. Əşya,hadisə, predmetlər şüurda təsəvvür olunur,müqayisə və qiymətləndirmələr aparılır. Metaforanın əmələ gətirdiyi modellər mürəkkəb olduğuna görə, müqayisə vacib şərt kimi özünü göstərir.

«Linqvistikada metafora probleminə həm dərketmədə ifadənin yeni mənasını yaradan proses, çox zaman üslubi vasitə və ya bədii üsul,bəzi hallarda adlandırma vasitəsi,az hallarda isə gerçəkliyin hisslərlə birbaşa ifadəsi mümkün olmayan sahələrinin əks etdirilməsi üçün dildə olan mənaların koqnitiv manipulyasiyası ilə dünyanın dil mənzərəsini yaratmaq üsulu kimi baxılmışdır» (Teliya, 1988: 34).

Metafora kifayət qədər mürəkkəb və geniş yayılmış məcaz növüdür. Metaforik məna oxşarlığa görə adların köçürülməsi, digərinə aid edilməsi yolu ilə meydana çıxsa da, onun formalaşdırılması fərdi bənzətmə, subyektiv köçürmələrlə də gedir. Bu baxımdan insan- zaman modeli əsasında qeydə alınan metaforaların fərdi növləri və ya fərdi üsluba xas olanları çoxdur (Aristotel, 1982: 25).

A.N.Kojın yazır: "Bədii mətndə sözün estetik rolu məcaz vasitələri ilə təzahür edir. Metaforikləşmə ünsiyyətin müxtəlif sahələrində mühüm rol oynayır. Həmçinin o, nitq predmetinə bədiilik verərək, onun konkret, tipik əlamətlərinin ayrılmasına da kömək edir. Poetik nitqin strukturunda mövcud olan metaforikləşmə obrazın axtarışına, ekspressiv fonun gücləndirilməsinə, səciyyələndirilənlə predmetin məğzinə varmağa yönəldilir. Bu istiqamətdən yanaşma zamanı metaforanın bədii əsərin dilindəki vahidlərin təşkili ilə sıx bağlılığı üzə çıxır» (Kozhina, 1993: 27).

S.A.Çuqunova temporal metafora probleminə məkan və zamanın qarşılıqlı təsiri zəminində baxır. Dildəki temporallığı bir-biri ilə müqayisədə şərti olaraq üç yerə ayırmaq olar:

1) qrammatik zaman;
2) aspekt;
3) temporal hadisələrin bir-birinə və danışana nəzərən sıralanması (time sequencing).

The worst is behind us. Thursday is before Saturday.

Müəllifin fikrinə görə, zaman bir ölçüyə malik hərəkət edən mahiyyət kimi qavranılır. Onun istiqamətini ifadə etmək üçün simmetrik ox (right/left) əvəzinə, assimmetrik horizontal və vertikal oxlardan (front/back - before/after; up/down) istifadə olunur (Chugunov, 2014: 116).

Dildə metaforanın nominativ-funksional tipləri mövcuddur. Bu tiplər predmetli \ predmetsiz, deskriptiv\\qiymətləndirmə, neytrallıq\\ekspressivlik, obrazlılıq\\qeyri-obrazlılıq və s. qarşıdurmalarda üzə çıxır. Onların semantikası bu yaruslar üzrə müəyyənləşdirilir. Metafora tiplərinin sərhədləri dəqiqləşdirilir. Həmin tiplər aşağıdakılardır: identik metaforalar, predikativ metaforalar, obraz-estetik metaforalar, qiymətləndirici-estetik metaforalar, emotiv metaforalar.

Metaforanın semantikası abstrakt mənaya daha çox yaxınlaşır. Abstarkt mənalar insanın emprik sahədəki fəaliyyəti ilə əlaqədardır. Bu bağlılıq müxtəlif tip metaforaların əmələ gəlməsini şərtləndirir:

Poetik və ya obraz-estetik metaforlarda psixoloji gərginlik hakimdir. Burada semantik sintez ikiplanlıdır. Həmin metaforalar qeyri-real həyatı təsvir edir. Obrazlı metaforalar üslubiyyat elmində nəzərdən keçirilir. Bunlar mətndə ekspressiv effekt yaradır. Obrazlı metaforalar bədii metaforlarla üzə çıxır.

Metaforikləşmə prosesində metaforik obrazlar yaranır. Bədii əsərdə metaforik obrazlar özü-özlüyündə çıxış etmir, onlar bədii obrazlarla sıx əlaqədə meydana gəlir. Əsər bədii obrazlar sistemində cəmləşir. Əsərin bədii sistemini orada yaradılan obrazlar və həmçinin bütövlükdə müəllif fikri ilə əsərin məzmunu qarşılıqlı münasibət təşkil edir. Obrazların arasındakı əlaqələr horizontal (xətti, sintaqmatik) və vertikal (iki tərəfi açıq, paradiqmatik) ola bilər.

Metaforik sıra üzvlərinin arasındakı fərqlər aşağıdakı tip əlaqələrdə müşahidə oluna bilər:

- metaforizə olunan obrazların birliyi yox, oxşarlıq zamanı;
- metaforizə olunan predmeti bilavasitə təyin edən linqvistik vasitələrinin (sinonim, parafraz və s.) seçimi;
- metaforikləşən əşya ilə bilavasitə mənaca bağlı olmayan komponentlərin əvəz edilməsi;
- metaforikləşən obrazın digər metaforikləşən obrazlara daşınması.

Metaforaları anlamadan məlumatı verən və qəbul edən müxtəlif əqli proseslərdə eyni cür düşünə bilməz. Söz bir forma kimi istər-istəməz öz referentini ifadə edir, bu da metaforanın əsasını təşkil edir. Əslində bütün sözlər metafora əlamətinə malikdir.

Konseptual metafora qloballaşan dünyada bəşəri xüsusiyyət qazanır. Amma buna baxmayaraq, müxtəlifsistemli dillərdə onların təzahürü fərqlidir. Nəticədə konseptual metaforalar müəyyən mədəniyyətin, eləcə də sosial qrupların məhsuluna, onun ayrılmaz hissəsinə və beləliklə, onların dərketmə vasitəsinə çevrilir.

Konseptual metafora müəyyən məqsədə çatmaq və onu həyata keçirmək üçün qarşılıqlı təsirdə olan tərəflər arasında əlaqələndirici amildir.

Arqotik metaforalar-metafora formalarından biri də arqotik metaforalardır. Arqo adı altında tədqiqatçılar sözyaradıcılığı sistemini, sözün törəmə sistemini, mətn və ifadə, qısa danışıq, poetik incəsənət və s. kimi məsələləri nəzərdə tuturlar. Arqo yalnız linqvistik hadisə deyil, eyni zamanda sosial hadisədir, dil və mədəniyyət arası əlaqədir. Arqo bağlı bir sistemdir. Arqo familyar nitqin forması kimi də çıxış edir. Arqo həmçinin ekspressiv və qənaət prinsipini həyata keçirən bir dil hadisəsi kimi də özünü göstərir. Metaforik və sinonimik keçidlər arqo leksikasında da baş verir. Arqolar dildə fonetik-morfoloji və semantik üsullarla formalaşır. Arqoların böyük ekspressiv potensiyası mövcuddur. Arqotik metaforalar danışıq nitqinin orijinal formalarıdır. Söz və ifadə yaradıcılığını obrazlı olaraq təşkil edir. Arqotik metaforalar ekssentrik həyatı əks etdirir.

Dünyanın metaforik obrazlarını yaradır. Xeyli sayda arqotik metaforalar mənfi çalarlarda istifadə olunur.

Arqotik metaforalar ekspressiv leksikadır, gizli şəkildə sözlərin formalarını deformasiyaya uqradır. Arqotik metaforalara məna dəyişmələri, fikri tez başa düşmək kimi anlayışlar xasdır.

Metafora müxtəlif tip diskursların (poetik diskurs, elmi diskurs, siyasi diskurs və s.) təşkilində mühüm rola malikdir. Mənanın semantik cəhəti adlandırması ilə sıx bağlıdır. Semantik işarənin denotatla əlaqəsini, sözün əşyavi məzmununu əks etdirir. Məna dildə danışanların fəaliyyətinin məzmunu ilə əlaqələndirilməlidir. Müəyyən əşya və ya hadisəni adlandıranda məntiqi təfəkkür qanunlarına deyil,kompleks təfəkkür qanunlarına istinad olunur. Ona görə də assosiasiya, bənzərlik və yaxınlıq əsasında məna köçürmələri yaranır.

Metafora harada istifadə olunur, olunsun, o həmişə insan hərəkətini, fəaliyyətini, biliklərini, dilini başa düşməyi zənginləşdirir. Metaforanın hər yerdə işlənməsi onun müxtəlif diskurslara aidliyini təsdiq edən əsas amildir. Məhz bu cəhət metafora və metaforlaşmanın diskurs planında öyrənilməsini aktuallaşdırmışdır.

## Nəticə

Metafor qüvvətli bədii təsvir vasitəsidir, geniş üslubi imkanlara malikdir. Əsas funksiyası obyektlər arasında oxşarlıq və əlaqə yaratmaqla hansısa yeni məvhumu formalaşdırmaqdır. Metaforlar birbaşa və ya dolayı yolla real dünya ilə əlaqələndirilir. Metaforlar real proseslər və dəyişikliklərlə əlaqədar olaraq yeni anlayışlar yaradır.Bu dəyişikliklər hərəkətlərimizi və cavablarımızı formalaşdıraraq qavrayışımızın əhatə dairəsinə təsir edə bilər.

Metafora insan tərəfindən yaradılır və bu zaman insanın şüurunda müxtəlif bilik sahələri arasındakı münasibət və əlaqələr qarşılaşdırılır, bir sferadan digərinə keçid yaradılır.

Metafora modellərinin yaradılmasında iki qütbdən istifadə olunur. Bu qütblərdən birində duran semantik sahənin vahidi özünün ilkin, yəni metaforlaşmış mənasında olur, digər qütbdə metaforlaşmış məna sahəsini təşkil edir.

Məlumdur ki, insan fəaliyyətinin ən vacib elementlərindən, ən dəyərli məhsullarından biri nitqdir. Məhz nitq diskurs təhlili, konversiya (termin bəzən konversasion kimi də işlədilir) təhlili, nitqin daxilində inkişaf edən dialoq təhlili adlandırılan yeni elmi istiqamətlərin obyekti olmuşdur.

Müasir dövr dilçiliyində «diskurs» anlayışı geniş istifadə olunur. Bununla belə, diskurs anlayışının təyin edilməsi ilə bağlı elmi mübahisələr hələ də davam edir. Fransız dilindən alınma termin olan diskurs (discours - nitq) müxtəlif elm sahələrində işlənir. Bu termin mətn dilçiliyində də geniş istifadə olunur. Termin fərqli şəkildə izah olunur. Kommunikativ təsir nitq və yazı formasında olub verbal və qeyri-verbal tərkib elementlərini özündə birləşdirə bilər. Kommunikativ fəaliyyətin bitmiş və ya davam edən məhsulu olan diskurs həmin kommunikativ prosesin yazı və ya nitq formasnda ifadəsinin nəticəsidir. Diskurs kommunikativ fəaliyyətin yazılı və ya şifahi formada olan verbal məhsuludur.

Metaforikləşmə - semantik motivləşmə yolu ilə metaforlaşma hadisəsinin tarixi qədim olub, bədii düşüncənin yarandığı dövrdən üzü bəri inkişaf etməkdədir. Məna keçidləri prosesi adətən «metaforikləşmə» yaxud «semantik motivləşmə»terminoloji vahidləri ilə adlandırılır. N.A.Kupina yazır ki, semantik motivləşmə - dörd mərhələli bir metaforikləşmə prosesidir. Bu mərhələnin sonu sözün motivləşməsi ilə başa çatır.

Məqsədindən və vəziyyətindən asılı olaraq gündəlik həyatımızda metaforlardan istifadə edilir. Metaforlar nitqimizin zənginləşməsində mühüm rola malikdirlər. Metaforlar həm təklikdə, həm də cümlə daxilində istifadə olunur.

## Ədəbiyyat

1. Aristotel, S. (1982). 4-kh.t.T.IV. Moskva: Mysl, 554 s.
2. Nitsshef. (1990). Po tu storonu dobra i zla. Kniga 2.Sirin, 390 s.
3. Blek, M. (1990). Metafora. Teoriya metafory. Moskva Progress, 156 s.
4. Mehdiyeva, A. (2022). Metaforun tədqiqinin əsas istiqamətləri. Elmi xəbərlər. Humanitar elmlər seriyası, №1.
5. Lakoff, G., Johnson, M. (1980). Metaphors We Live By, The University of Chicago Press.
6. Kövecses, Z. (2010). Metaphor. Oxford University Press.
7. Arnold, I.V. (1973). Leksikologiya sovremennogo angliyskogo yazyka. Moskva.
8. Teliya, V.N. (1988). Metafora kak model' smysloproizvodstva i yeye ekspresivno-otsenochnaya funkchiya. Rol chelovecheskogo faktora v yazyke.YAzyk i kartina mira. M, Nauka.
9. Aristotel, S. (1982). 4-kh.t.T.IV. Moskva: Mysl, 554 s.
10. Kozhina, M.N. (1993). Stilistika russkogo yazyka.Tekst. M.N.Kozhina Prosveshcheniye.
11. Chugunov, A.A. (2014). Russkoyazychnyy i angloyazychnyy finansovyy diskurs: metafory kak sredstvo emotsional'nogo vozdeystviya na retsipiyenta. Vestnik. Moskva, № 3.
12. Hoffman, R. (1980). Cognition and Figurative Language. London.

Göndərilib: 03.08.2023 Qəbul edilib: 17.10.2023

DOI: https://doi.org/10.36719/2663-4619/96/113-118

**Lalə Məmmədova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
lale_memmedova95@bk.ru

# İNKLÜZİV TƏHSİLDƏ UŞAQYÖNÜMLÜ TƏLİM MÜHİTİNİN XÜSUSİYYƏTLƏRİ

**Xülasə**

İnklüziv təhsilin əsas məqsədini xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün maneəsiz təlim mühitinin yaradılması və onların psixoloji hazırlığının təmin olunması təşkil edir. İnklüziv təhsil alan uşaqların öz yaşıdları olan sağlam uşaqlarla bir yerdə təhsil alması onların hərtərəfli inkişafına səbəb olur. Müəllimlər inklüziv təhsilə şagirdlərin cəlb olunmasını asanlaşdırmaq üçün mədəni mühit və şagirdlər ilə məktəb arasında aydın əlaqələri təmin etməyi də planlaşdırmalıdır. Müəllimlər bütün uşaqların iştirakını və birlikdə öyrənməni təmin etmək üçün müxtəlif təlim yanaşmalarından istifadə edərək təlimin çoxsaylı üsullarını asanlaşdırmalıdır. İstisnasız bütün uşaqlar öyrənə bilərlər. Müəllimin istifadə etdiyi metod və üsullar dərsin məqsədinin həyata keçirilməsi üçün bir vasitədir. Onları bacarıqla seçmək və istifadə etmək lazımdır. Metod və üsulları elə tətbiq etmək lazımdır ki, iş zamanı şagirdlərin fəaliyyət növləri dəyişsin.

***Açar sözlər:*** *inklüziv, uşaqyönümlü, təlim, tərbiyə, təhsil*

**Lala Mammadova**
Azerbaijan State Pedagogical University
lale_memmedova95@bk.ru

## Characteristics of a child-centered learning environment in inclusive education

**Abstract**

The main goal of inclusive education is to create a barrier-free learning environment for children with special needs and ensure their psychological preparation. The fact that children receiving inclusive education study together with healthy children of their age leads to their comprehensive development. Teachers should also plan to ensure clear connections between the cultural environment and the students and the school to facilitate the involvement of students in inclusive education. Teachers should facilitate multiple methods of instruction, using a variety of instructional approaches to ensure that all children participate and learn together. All children can learn without exception. The methods and techniques used by the teacher are a means to realize the purpose of the lesson. You need to choose and use them skillfully. It is necessary to apply methods and ways in such a form that the types of activities of students be able to change during work.

***Keywords:*** *inclusive, child-oriented, training, upbringing, education*

## Giriş

İnklüziv təhsilin əsas məqsədini xüsusi qayğıya ehtiyacı olan uşaqlar üçün maneəsiz təlim mühitinin yaradılması və onların psixoloji hazırlığının təmin olunması təşkil edir. İnklüziv təhsil alan uşaqların öz yaşıdları olan sağlam uşaqlarla bir yerdə təhsil alması onların hərtərəfli inkişafına səbəb olur. Bu prosesdə müəllimlər fərqli bilik, bacarıq, maraq və öyrənmə ehtiyacları olan uşaqlar ilə işləyirlər. Əlilliyi olan uşaqlar üçün xüsusi təlim üsulu olmadığından inklüziv mühitdə müəllimlər bütün uşaqların ehtiyaclarını qarşılamaq üçün uşaqyönümlü pedaqogikadan istifadə edirlər. Daha ənənəvi mühitdə və ya müəllimyönümlü pedaqogikada müəllim stolları sıra və cərgə ilə düzür, bütün sinfin qarşısında durur, şagirdlərə bütün bilikləri hazır verir və şagirdlərə onların cavablarının doğru və ya yanlış olduğunu deyir. Qeyd olunanlar "yaxşı" müəllimin xüsusiyyətləridir. Uşaqyönümlü yanaşmada isə səmərəlilik üçün vacib şərt müəllimin davranışıdır (Qasımov, Kərimova, 2004: 14). Müəllim dərs zamanı vəziyyətdən asılı olaraq sinfin müvafiq

yerlərində durur, sinifdəki resurslardan istifadə edir, uşaqlar ilə ünsiyyət qurur və uşaqların öyrəndikləri bilikləri qiymətləndirir.

Müəllimlər tərəfindən dərsi planlaşdıraraq şagirdlərin maraqları, güclü tərəfləri, ehtiyacları və dərsin məzmununu nəzərə alıb dəyişikliklər edərək yanaşması üçün ideal formadır. Müəllimlər bir sıra şagirdləri və öyrənmə tərzlərinin müxtəlifliyini nəzərə alaraq dərsi planlaşdırmalıdır. Bu təcrübə əlilliyi olan şagirdlər üçün müvafiq olan və bütün şagirdlərin ehtiyaclarını təmin edən dərsləri inkişaf etdirir. Müəllimlər inklüziv təhsilə şagirdlərin cəlb olunmasını asanlaşdırmaq üçün mədəni mühit və şagirdlər ilə məktəb arasında aydın əlaqələri təmin etməyi də planlaşdırmalıdır. UNESCO inklüziv siniflərdə dərs planlaşmasında aşağıdakı yeni təhsil proqramı (kurikulum) üçbucağını tövsiyə edir:

*Məzmun* – yeni təhsil proqramında (kurikulum) müəyyənləşdirilmiş mövzuya uyğunlaşdırılır. Mövzu uşaqlara aydın olmalıdır.

*Proses* – məzmunun necə öyrədilməsidir. Müxtəlif öyrənmə ehtiyaclarını qarşılamaq üçün müxtəlif təlim üsullarından istifadə olunur.

*Mühit* – fiziki (əşyavi) mühit, öyrənmə mühiti və psixi-sosial mühit daxildir (Rəfiyeva, Məmmədova, Abbasova, Yusifova, 2020: 32).

Düzgün qurulmayan təhsil mühiti xüsusi qayğıya ehtiyacı olan uşağın vəziyyətinin ağırlaşmasına gətirib çıxara bilər. İnklüziv təhsil komponentli qruplarda təhsilalanlarda aşağıdakı keyfiyyətlərin inkişaf etdirilməsinə xüsusi fikir verilməlidir:

• Emosional sahənin inkişafı;
• Koqnitiv sahənin inkişafı;
• Stressə qarşı dözümlülüyün inkişafı;
• Özünə inamın inkişafı;
• Real aləmə pozitiv münasibət və başqalarını qəbul etmə bacarıqlarının inkişafı;
• Müstəqilliyin inkişafı;
• Özünü müəyyənləşdirmə, özünü inkişaf etdirmə və həvəsləndirmənin inkişafı (Hüseynova, Rüstəmova, 2006: 116).

Tədqiqatlar göstərir ki, zəruri dəstək verilməklə xüsusi qayğıya ehtiyacı olan məktəbəqədər yaşlı uşaqlar adi qruplara daxil edildikdə tədris-təlim prosesində kollektivi hiss edir və kollektivə mənsub olma hissini keçirdikləri üçün onlara pozitiv münasibətdə çoxlu imkanlara malik olurlar.

Tərbiyəçi-müəllimi təlim prosesini qurarkən aşağıdakıları nəzərə almalıdır:

1. Uşaqlara müxtəlif tapşırıqlar verməklə, xüsusi təlimə ehtiyacı olan uşaqları da eyni fəaliyyət növlərinə daxil etmək;
2. Tapşırıqları qrupla birlikdə yerinə yetirmək;
3. Kollektivdə iştirakın digər strateji yollarından - oyun, çöl tədqiqatlarından və s. istifadə etmək (4).

Dərslər şagirdlərin fərdi xüsusiyyətlərinə uyğun planlaşdırılır. Dərsin əvvəlində problematik situasiya yaradılır. Dərsin uyğun hissələrində SİM olan uşaqlara yeni mövzu fərdi izah oluna bilər. Yük dərsin ortasına doğru tədricən artırılır. Növbəti mərhələdə şagirdlərin imkanlarına uyğun müxtəlif növ çalışmalar növbə ilə bir-birini əvəzləyir. Dərs elə qurulmalıdır ki, sinifdə öyrənmə, müzakirə, düşünmə və fəaliyyət üçün müvafiq qüvvə və zaman sərf edilmiş olsun. Müəllimlər təlim mühitində qoyulan hədəflərə nail olmalarına əmin olmalıdırlar. Təlim mühitində çoxsaylı yerlərdə təlim hədəfi aydın qeyd olunmalıdır. Məsələn, şifahi şəkildə hədəfi bildirə, yaza, qrup şəklində müzakirə edə və bütün məlumat xarakterli materiallarda vurğuaya bilərsiniz. Mühitdə hədəflərin əlçatan olması şagirdlərin tez-tez hədəfə istinad etmələrini və məqsədyönlü şəkildə bu istiqamətdə çalışma ehtimalını artırır. İnklüziv sinifdə dərsin gedişatını aşağıdakı kimi qeyd edə bilərik:

- Yeni materialın mərhələli izahı;
- Tapşırıq təlimatının şagird tərəfindən təkrarlanması;
- Təlimin audio-vizual təminatı (Zamskiy, 2008: 136).

Dərs aydın alqoritmə malik olmalıdır. Müəyyən alqoritmə vərdiş edən şagirdlər daha intizamlı olur. Dərs bir-biri ilə metodik şəkildə bağlı olan üç hissəyə ayrılır:

***1.Giriş hissə*** düşünməyə yönəltmə mərhələsi ilə başlayır. Bu mərhələnin əhəmiyyəti ondan ibarətdir ki, şagirdlər fəallaşır, hamı aktiv iştirak edir. Proqramda göstərilmiş mövzu əsasında dərs başlayır. Motivasiya illüstrasiyalar, şəkillər, sxemlər, rəmzlər əsasında təşkil olunur və tədqiqat sualının qoyuluşu ilə tamamlanır. SİM olan şagirdlərin qavrama və anlama xüsusiyyətləri nəzərə alınaraq tədqiqat sualının alternativ variantı hazırlanır.

***2.Əsas hissə*** dərketmə mərhələsi ilə davam edir. Bu zaman şagirdlər yeni materialın mahiyyətini dərk etməyə yönəlirlər. Bu mərhələdə yeni biliklə əvvəlki bilik arasında əlaqə yaradılır. Müstəqil öyrənmə prosesi müəllimin izahı, şagirdlərin dərslik və ya mənbələrlə işi əsasında qurulur. Müxtəlif iş formalarından istifadə olunaraq konkret tapşırıqlar verilir. Təqdimatlardan sonra ümumi diskussiya aparılır. SİM olan uşaqlar üçün mahiyyətcə eyni, lakin sadələşdirilmiş tapşırıqlar verilir. SİM olan uşağın xüsusiyyətləri nəzərə alınaraq təqdimatları ümumi siniflə və ya fərdi dinlənilir. SİM olan şagirdlərlə iş zamanı müxtəlif fəaliyyətlər bir-birini əvəzləyir. Müəllim öz nitqi ilə prosesi istiqamətləndirir, lakin nitqlə çatdırılan informasiya minimum həddə olur.

***3.Yekun hissə*** - düşünmə mərhələsidir. Bu zaman şagirdlər rast gəldikləri fakt və hadisələri yada salır, suallar verir, müşahidə və fikir mübadiləsini aparır, həmin fikri daha geniş şəkildə mənimsəməyə çalışır. Biliklər yaddaşda möhkəmlənir. Bir və ya iki şagird tapşırığı sinif qarşısında təqdim edir. Sonra SİM olan şagirdlər yeni mövzu ilə bağlı fərdi tapşırıqlar yerinə yetirir, bu zaman müəllim digər şagirdlərin tapşırıqlarını yoxlayır (6).

Uşaqyönümlü təlim mühitinin əsas xüsusiyyətləri aşağıdakılardır:

**1)Faydalı təlim imkanları:** Şagirdlər dərslərin və məktəb fəaliyyətlərinin məqsədlərini başa düşdükdə daha çox motivasiya olurlar. Uşaqların gündəlik həyatları ilə bağlı nəyi və necə öyrənməni əlaqələndirmək mütləqdir. Bu, yalnız müəllimlər şagirdləri ilə əlaqə qurarsa, onlar üçün nəyin mühüm olduğunu və uşaqların bir-biri və həmçinin müəllimi ilə mübadilə etməsi üçün təhlükəsiz hiss edəcəyi rahat bir atmosfer yaranarsa, mümkün ola billər. Bu cür əlaqənin yaradılmasına dair bəzi fikirlərə daxildir (Qasımov, Talıbov, 2000: 46).

➢Dərsin şagirdlərin əvvəlki bilik və bacarıqlarına əsasən qurulması. Müəllimlər şagirdləri çox yaxşı tanımalı və onların dərsdə fəal iştirakı və öz biliklərini nümayiş etdirmələri üçün imkan yaratmalıdır.

➢Yeni anlayışları izah edərkən uşaqların gündəlik təcrübələrindən istifadə etmək. Bu, uşaqlar üçün dərsin müvafiqliyini artıracaq. Şagirdləri evdən əşyalar gətirməyə, öz hekayə və təcrübələrini paylaşmağa ruhlandırmaq olar. Həmçinin, müəllim şagirdlərinin yaşam şərtlərindən və mədəniyyətindən xəbərdar olmalıdır.

➢Gündəlik situasiyalarda öyrəndiklərini təcrübə etmək üçün uşaqlara imkan yaratmaqla təlimi məqsədyönlü edin.

➢Uşaqların bir fəndə öyrəndiklərinin digər fəndə qazandıqları bilik ilə əlaqələndirilməsi. Əksər fənlər bir-biri ilə əlaqəlidir və bu əlaqəni göstərmək zəruridir.

**2)Çoxsaylı təlim üsulları (Uşaqların müxtəlif yollarla öyrənməsi):** Uşaqlar müxtəlif yollarla öyrənirlər. Əksər uşaqlar öyrənmə prosesində öyrənmə üçün olan fərqli yolların hamısından istifadə edir. Müəllimlər bütün uşaqların iştirakını və birlikdə öyrənməni təmin etmək üçün müxtəlif təlim yanaşmalarından istifadə edərək təlimin çoxsaylı üsullarını asanlaşdırmalıdır. Uşaqyönümlü pedaqogikada müəllimlər düşünən təcrübəçilərə çevrilirlər. Onlar daim düşünməyə sövq edilirlər:

- Onların sinifindəki uşaqlar ilə ən rahat təlim üsulu hansıdır?
- Niyə bəzi uşaqlar təlimdə başqaları kimi eyni sürətlə irəliləmir?
- Bütün uşaqların öyrənmə və nailiyyət qazanmasını təmin etmək üçün istifadə olunan strategiya və üsullar hansılardır?
- Strategiya və üsulların hamı üçün əlyetərliliyini təmin etmək üçün resurslar, fəaliyyətlər və ya yanaşmalar necə tənzimlənməlidir?
- Uşaqların motivasiyası necə yüksəldilməli və təlimə cəlb olunmalıdır?

Uşaqların öyrənmə metodlarını bilmək üçün müşahidə və təhlil zəruridir. Eyni kurikulum məzmununun təlimi üçün müxtəlif üsul və strategiyalardan istifadə edilməli və fəaliyyətlərin hamı üçün mənimsənilən olmasını təmin etmək məqsədilə tənzimləmələr edilməlidir.

**3) Birgə öyrənmə:** Birgə öyrənmə daxilində şagirdlər ümumi hədəflər naminə çalışmaqla məsuliyyəti və resursları bölüşürlər. Birgə qrup işinin uşaqların əsas anlayışları yaxşı qavramasına, həmçinin işə və bir-birinə qarşı müsbət münasibətlərin qurulmasına güclü müsbət təsiri ola bilər. Yaxşı tətbiq edildiyində qrup işi müəllimlərə fərdi və kiçik qruplar ilə daha çox vaxt keçirməyə imkan verir. Birgə öyrənmə və qrup işinə dair müxtəlif yanaşmalar var. Uşaqları necə qruplara bölməyi təyin etmək müəllimlər üçün mühümdür. Müxtəlif təməl biliklərə malik uşaqlardan ibarət qrup yaratmaq hər kəs üçün daha öyrədici imkanlar təmin edir. Uşaqların hər biri müəyyən bir vəzifəni icra edə bilər. Vəzifələrin dəyişməsini, məsələn, hər kəsin növbə ilə qrup rəhbəri olmasını təmin edin. Həmçinin qrup işində əlilliyi olan uşaqların dəyərli və həlledici vəzifə almaları mühümdür. Adətən qrup işinə başlamazdan öncə təməl qaydaların qoyulması zəruri ola bilər. Qrup işinin faydalı olması üçün qrupda elə şərait yaradılmalıdır ki, uşaqlar fərdi şəkildə tapşırıqları tamamlamasınlar və ehtiyac olduqda digərinə kömək etsinlər. Ən maraqlı təlim təcrübələri uşaqlar bir-birilərindən asılı olduqları və tapşırığı tamamlamaq üçün əməkdaşlıq etməli olduqları an alınır. Qrup işi daxilində bir-birindən asıllığın müxtəlif formalarına aiddir:

- **Hədəf asıllığı:** qrupun tək bir hədəfi var;
- **Mükafat asıllığı:** hər bir uşağın müxtəlif resursları var (materiallar və bilik) və tapşırığı tamamlamaq üçün onlar birləşdirilməlidir;
- **Vəzifə asıllığı:** tapşırığın tamamlanması üçün hər uşağın müxtəlif vəzifələri var (vaxta nəzarət edən, hesabat verən və s.) (Ağayeva, 1999: 67).

**4) Cəlbedici və əlçatan təlim məkanları:** Sinif və məktəbin mühiti uşaqyönümlü təlim və tədrisi dəstəkləyə bilər. Uşaqyönümlü təlim məkanları bütün uşaqlar üçün nəzərdə tutulmalı, hər kəs üçün təhlükəsiz və hər şagirdin bərabər iştirakı və özünü kəşf etməsinə yönəlik olmalıdır. Hər kəs üçün cəlbedici və əlçatan təlim məkanları yaratmaq zəruridir, amma bu son hədəf deyil, əsas məqsəd: keyfiyyətli təhsil almaq bütün uşaqların hüququdur – bu hüququn dəyərləndirildiyi və həmin hüquqa əsaslanan uşaqyönlü təlim yanaşmasının həyata keçirilməsidir (9).

Uşaqyönümlü təlim məkanlarının bəzi xüsusiyyətlərini qeyd etmək olar: *Fiziki məkan:* bütün uşaqların sinif və məktəb daxilində, ətrafda sərbəst hərəkət edə bilmələri, fərdi və qrup şəklində işləmələri və lazım olduqda öyrənmə vasitələrinə yanaşmalarını təmin edin.

*Öyrənmə guşələri:* uşaqların müstəqil və ya qrup şəklində öz iradələri ilə öyrənmək üçün sinifinizdə müxtəlif öyrənmə guşələri qurun. Hər bir guşədə resurslar və təlimatlar təqdim edilir. Həmin guşələr şagirdlərə əvvəl öyrəndiklərini zənginləşdirmək, yeni bacarıqlarını təcrübə etmək və yeni anlayışları kəşf etmək üçün şans verir. Şagirdlər öyrənmə guşələrinin planlaşdırılmasında, təşkilində və idarəsində iştirak edə bilər.

*Təqdimat yeri:* sinifinizdə bütün uşaqların işlərini nümayiş etdirə biləcəyiniz və fəaliyyətləri haqqında rəy verə biləcəyiniz təqdimat lövhəsi hazırlayın. Təqdimat lövhəsini tez-tez dəyişin və onu tədris vasitəsi kimi istifadə edin.

*Sinif kitabxanası:* kitablar çox səmərəli tədris vasitələridir və kitablar yeni anlayışları öyrənməyə, dillərini inkişaf etdirməyə və məlumatı başa düşməkdə uşaqlara kömək edir. Kitablar və ya uşaqların özlərinin hazırladıqları kitablar da bahalı uşaq kitabları kimi səmərəli ola bilər (Ağayeva, Əliyeva, 1999: 120).

Müəlimlər valideynləri inklüziv təlim proqramına və uşaqla bağçada və ya məktəbdə həyata keçirilən işin davamı olaraq evdə iş prosesinə cəlb edə bilərlər. Uşaq ailədə həm fiziki, həm də sosial cəhətdən inkişaf edir. Ailə, uşağın təliminə və inkişafına cəlb olunan ilk müdafiə mühitidir.

İnklüziv komponentli qruplarda çalışan müəllim və müəllim köməkçiləri mütləq ailələrlə işləmə vərdişlərinə malik olmalıdır. Valideynlər ailədə olan sosial-emosional vəziyyəti normallaşdırmaqla müəllimin və psixoloqun işinə kömək göstərmiş olur. Əməkdaşlıq zamanı müəllimin xüsusi bacarığı olmalı, o, valideynlə əks əlaqə yarada bilməlidir. Nəticədə valideyn ailədə problemin həllinin qeyri-mümkünlüyünün səbəbini başa düşür, müəllimin köməyini qəbul etməyə hazır olur. Ailələrlə əməkdaşlıq bir neçə formada (konsilium, məsləhət, fərdi tədris planı ilə bağlı iclaslar və s.) həyata keçirilir (Qasımov, 1999: 56).

Səmərəli təlim bütün uşaqlar üçün əhəmiyyətlidir, lakin inkişafında müəyyən problemləri olan bir çox uşaqların qrup məşğələlərində tam iştirak etməklə öz potensiallarını realizə edə bilmələri üçün xüsusi dərslərə ehtiyacları olur. Müəllim hər bir uşağın təlim prosesinə cəlb olunmasını təmin etməlidir. Müvəffəqiyyət əldə etmək üçün onlar uşaqların inkişafı, maraqları və digər fərdi xüsusiyyətləri ilə bağlı ehtiyaclarını nəzərə almaqla təlimdə uyğunlaşdırma (akkomadasiya) və dəyişiklikləri (modifikasiyaları) həyata keçirməlidirlər.

## Nəticə

“İnklüziv təhsil üzrə müəllim inkişafı proqramları”nda əlilliyi və ya digər öyrənmə çətinliyi olan uşaqların ümumi siniflərə daxil edilməsi prosesini tənzimləmək üçün “Uşaq və ailə dəstək planlarını” təqdim edilir. Dəstək planları uşaqlar, onların ailələri, xüsusi profilli pedaqoqlar və ya terapevtlərə uşaqların maraqları, güclü tərəfləri və ehtiyacları, müvafiq təlim hədəfləri, bu hədəflərə nail olmaq üçün strategiyalar və mövcud resursların uyğunlaşdırılması barədə birlikdə düşünmək imkanı verir. Valideynlər ailədə olan sosial-emosional vəziyyəti normallaşdırmaqla müəllimin və psixoloqun işinə kömək göstərmiş olur. Əməkdaşlıq zamanı müəllimin xüsusi bacarığı olmalı, o, valideynlə əks əlaqə yarada bilməlidir. Nəticədə valideyn ailədə problemin həllinin qeyri-mümkünlüyünün səbəbini başa düşür, müəllimin köməyini qəbul etməyə hazır olur. Ailələrlə əməkdaşlıq bir neçə formada (konsilium, məsləhət, fərdi tədris planı ilə bağlı iclaslar və s.) həyata keçirilir (Andreyeva, 2005: 146).

Uşağın yaxınlıqda yerləşən məktəbə cəlb edilməsi işində uşaqlar və onların ailələri, ümumi profilli müəllimlər, məktəb rəhbərliyi, xüsusi profilli pedaqoqlar, ictimai könüllülər, tibb işçiləri, eləcə də, psixoloqlar, loqopedlər iştirak edə bilər.

Uşaqlar müxtəlif mərhələlər və yollarla öyrənir. Məhz bu səbəbdən də təlim hədəflərini bütün uşaqlara əlçatan etmək üçün onları fərqləndirmək lazım gəlir. Gündəlik aparılan qiymətləndirmə məlumatları bizə hansı uşaqların hansı diferensial təlim hədəflərinə ehtiyac duyması barədə lazımi dəyərləri təmin edəcək. Bu cür diferensial təlim hədəfləri bizə inklüziv dərslərin planını hazırlamaqda kömək edəcək.

İstisnasız bütün uşaqlar öyrənə bilərlər. Həyatlarının müxtəlif mərhələlərində öyrənmə fərqli ola bilər. Bəzi uşaqlar müəllimə qulaq asmaqla, digərləri isə vizual vəsaitlərdən və ya qrup müzakirələrindən istifadə edərək öyrənir**.** Müəllimin istifadə etdiyi metod və üsullar dərsin məqsədinin həyata keçirilməsi üçün bir vasitədir. Onları bacarıqla seçmək və istifadə etmək lazımdır. Metod və üsulları elə tətbiq etmək lazımdır ki, iş zamanı şagirdlərin fəaliyyət növləri dəyişsin. Mənimsəmə prosesində mümkün qədər çox analizatorun (eşitmə, görmə, lamisə), motorika, yaddaş, məntiqi təfəkkür və s. fəaliyyəti təmin olunsun. Əlbəttə, SİM olan uşaqlarla iş zamanı onların psixoloji xüsusiyyətləri də nəzərə alınmalıdır.

## Ədəbiyyat


1. Qasımov, S.Ə., Kərimova, E.M. (2004). Əqli və fiziki inkişafı ləngiyən uşaqların diaqnostikası və korreksiyası. Bakı, 79 s.
2. Rəfiyeva, L., Məmmədova, M., Abbasova, S., Yusifova, E. (2020). İnklüziv təhsilə cəlb olunan uşaqlarla işin aparılması. Bakı, 64 s.
3. Hüseynova, N.T., Rüstəmova, L.H. (2006). “Xüsusi pedaqogika”. Bakı, 219 s.
4. “İnklüziv sinifdə təlimin təşkili” mövzusunda ixtisasartırma proqramının Oxu materialı. (2019). Avropa İttifaqı, Azərbaycan Təhsil Nazirliyi, UNİCEF. Regional İnkişaf İctimai Birliyi. Bakı, 78 s.
5. Zamskiy, X.S. (2008). Umstvenno otstalyye deti. Istoriya ikh izucheniya, vospitaniya i obucheniya s drevnikh vremen do serediny XX veka. M., 216 s.
6. İnklüziv siniflərdə təlimin təşkili. TİPİİ. (2018). Oxu materialı. Bakı, 68 s.
7. Qasımov, S.Ə, Talıbov, Y. (2000). Anomal uşaqların əlahiddə pedaqogikanın əsasları. Bakı, 246 s.

8. Ağayeva, T.H. (1999). "Ümumtəhsil məktəblərində loqopedik işin təşkili". ADPU Ped. xəbər. Bakı, 156 s.
9. İnklüziv təhsil sinifdə müxtəlifliyin dəstəklənməsi üçün təcrübi təlimatlar. (2020). Tim Loreman, Coan Deppeler və David Harvey. (Tərcümə - Regional İnkişaf İctimai Birliyi). Bakı, 309 s.
10. Ağayeva, T.H., Əliyeva, S.M. (1999). "Loqopediyanın nəzəri-praktik məsələləri". Bakı, 190 s.
11. Qasımov, S.Ə. (1999). "Xüsusi məktəblərdə anomal uşaqların nitq inkişafı". Bakı, 321 s.
12. Andreyeva, L.V. (2005). Surdopedagogika. M., 367 s.

Göndərilib: 02.09.2023 Qəbul edilib: 28.10.2023

## Conclusion




Figure 22. Əlil-card QR scanner

- I have prepared 3 AI-enabled UI – “**Admin**” (web-based), “**Əlil-dostu**” mobile application for the people *volunteering to help the disabled* and the “**Əlillərə-xidmət**” mobi le app for the disabled to *reach/access the available services*.
- With proposal of QR code for cards to, have used OpenCV again for URL dispatching (Figure 22).
- For **Əlil-dostu** UI have prepared Map (Figure 23) Geolocationing (used Google Maps).
- I want to bring more service to the disabled in the future.




Figure 23. Əlil-dostu GPS access

## References


1. Hussain, M. (2023). YOLO-v1 to YOLO-v8, the Rise of YOLO and Its Complementary Nature toward Digital Manufacturing and Industrial Defect Detection. Machines, 11, 677 p. https://doi.org/10.3390/machines11070677. 25 p.
2. Soviany, P., Ionescu, R.T. (2018). Optimizing the Trade-Off between Single-Stage and Two-Stage Deep Object Detectors using Image Difficulty Prediction. 20th International Symposium on Symbolic and Numeric Algorithms for Scientific Computing (SYNASC), Timisoara, Romania, pp.209-214, doi: 10.1109/SYNASC.2018. 00041.
3. Guliyev, S. (2023). Artificial text generation using Deep Neural Networks: training of Suleyman Sani Akhundov’s plays. Scientific Work: Volume: 17 Issue 6, pp.82-96, doi: 10.36719/2663-4619/91/82-96.
4. My Workspace. (2023). BGVP Dataset. Open Source Dataset. In: Roboflow Universe. Available at: https://universe.roboflow.com/myworkspace-lf7cf/bgvp.
5. Guliyev, S. (October 2023). Qazi Tanima. Open Source Dataset. In: Roboflow Universe. Available at: https://universe.roboflow.com/shahriyar-guliyev/qazi-tanima.
6. Haiying, X., Cong, Y., Yumei, T., Shuxiang, S. (2023). A dataset for the visually impaired walk on the road. Displays, Volume 79, 102486. ISSN 0141-9382. https://doi.org/10.1016/j.displa.2023.102486.
7. https://www.analyticsinsight.net/unveiling-top-10-databases-for-ml-and-ai/.
8. https://docs.sonarsource.com/sonarqube/latest/.
9. https://docs.snyk.io/snyk-api/snyk-rest-api-overview.
10. https://owasp.org/www-project-top-ten/,https://www.sans.org/top25-software-errors/, https://cwe.mitre.org/top25/.
11. https://raw.githubusercontent.com/ultralytics/assets/main/im/banner-tasks.png.
12. https://raw.githubusercontent.com/ultralytics/assets/main/yolov8/yolo-comparison-plots.png.


Received: 12.08.2023 Accepted: 04.11.2023

## TƏBİƏT ELMLƏRİ

## NATURAL SCIENCES

DOI: https://doi.org/10.36719/2663-4619/96/139-143

**Fatma Hüseynova**
V.Y.Axundov adına Elmi-Tədqiqat Tibbi Profilaktika İnstitutu
tibb üzrə fəlsəfə doktoru
huseynova01049@gmail.com
**Şəhla Əliyeva**
V.Y.Axundov adına Elmi-Tədqiqat Tibbi Profilaktika İnstitutu
biologiya üzrə fəlsəfə doktoru
shahlaaliyeva1969@gmail.com
**Zivər Abseynova**
V.Y.Axundov adına Elmi-Tədqiqat Tibbi Profilaktika İnstitutu
ziver.abseynova@mail.ru
**Sevinc Eyvazlı**
V.Y.Axundov adına Elmi-Tədqiqat Tibbi Profilaktika İnstitutu
sevincesgerova122@gmail.com
**İlhamə Məsimova**
V.Y.Axundov adına Elmi-Tədqiqat Tibbi Profilaktika İnstitutu
ilhamemasimova73@gmail.com

# AZƏRBAYCANDA DƏRİ LEYŞMANİOZUNUN HAZIRKİ VƏZİYYƏTİ VƏ ONUNLA MÜBARİZƏDƏ QARŞIDA DURAN VƏZİFƏLƏR

**Xülasə**

Aparılan kompleks tədbirlər sayəsində keçən əsrin 60-cı illərində Azərbaycanda dəri leyşmaniozu praktik ləğv edilmiş, visseral leyşmanioz xeyli azaldılmışdır və onun qalıq ocaqları yalnız bir neçə rayonda müşahidə edilirdi. Lakin 1987-ci ildən başlayaraq dəri leyşmaniozu əvvəllər rast gəlməyən bir sıra rayonlarda epidemik alovlanma şəklində baş qaldırmış, visseral leyşmanioz isə sürətlə yayılaraq ölkəmizin bir çox zonalarını əhatə etmişdir. Bu hal səhiyyə orqanlarında narahatçılıq doğurmuş və problemə daha ciddi yanaşmaq zəruriyyəti yaranmışdır.

Hal-hazırda ölkəmizin Göyçay, Ağdaş, Ucar, İsmayıllı və digər rayonlarında dəri leyşmaniozunun endemik ocaqları mövcuddur. Ümumiyyətlə, son illərdə Azərbaycanın bir çox regionlarında dəri leyşmaniozu sporadik şəkildə qeydə alınır. Dəri leyşmaniozu bütün yaş qruplarından olan əhali arasında müşahidə olunur.

Dəri leyşmaniozunun yayılmasının səbəbini aşkar etmək, onunla effektiv mübarizə və profilaktika tədbirləri həyata keçirmək üçün müxtəlif istiqamətlərdə dərin tədqiqatlar aparmaq lazımdır. Həmçinin bu məqsədlə xəstələrin erkən aşkarlanması və müalicəyə cəlb edilməsi çox vacibdir.

***Açar sözlər:*** *dəri leyşmaniozu, L.tropica major, L.tropica minor, epidemioloji durum, mübarizə tədbirləri*

**Fatma Huseynova**
Scientific Research Institute of Medical Prophylaxis named after V.Akhundov
PhD in medical sciences
huseynova01049@gmail.com
**Shahla Aliyeva**
Scientific Research Institute of Medical Prophylaxis named after V.Akhundov
PhD in biological sciences
shahlaaliyeva1969@gmail.com

**Zivar Abseynova**
Scientific Research Institute of Medical Prophylaxis named after V.Akhundov
ziver.abseynova@mail.ru
**Sevinj Eyvazli**
Scientific Research Institute of Medical Prophylaxis named after V.Akhundov
sevincesgerova122@gmail.com
**Ilhama Masimova**
Scientific Research Institute of Medical Prophylaxis named after V.Akhundov
ilhamemasimova73@gmail.com

## Current situation of cutaneous leischmaniasis in Azerbaijan and tasks in struggling with it

### Abstract

Thanks to the comprehensive measures taken in the 60s of the last century, cutaneous leishmaniasis was practically eliminated in Azerbaijan, visceral leishmaniasis decreased significantly, and its residual foci were observed only in some regions. However, since 1987, cutaneous leishmaniasis arose in the form of an epidemic outbreak in a number of regions where it had not previously been found, and then visceral leishmaniasis also quickly spread, covering many zones of our country. This situation has raised concerns among health authorities and highlighted the need for a more serious approach to the problem.

Currently, in Goychay, Agdash, Ujar, Ismayilli and other regions of our country there are endemic foci of cutaneous leishmaniasis. In general, in many regions of Azerbaijan in recent years, cutaneous leishmaniasis has been recorded sporadically. Cutaneous leishmaniasis is observed in the population of all age groups.

To find out the cause of the spread of cutaneous leishmaniasis and implement effective control and prevention measures, it is necessary to conduct in-depth research in various directions. Also for this purpose, early identification of patients and involvement in treatment is very important.

***Keywords:*** *cutaneous leishmaniasis, L.tropica major, L.tropica minor, epidemiological situation, control measures*

### Giriş

Azərbaycanın ölkə patalogiyasında leyşmaniozun, xüsusən də visseral leyşmaniozun mühüm yeri vardır.

Respublikada leyşmanioz xəstəliyinin insanlar arasında ilk dəfə aşkar edilməsindən 100 ildən artıq müddət keçmişdir və bu vaxt ərzində xəstəliyin müxtəlif aspektlərinin öyrənilməsinə çoxlu elmi tədqiqat işləri həsr edilmişdir (Nadjafov, 1969: 28).

Aparılan geniş spektrli elmi tədqiqatlar nəticəsində leyşmaniozların törədiciləri, infeksiya mənbələri, keçiriciləri aşkar edilmiş, xəstəliyin klinik gedişi, patogenizi öyrənilmiş, diaqnostika üsullarından bəziləri təkmilləşdirilmiş və müalicəsinin effektivliyi sahəsində irəliləyiş əldə edilmişdir.

Aparılan kompleks tədbirlər sayəsində keçən əsrin 60-cı illərində dəri leyşmaniozu praktik ləğv edilmiş, visseral leyşmanioz xeyli azaldılmışdır və onun qalıq ocaqları yalnız bir neçə rayonda müşahidə edilirdi (Bagirov, Abdullayev, Mahmudova, 2001: 48-51).

Lakin 1987-ci ildən başlayaraq dəri leyşmaniozunun əvvəllər rast gəlməyən bir sıra rayonlarda epidemik alovlanma şəklində baş qaldırması və sonra visseral leyşmaniozunun surətlə yayılaraq ölkəmizin bütün zonalarını əhatə etməsi səhiyyə orqanlarında narahatçılıq doğurmuş və problemə daha ciddi yanaşılması zəruriyyətini ortaya qoymuşdur (Hacıbəyova, Əliyeva, Hüseynova, 2018: 103-107; Bagirov, Faramazov, Abdullayev, 2002: 88-92; Gasanzade, Faramazov, Shalmiyev, 1987: 60-62; Gasanzade, Safyanova, Taghizade, 1990: 41; Fərəməzov, Əliyeva, Məmmədova, 1996: 27-28).

Qeyd edək ki, leyşmanioz keçiriciləri olan mığmığaların uçuş trayektoriyası o qədər də çox olmadığı üçün xəstəliyin geniş bir əraziyə yayılmasının əsas səbəblərinin aşkar edilməsi vacib məsələlərdəndir.

Dəri leyşmaniozunun əvvəllər aşkar edilmədiyi rayonlarda (Göyçay, Ucar, İsmayıllı) 1987-ci ildən başlayaraq epidemik alovlanma şəklində yayılması diqqəti cəlb edir. Digər tərəfdən 1987-2022-ci ilə qədər Respublika ərazisində aşkar edilən 1756 dəri leyşmaniozundan 1340 hadisə 1987-1997-ci illərə təsadüf edir ki, bu da ümumi leyşmanioz hadisələrinin 76,3 ± %-ni təşkil edir.

Bu leyşmanioz xəstələri, əsasən bir-birinə qonşu rayon və şəhərlərdə, yəni Kür-Araz ovalığının şimal-qərb bölgəsi və Böyük Qafqazın cənub-qərb bölgəsi rayonlarında (İsmayıllı, Ağsu, Şəki, Qəbələ, Şamaxı) aşkar edilmişdir.

Sonrakı illərdə xəstələrin sayı azalsa da, 1998-2022-ci illərdə cəmi 416 xəstə (ümumi xəstələrin 23,7 ± %) qeydə alınmışdır. Yuxarıda göstərilən məlumatlardan aşkar olur ki, dəri leyşmaniozu Azərbaycan Respublikasının bütün bölgələrində rast gəlinir. Leyşmanioz geniş yayılaraq Respublikanın 5 vilayətinin 36 rayon və şəhərini əhatə etmişdir. Dəri leyşmaniozu regionlar üzrə də qeyri-bərabər yayılmışdır. Belə ki, xəstəlik ən çox Kür-Araz vilayətində (88,85 ± 0,75%), sonra Böyük Qafqaz vilayətində (9,94 ± 0,71%), Kiçik Qafqaz (0,81 ± 0,21%) və Lənkəran (0,34 ± 0,14 %) vilayətlərində az, ən az isə Orta Araz vilayətində (0,06 ± 0,06%) aşkar edilmişdir.

Respublikada bu müddətdə aşkar edilən xəstələrin 79,78 ± 0,96%-i kənd yerlərində yaşayanlar, 20,22 ± 0,96%-i şəhərdə yaşayanlar təşkil etmişdir ($p<0,001$). Qadınlar (46,75 ± 1,19%) kişilərə (53,25 ± 1,19%, $p>0,05$) nisbətən az xəstələnmişlər. Bu da onunla izah olunur ki, axşamlar xəstəliyin keçiricilərinin fəal olduğu zaman kişilər qadınlara nisbətən daha çox açıq havada olurlar.

Dəri leyşmaniozu ilə uşaqlar (50,63 ± 1,19%) və böyüklər (49,37 ± 1,19%, $p>0,05$) təqribən eyni səviyyədə xəstələnmişlər.

Uşaqlar arasında xəstəlik ən çox 5-13 yaşlı uşaqlarda (38,56 ± 1,16%), ən az isə 0-1 yaşlarda (8,44 ± 0,67%, $p<0,001$) rast gəlmişdir.

Azərbaycanda dəri leyşmaniozunun iki növü: Şəhər (antroponoz) və kənd (zoonoz) dəri leyşmaniozu aşkar edilmişdir.

**Şəhər tipli dəri (antroponoz) leyşmaniozu.**

Kəskin invazion xəstəlik olub, törədicinin daxil olduğu yerdə dərinin xoralı zədələnmələri və sonradan tipik çapıqlaşma ilə səciyyələnir. Dəri leyşmaniozunun bu formasına (gec xoralaşan) bəzən Borovski xəstəliyi, il yarası da deyilir. Şəhər tipli dəri leyşmaniozunun törədicisi qamçılılar sinfindən olan *Leishmaniya tropika minor* (leyşmaniyanın kiçik forması) sayılır. İnvaziya mənbəyi xəstə insandır.

**Kənd tipli (zoonoz) dəri leyşmaniozu.**

Kəskin invazion xəstəlik olub şəhər tipli dəri leyşmaniozuna bənzəyir, lakin ondan dəri zədələnmələrinin kəskin-iltihabi xarakteri ilə fərqlənir. Bu forma Borovski xəstəliyinin 2-ci tipi (kəskin nekrozlaşan), murqab, pendin xorası da adlanır. Şəhər tipli dəri leyşmaniozunun törədicisi *Leishmania tropika major* (leyşmaniyanın böyük forması), leyşmanial mərhələnin ölçüləri (4-6×1-3 mkm) *L. tropika minora nisbətən* böyükdür. Başqa cəhətlərinə görə şəhər tipli dəri leyşmaniozu ilə oxşardır.

İnvaziya mənbəyi qumluq səhraların sakinləri olan vəhşi gəmiricilər - qum siçanları: böyük, qırmızıquyruq siçanlar, həmçinin nazikbarmaq sünbülqaran sayılır. Böyük qum siçanının leyşmaniyalarla yoluxması 70%-ə çatır, bəzi biotoplarda isə başdan başadır. Leyşmaniyaların gəmirici populyasiyasında sirkulyasiyası *Phlebotomus* cinsi qansoran hünülər vasitəsilə həyata keçir.

Dəri leyşmaniozunda inkubasiya dövründən sonra mığmığaların dişlədiyi yerdə qırmızı rəngli, orta bərklikdə, adətən az ağrılı kiçik düyüncüklər əmələ gəlir. Düyüncüklər tədricən böyüyür və antroponoz forma zamanı 3-6 həftədən, zoonoz forma zamanı isə 1-3 həftədən sonra xoralaşırlar. Xəstəlik bir neçə ay, antroponoz forma zamanı – bir ildən artıq davam edir və sağalma ilə qurtarır. Xora yerlərində çapıqlar əmələ gəlir. Xəstəlikdən sonra immunitet formalaşır (Pokrovski, Pak, Briko, 2007: 816; Hacıyev, Əliyev, 2007: 34-37; Ağayev, Xələfli, Tağıyeva, 2012: 662-671).

Dəri leyşmaniozunun klinik əlamətləri törədicinin növündən, orqanizmin immun sisteminin vəziyyətindən, yanaşı xəstəliklərdən və s. asılıdır.

Azərbaycanda rast gəlinən *L.tropica* və *L.major*-un törətdiyi xəstəliklər üçün aşağıdakı əlamətlər xasdır:

*L.tropica*-nın törətdiyi antroponoz dəri leyşmaniozu üçün dəridə rəngsiz çoxlu quru yaraların əmələ gəlməsi və adətən bu yaraların sponton olaraq bir il müddətinə sağalması xasdır. Onların illərlə davam edən tuberkuloid formasına çox az xəstələrdə rast gəlinir.

Respublikada 1987 - 2022-ci illərdə əhali arasında aşkar edilmiş 1756 dəri leyşmaniozu olan xəstələrdən yalnız 15 xəstədə (0,85 ± 0,1%) tuberkuloid forması aşkar edilmişdir.

*L.major* tərəfindən törədilən dəri leyşmaniozunda 2-8 aya sağalan kəskin iltihab və yaralar müşahidə olunur.

Respublikada son illər aşkar edilən 424 dəri leyşmaniozunun xəstəlik tarixləri və ambulator kartları araşdırılmışdır. 424 dəri leyşmaniozundan 91 nəfərdə (21,5 ± 2,0%) kəskin iltihab və çoxlu yaralar qeyd edilmişdir.

Dəri leyşmaniozunun diaqnozu klinik əlamətlərə və yaradan götürülmüş materialın mikroskopik, PZR-lə, kultural yolla və eyni zamanda qanın seroloji müayinəsi ilə aparılır (Borba s leishmaniozom, 2010; Manual on case management and surveillance of the leishmaniases in the WHO European Region, 2018; Ejov, Daghe, 2014-2020).

Dəri leyşmaniozunun müalicəsi paromomisinin mazından (gündə 2 dəfə) istifadə etməklə 20 gün aparılmışdır. Termoterapiyadan da istifadə olunmuşdur. Eyni zamanda müalicə üçün bəzi xəstələrdə beşvalentli sürmə preparatları 0,5-5 ml olmaqla yara yerinə və ətrafına yeridilir.

Qed edək ki, son 30 ildə Respublika ərazisində Leyşmanioza qarşı kütləvi müayinə aparılmamış, yəni xəstələr aktiv şəkildə aşkar edilməmişdir. Ona görə də aşkar edilən xəstələrin sayı yoluxmaların həqiqi səviyyəsini əks etdirmir.

Digər tərəfdən bu müddət ərzində xəstəlik törədicilərinin növ tərkibi dəqiqləşdirilməmiş və onların identifikasiyası aparılmamışdır.

Eyni zamanda müxtəlif bölgələrdə xəstəlik mənbələri də dəqiqləşdirilməmiş və bu sahədə lazımı səviyyədə tədqiqat işləri aparılmamışdır.

Azərbaycan ərazisində mığmığaların 15 növü aşkar edilmişdir. Lakin son 30 ildə mığmığaların ayrı-ayrı bölgələrdə faunasına dair tədqiqatlar da yetərincə deyildir. *L.tropica, L.major*-un dominant keçiriciləri də tam dəqiqləşdirilməmişdir.

Bütün bunlar nəzərə alınsa, dəri leyşmaniozunun yayılmasının səbəbini aşkar etmək, onunla effektiv mübarizə və profilaktika tədbirləri həyata keçirmək üçün aşağıdakı istiqamətlərdə daha dərin tədqiqatlar aparmaq lazımdır:

1. Xəstəliyin insanlar arasında yayılmasının həqiqi səviyyəsini aşkar etmək üçün leyşmanioz ocaqlarında müxtəlif müayinələrin aparılması;
2. Xəstəlik mənbələrini aşkar etmək üçün insanlarla yanaşı müvafiq heyvanların müayinəsinin aparılması;
3. Törədicilərin növ tərkibini öyrənmək üçün ayrı-ayrı regionlarda aşkar edilmiş xəstələrdən parazitlərin izolə edilməsi və kulturasının alınaraq standart kulturalarda saxlanılan növlərlə identifikasiyasının aparılması;
4. Leyşmaniozların diaqnostikasını yaxşılaşdırmaq üçün parazitoloji müayinə metodları ilə paralel olaraq seroloji, kultural və molekulyar-bioloji metodlardan istifadə edilməsi;
5. Leyşmaniozun müalicəsinin effektivliyini artırmaq üçün Respublikada aşkar edilən xəstələrdən izolə edilmiş törədicilərin kulturasının alınması və onların etioloji dərman preparatlarına həssaslığının təyin edilməsi;
6. Dəri leyşmaniozlarında mono və mikst infeksiyalarda və yanaşı keçən digər patologiyalarda müalicənin effektivliyinin müqayisəli təhlili;
7. Ayrı-ayrı bölgələrdə leyşmanioz keçiricilərinin faunasının və dominant növlərinin öyrənilməsi;

8. Müxtəlif leyşmanioz ocaqlarında differensasiya olunmuş kompleks mübarizə və profilaktika tədbirlərinin işlənib hazırlanması;

## Nəticə

Dəri leyşmaniozunun yayılmasının qarşısını almaq məqsədilə xəstələrin erkən aşkarlanması və müalicəyə cəlb edilməsi çox vacibdir. Mığmığaların uçuş yerlərində, yaşayış məskənlərində kütləvi işləmə (tiofos, heksaxloran) aparmaq lazımdır. Fərdi qorunmaq üçün dəriyə repellentlərin çəkilməsi, pəncərələrin torlanması, yataq miçətkənlərindən istifadə edilməsi məstəhət görülür.

Həmçinin yaşayış məskənlərində və ya iş yerlərində (ekspedisiya, tikinti) 1,5-3 km radiusunda ətrafda gəmiricilərin və hünülərin qırılmasına yönəldilmiş tədbirlərin həyata keçirilməsi məqsədəuyğundur.

## Ədəbiyyat

1. Nadzhafov, A. (1969). Leishmanioz v Azerbaidzhanskoi SSR (epidemiologiya, perenostchiki i meri borbi). Avtorskaya dissertatsiya doktora meditsinskikh nauk. Baku, 28 s.
2. Bagirov, G., Abdullayev, Kh., Mahmudova, Sh. (2001). Osobennosti rasprostraneniya kojnogo leishmanioza po rayonam Shirvanskoi ravnini. Materialy respublikanskoy nauchno-prakticheskoy konferentsii po aktual'nym problemam klinicheskoy mikrobiologii v XXI veke. Baku, str. 48-51.
3. Hacıbəyova, E., Əliyeva, N., Hüseynova, F. (2018). Azərbaycanın Bərdə rayonunda Leyşmaniozların epidemiologiyasına dair. Azərbaycan Respublikası Səhiyyə Nazirliyi V.Axundov adına ET Tibbi Profilaktika İnstitutunun elmi əsərləri. XI cild. Bakı, s.103-107.
4. Bagirov, G., Faramazov, Z., Abdullayev, Kh., Mamedova, M. (2002). Dinamika kozhnogo leishmanioza v rayonah Shirvanskoi ravnini s 1987 po 2001 godi. Sbornik materialov nauchno-prakticheskoy konferentsii, posvyashchennyy 80-letiyu Instituta meditsinskoy profilaktiki im. V. Akhundova. Baku, s.88-92.
5. Gasanzade, G., Faramazov, Z., Shalmiyev, G., Mamedova, M. (1987). Rezultati serologicheskogo obsledovaniya v ozdorovlennom ochage antroponoznogo kozhnogo leyshmanioza (g.Kirovobad Azerbaidzhanskoy SSR). Meditsinskaya parazitologiya. №1, s.60-62.
6. Gasanzade, G., Safyanova, V., Taghizade, T. (1990). An outbreak of cutaneous leishmaniasis caused by Leishmania infantum in the Geokchay region of Azerbaijan SSR. Journal of Med. Parasitology and Parasitological Disease. Moscow. № 2, 41 p.
7. Fərəməzov, Z., Əliyeva, X., Məmmədova, F. (1996). Azərbaycan Respublikasında leyşmaniozların yayılma arealı və xəstəliklərin 2000-ci ilə qədər dövr üçün vəziyyətinin proqnozlaşdırılması. Milli Elmi Tədqiqat Tibbi Profilaktika İnstitutu, 1994-1995-ci illərdə aparılmış elmi tədqiqatların nəticələrinə həsr edilmiş yekun Elmi-Praktik konfransın materialları. Bakı, s.27-28.
8. Pokrovski, V.I., Pak, S.G., Briko N.I. (2007). Infeksionnie bolezni i epidemiologiya. M.: GEOTAR-Media, 816 s.
9. Hacıyev, İ.A., Əliyev, M.İ. (2007). Tibbi parazitologiya. Bakı, s.34-37.
10. Ağayev, İ.Ə., Xələfli, X.N., Tağıyeva, F.Ş. (2012). Epidemiologiya. Bakı, s.662-671.
11. Borba s leishmaniozom. (2010). Doklad na zasedanii komiteta ekspertov VOZ po borbe s leishmaniozom. Jeneva, 22-26 marta.
12. Manual on case management and surveillance of the leishmaniases in the WHO European Region. (2018). WHO, pp.1-13.
13. Ejov, M., Daghe, D. (2014-2020). Program. Strategic framework for leishmaniasis control in the Eurepean region. WHO.

Göndərilib: 06.08.2023 Qəbul edilib: 07.10.2023

DOI: https://doi.org/10.36719/2663-4619/96/144-149

**Xatirə Xələfli**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
khalafli@mail.ru
**Dəstə Qasımova**
Azərbaycan Tibb Universiteti
qasimovadasta@gmail.com
**Bayram Əsədov**
Azərbaycan Tibb Universiteti
tibb üzrə fəlsəfə doktoru
bayramniyazalioglu@mail.ru
**Şəlalə Əliyeva**
Azərbaycan Tibb Universiteti
shalalaseyidova@gmail.com
**Dünya Niftəliyeva**
Azərbaycan Tibb Universiteti
nifteliyevadunya@gmail.com

# QEYRİ-İNFEKSİON XƏSTƏLİKLƏRİN ÖYRƏNİLMƏSİNDƏ EPİDEMİOLOJİ DİAQNOSTİKANIN TƏTBİQİ

**Xülasə**

Məqalədə qeyri-infeksion xəstəliklərin epidemiologiyasına dair qısa məlumatlar verilmiş, son illər bu xəstəliklərin öyrənilməsi üzrə əldə edilən uğurlar və təcrübədə epidemioloji diaqnostikanın tətbiqi paylaşılmışdır. Epidemioloji diaqnostika deyəndə konkret ərazidə müəyyən əhali qrupu arasında öyrənilən vaxt müddətində epidemioloji situasiyanı və onun inkişaf şərtlərinin dəyərləndirilməsini nəzərdə tuturlar. Epidemioloji diaqnostika – epidemioloji metodun təcrübədə istifadə edilməsidir. O, planlaşdırılmanın səmərələşdirilməsi, profilaktik və əksepidemik tədbirlərin həyata keçirilməsi və epidemioloji proqnozun işlənilməsi məqsədi ilə aparılır. Kütləvi xarakterə malik olan bir sıra qeyri-infeksion xəstəliklər zamanı onların yayılma zəruriyyətinin, profilaktik və mübarizə metodlarının öyrənilməsi məqsədi ilə epidemioloji yanaşma tamamilə özünü doğrultmuşdur. Hipotezlərin sübut edilmə mərhələsində eksperimental metodik üsullardan istifadə edirlər. Epidemioloji diaqnostikanın mərhələsində deskriptiv metod üsulları istifadə olunur.

***Açar sözlər:*** *epidemiologiya, profilaktika, qeyri-yoluxucu xəstəliklər, diaqnostika, epidemioloji aspektlər, epidemioloji nəzarət*

**Khatira Khalafli**
Azerbaijan Medical University
doctor of philosophy in medicine
khalafli@mail.ru
**Dasta Gasimova**
Azerbaijan Medical University
qasimovadasta@gmail.com
**Bayram Asadov**
Azerbaijan Medical University
doctor of philosophy in medicine
bayramniyazalioglu@mail.ru
**Shalala Aliyeva**
Azerbaijan Medical University
shalalaseyidova@gmail.com

**Dunya Niftaliyeva**
Azerbaijan Medical University
nifteliyevadunya@gmail.com

## Application of epidemiological diagnostics in the study of non-communicable diseases

### Abstract

The article provides brief information on the epidemiology of non-infectious diseases was given in the article, the successes achieved in the study of these diseases in recent years and the application of epidemiological diagnostics in practice were shared. Epidemiological diagnosis refers to the assessment of the epidemiological situation and the conditions of its development during the period of time studied among a certain population group in a specific area. Epidemiological diagnosis is the use of the epidemiological method in practice. It is carried out with the aim of streamlining planning, implementation of preventive and anti-epidemic measures and development of epidemiological forecast. In the case of a number of non-infectious diseases of a mass nature, the epidemiological approach has fully justified itself with the aim of studying the necessity of their spread, preventive and combating methods. At the stage of proving hypotheses, they use experimental methodical methods. Descriptive method methods are used at the stage of epidemiological diagnosis.

***Keywords:*** *epidemiology, prophylaxis, non-infectious diseases, diagnostics, epidemiological aspects, epidemiological control*

### Giriş

Əvvəllər geniş yayılmış difteriya, polimiyelit, taun, vəba, təbii çiçək və b. kimi xəstəliklərlə müvəffəqiyyətlə aparılan mübarizədən sonra xroniki keçən degerativ somatik xəstəliklər olan qan dövranı və tənəffüs orqanları, mədə-bağırsaq, sinir-psixiki, onkoloji xəstəlikləri ölüm səbəblərinə görə birinci yerə çıxmışdır (Ağayev, Xələfli, Tağıyeva, 2022: 67). Son onilliklərdə tibb elminin inkişafı nəticəsində yoluxucu xəstəliklərin və əvvəllər olduğu kimi bu gün də qeyri-infeksion xəstəlik hesab edilən patologiyanın arasında birlik və əlaqəni aydın nümayiş edir. İnfeksion və qeyri-infeksion xəstəliklərini müxtəlif patologiya növlərinin öyrənilməsində səbəb-nəticə əlaqələrini yaratmağa imkan verən elm üçün spesifik olan epidemioloji diaqnostika metodu birləşdirir (Ağayev, Xələfli, Tağıyeva, 2022: 128).

Bu metodun effektlivliyini müxtəlif mütəxəssislər sübut etmişlər. Əvvəllər somatik hesab olunan xəstəliklərin bir çoxu onların etiologiyasının açılmasından sonra infeksion xəstəlikləri statusunu qəbul etmişlər (mədə və 12-barmaq bağırsağının xora xəstəliyi, xroniki virus hepatiti). İnfeksiya və və digər patologiyalar arasındakı səddi ənənəvi somatik sayılan miokardit, pnevmoniya, qlomerulonefrit kimi xəstəliklər aradan götürür (Ağayev, Xələfli, Tağıyeva, 2022: 865).

Bir mənalı yalnız infeksion yaxud qeyri-infeksion xəstəliklərə mültifaktor patologiyalı xroniki bronxit, bronxial astma kimi xəstəlikləri aid etmək çətindir, çünki onların inkişafı həm infeksion agentlərlə, həm də ətraf mühitin müxtəlif faktorlarının təsiri ilə bağlıdır (Bhopal, 2003: 6). Qrip epidemiyalarının fonunda kəskin artan xəstəliklərdən əlavə ölüm hallarını bir mənalı izah etmək olmaz. Çox güman ki, qeyri-infeksion təbiətli xəstəliklərin ölümlə nəticələnməsi yaxud istənilməyən istiqamətə yönəlməsi kəskin infeksiyanın əlavə olunması ilə bağlıdır.

Kütləvi xarakterə malik olan bir sıra qeyri-infeksion xəstəliklər zamanı onların yayılma zəruriyyətinin, profilaktik və mübarizə metodlarının öyrənilməsi məqsədi ilə epidemioloji yanaşma tamamilə özünü doğrultmuşdur (Gordis, 1996: 12). Kliniki tədqiqatların aparılması zamanında aşağıdakı metodlardan istifadə olunur:

– Kohort tədqiqatı (müəyyən vaxt ərzində müşahidə olunan hər hansı ümumi əlamətlə birləşən şəxslər qrupu);

– «Hadisə-kontrol» tipi üzrə analitik epidemioloji tədqiqatlar;.

– randominizasiya olunan tədqiqatlar;
– kliniki sınaqlar və digərləri.

Qeyri-infeksion epidemiologiyanın öyrənilmə dairəsinə xəstəliklərin normadan kənara çıxmasının qiymətləndirilməsi, diaqnostikası, inkişaf risqi, yayılma və nəticə tezliyi, proqnozu və müalicəsi daxildir (WHO, 2019: 8). Normadan kənar olanların dəyərləndirilməsində (məs., arterial hipertenziya, şəkərli diabet), keyfiyyət əlamətləri (məs. HLA(Human Lenkosyte A-antigens)), sıra əlamətləri (məs., ürək küylərinin qiymətləndirilməsi 1 dən 6 balla qədər), miqdar əlamətləri (məs., bədən kütləsi, arterial təzyiq), dixotomiq əlamətləri (hə-yox) və diskret (yəni, tam ədədlərlə ifadə olunan miqdar əlamətlər) əlamətləri istifadə olunur.Diaqnostika prosesində diaqnostik testlərdən istifadə olunur (laborator, fizikal, instrumental yaxud diaqnostik kompleksi), xəstəlik diaqnostikasının bu və ya digər metodunu «qızıl standartla» müqayisə edirlər, yəni etibarlı hesab olunan xəstəliyi müəyyən etmə üsulu metodunun seçilməsini (məs., İnsanın İmmunçatışmazlığı Virusun diaqnostikası zamanı immunoblotinqlə yaxud follikulyar angina zamanı A-qrup beta-hemolitik streptokokkların aşkarlanması üçün əsnəkdən yaxma) çıxmışdır (Murray, Lopez, 1997: 18).

Hadisələrin və ilk növbədə, kliniki vəziyyətin və nəticənin tezliyi deyəndə onların yayılmasının öyrənilməsi nəzərdə tutulur (göstərilən xəstəliyin mövcud olduğu şəxslərin miqdarının müayinədən keçmiş, yəni, populyasiya yaxud seçilmişlərlə müqayisəli əlaqələri), yaxud xəstəliyin yeni hallarının tezliyi (məs., ürək-damar sistemi yeni xəstəliklərinin göstəricisi-100 min əhaliyə ildə 870 nəfərdir) və nəticələrin yeni hallarının tezliyi (əlillik yaxud infarktın ölümlə nəticələnməsi); yayılma (sağlam və xəstələrin daxil olunması ilə şəxs qruplarının birdəfəlik müayinəsi), xəstələnmə (göstərilən xəstəliyin olmamasına baxmayaraq, şəxs qruplarının təkrar müayinəsi) və xəstəlik müddətinin arasında olan əlaqənin dəyərləndirilməsi; yeni halların olması proqnozların işlənilməsinə imkan verir (Osipov, 2004: 5).

Müalicə effektivliyinin dəyərləndirilməsini müşahidə üsulu (observasion tədqiqatlar), eksperimental üsulu ilə (kliniki sınaqlar) aparıla bilər. Medikamentoz terapiyanın dəyərləndirilməsində müqayisə qrup xəstələrinə plasebo təyin olunur (plasebo-tədqiq olunan medikamentdən formasına, rənginə, tamına görə fərqlənməyən, lakin təsiredici qüvvəyə malik olmayan dərman formasıdır) (Kundapur, Modi, 2022: 3). Əgər xəstə aldığı müalicə növünü bilirsə, onun davranışı dəyişir, bu isə terapiya nəticələrinin qiymətinin sisematik olaraq səhfinə gətirir, ona görə bu reaksiyanı yox dərəcəsinə endirən kor-təbii üsul tədbiq edilir, tədqiqatlar elə aparılır ki, onun iştirakçıları kim öyrənilən preparatı, yəni plasebonu qəbul edir (pasiyenti bilməməyi-sadə kor üsul, pasiyent və tədqiqatçının birlikdə bilməmələri-ikiqat kor-təbii üsuldur). Randomiziv nəzarətli sınağın kor-təbii üsulu-«qızıl standart» adlandırılır. Maliyyə xərclənmələrini azaltmaq üçün alternativ üsullara əl atılır, məsələn, müqayisə qrupu əvəzinə müasir müalicəni keçmişdə müalicə olunanların müşahidə göstəriciləri ilə müqayisə olunur – buna tarixi yaxud qeyri-paralel nəzarət deyilir, nəzarət qismində isə digər klinikaların başqa müalicə metodları ilə aparılan təcrübələri istifadə oluna bilər (Khalequzzaman, Chiang, Hoque, 2017: 17). Bəzi hallarda nəzarət olunmayan sınaqlara müraciət edilir, yəni öyrənilmə müdaxiləsinə məruz qalan bir qrup xəstələrin xəstəlik gedişi müqayisə edir və xəstəliyin dinamikasında hər hansı yaxşılaşmanı aparılan terapiya effekti kimi dəyərləndirirlər, bu «üsul» «əvvəlcədən və sonrakı» adlanır və çox vaxt yanlış nəticələrə gətirir (Vahle, 2016: 21).

İstənilən infeksion yaxud qeyri-infeksion patogen agentlərinin qüvvəsi onun təsirini yumşaltmaq yaxud gücləndirməyə qadir olan mühit faktorlarından istiqamətini dəyişərək keçir (Vuorimies, 2017: 32). Bu anda eyni vaxtda bir yaxud müxtəlif mənşəli iki və daha çox patogen faktorlar təsir göstərə bilər.

Yayılma səviyyəsinə görə bədxassəli törəmələr, allerqozlar, şəkərli diabet kimi qeyri-infeksion xəstəliklər ələxsus da iqtisadi cəhətdən inkişaf etmiş ölkələrdə epidemik xüsusiyyətini almışdır. Əsas diqqət miokard infarktına - ürəyin işemik xəstəliyinin ən ağır və geniş yayılmış kəskin formasına yönəldilmişdir. Kəskin miokard infarktı dedikdə, koronar arteriyanın qəfləti okklyuziyası ilə törədilən və miokardın nekrozuna gətirib çıxaran patoloji vəziyyət başa düşülür. Epidemioloji

tədqiqatların məlumatlarının sayəsində müasir dövrdə Avropa kardioloqları cəmiyyətinin Birləşmiş komitəsi və Amerika kardioloqları komitəsi tərəfindən miokard infarktı hadisəsinin standart təyini işlənib hazırlanmışdır (Agaba, Akanbi, Agaba, 2019: 8).

Qeyri-infeksion epidemiologiya əsasən normadan kənara çıxan halları öyrənir, kliniki göstəriciləri norma və patologiya norma çərçivəsində dəyərləndirir. Bu zaman kliniki müşahidələr üç tip göstəricilərin alınmasına imkan verir:

– Keyfiyyət göstəriciləri – təbii nizamla yerləşdirilməsi mümkün olmayan ölçülərdir, az sayla müəyyən olunan xəstələrin keyfiyyət göstəricilərinin xarakterizə edilməsi nümunə ola bilər (cins, metabolizmin anadangəlmə pozulmaları), yaxud vacib diskret hadisələr (ölüm, hemodializ, cərrah müdaxiləsi), dixotomik adlandırılan yalnız 2 kateqoriyaya aid olan (mövcuddur – mövcud deyil, bəli-yox, sağdır-ölüb) keyfiyyət göstəriciləri.

– Sıra göstəriciləri – təbii nizamla, məsələn kiçikdən böyüyə, pisdən-yaxşıya doğru yerləşdirilən ölçülərdir, lakin bu cür kateqoriyalar arasındakı intervalın ölçüsü kəmiyyətlə ifadə oluna bilməz, sıra göstəricilərinin nümunəsi kimi aşağı ətrafların şişməsini + dan + + + + dək qiymətləndirmək, ürək küylərinin qradasiyasını isə 1-dən 6 balla kimi göstərmək mümkündür (çətinliklə eşitmədən stetoskopsuz qulaq asmağa kimi).

– Kəmiyyət göstəriciləri – ölçü yerindən asılı olmayaraq ardıcıl göstəricilər arasında olan bərabər intervallarla yerləşdirilmənin təbii nizamı ilə fərqlənən ölçülərdir; miqdar göstəriciləri fasiləsiz və diskret ola bilər, fasiləsizlərə qanın bir çox biokimyəvi göstəricilərini, bədən kütləsini, qan təzyiqini aid etmək olar; diskret göstəricilərin nümunəsi kimi hamiləlik və sağlam körpələrin dünyaya gəlməsi saylarını, xəstələrin ay ərzində qıcolma tutmalarının sayını göstərmək olar.

Tədqiqat aparılması zamanı əldə edilən göstəricilərin həqiqətə uyğun olunması xüsusi ilə dəyərləndirilir. Bu əldə edilən göstəricilərin həqiqi əhəmiyyətin dərəcəsinə müvafiq olmağını göstərir, yəni qiymət verilən təzahürün həqiqətən də belə olmağını əks edir. Bilavasitə dəyərləndirilməyə uyğunlaşan bir sıra kliniki parametrlər üçün dürüst qiymət verilməsi nisbətən asandır: müşahidə olunan ölçü nəticəsi bəzi qəbul olunmuş standartlarla müqayisə edilir. Digər kliniki simptomlar (məsələn, ağrı, ürək bulanma, təngnəfəslik, depressiya yaxud qorxu) fiziki metodlarla yoxlamaq mümkün deyil. Ona görə kliniki tədqiqatlarda sorğu vərəqələri yaxud anket növündə olan daha formal və standartlaşdırılmış yanaşmalar istifadə olunur (Ağayev, 2022: 58).

Tədqiqatların digər vacib parametri yenidən yaradılmadan ibarətdir, bu deməkdir ki, müxtəlif insanlarla, müxtəlif cihazlarda müxtəlif vaxt və məkanlarda hər hansı bir təzahürün təkrar ölçülməsi zamanı eyni nəticələrin alınmasının ehtimalı vardır. Laborator tədqiqatların aparılması zamanı göstəricilərin yenidən yaradılması təkrar ölçülmələr yolu ilə məsələn, eyni zərdab yaxud toxumaların müxtəlif cihazlarda aparılması ilə müəyyən olunur. Əgər əldə edilən göstəricilər müxtəlif müşahidəçilər tərəfindən müxtəlif şəraitlərdə eyni dərəcədə təsvir edilirsə, onların yenidən yaranması təsdiq olunur. Ölçülən dəyərlərin diapazonu da tədqiqat xüsusiyyətlərinə aiddir. Aparat yaxud cihaz ölçülən parametrlərin çox aşağı yaxud yüksək dəyərini qeydə almağa imkan verməyə də bilər, bu isə tədqiqatçının əldə etdiyi məlumatın məhdudlaşdırılmasına səbəb olur.

Ümumi variasiya – orqanizmdə bir müddət ərzində baş verən bioloji dəyişikliklər və müxtəlif individuum arasında bioloji fərqlərlə bağlı olan variasiyaların cəmlənməsidir. Variasiyalar zamanı ötdükcə orqanizmdə baş verən bioloji dəyişmələrə səciyyələndirilir, çünki bioloji parametrlərin bir çoxu zamanı həcmində dəyişir (o cümlədən sirkad ritmlər) (Ağayev, 2022: 85). Müəyyən müddət ərzində aparılmış ölçülmələr həmin dövrdə edilən mümkün ölçülmələrin seçimini səciyyələndirir və göstəricinin adi mənasına müvafiq olmayan nəticə verə bilər. Məsələn, eyni xəstədə mədəcik ekstrasistol tezliyi, vaxt ərzində şəklini dəyişir (variasiyaya uğrayır).

Epidemioloji diaqnostika deyəndə konkret ərazidə müəyyən əhali qrupu arasında öyrənilən vaxt müddətində epidemioloji situasiyanı və onun inkişaf şərtlərinin dəyərləndirilməsini nəzərdə tuturlar (tədris ədəbiyyatına «epidemioloji diaqnostika» terminini akad.V.D.Belyakov gətirmişdir, 1976). Epidemioloji diaqnostika – epidemioloji metodun təcrübədə istifadə edilməsidir (Ağayev, 2022: 64). O, planlaşdırılmanın səmərələşdirilməsi, profilaktik və əksepidemik tədbirlərin həyata keçirilməsi və epidemioloji proqnozun işlənilməsi məqsədi ilə aparılır.

## Nəticə

Epidemioloji diaqnostika aparılmasında infeksion xəstəliklərin məsafə və zamanda bölünmə xüsusiyyətləri analizinə əsaslanan və xəstəliyin səbəb, risq faktorlarının və formalaşma mexanizmlərinin nəzarət ölçülərinin işlənilməsi məqsədi ilə təyin edilmiş metodiki üsullarının cəmindən istifadə olunur. Bu zaman xəstəlik populyasiya səviyyəsində öyrənilir və əhalinin epidemioloji vəziyyətinin durumu kimi qiymətləndirilir.

Müasir şəraitdə epidemioloji diaqnostikanın əksepidemik tədbirlərinin nəticəsinin növbəti addımı epidemioloji nəzarət adlanır, yəni epidemik prosesə kompleks şəkildə dinamik müşahidənin aparılması nəzərdə tutulur.

Epidemioloji diaqnostikanın aparılması zamanında, aşağıdakı metodiki üsullardan istifadə edilir:

1) Observasion (müşahidə) təsvir metodları – faktiki materialın toplanması və hipotezlərinin işlənilməsi.
2) Analitik metodlar – hipotezlərin işlənilməsi.
3) Eksperimental metodlar – hipotezlərin sübutu.
4) Riyazi modelləşdirmə – epidemik proqnozlaşdırma.

Standart statistik paketlərin istifadəsi ilə kompyüter texnologiyasının tədbiqi keyfiyyəti kökündən dəyişmiş və çoxsaylı hesablaşmalara sərf edilən vaxtı azaltmış, riyazi modelləşmənin tədbiqinə imkan yaratmışdır. Epidemioloji diaqnostika təcrübədən keçirilmiş alqoritmlərlə həyata keçirilir.

Epidemik prosesin zahirə çıxarılmasına qiymət verilərkən onun xarakteri və dinamikasını müəyyən edən insanların həyat və fəaliyyətinin konkret şəraiti, təbii və sosial mühit faktorları, bioloji faktorlarının aşkarlanması həyata keçirilir. Əldə olunan göstəricilər əsasında risq faktorları haqqında hipotez formalaşır, yəni: a) risk qrupları və kollektivlərinin müəyyən edilməsi, b) risk ərazisi, c) risk zamanı.

Epidemioloji diaqnostikanın mərhələsində deskriptiv metod üsulları istifadə olunur. Xülasə edilməsi hipotezlərin yoxlanılması üçün analitik metod üsullarının tədbiqini edərək xəstəliyə gətirən səbəb-nəticə əlaqələrinin şifrlərinin açılması aparılır. Hipotezlərin sübut edilmə mərhələsində eksperimental metodik üsullardan istifadə edirlər. Əldə olunan göstəricilər epidemik prosesin inkişafını, onun dinamikasını epidemioloji proqnozlaşdırılmasının xülasəsinin ifadə edilməsinə imkan verir. Bu zaman riyazi modelləşdirilmə istifadə olunur.

## Ədəbiyyat

1. Ağayev, İ.Ə., Xələfli, X.N., Tağıyeva, F.Ş. (2022). Epidemiologiya (Milli rəhbərlik). Bakı, 67 s.
2. Ağayev, İ.Ə., Xələfli, X.N., Tağıyeva, F.Ş. (2022). Qeyri-infeksion xəstəliklərin epidemiologiyası. Bakı, 128 s.
3. Bhopal, R. (2003). Concepts of Epidemiology. NY: Oxford University Press.
4. Gordis, L. (1996). Epidemiology. Philadelphia: Sounders.
5. WHO. (2019). Ten threats to global health https://www.who.int/news-room/spotlight/ten-threats-to-global-health-in-2019
6. Murray, C.J., Lopez, A.D. (1997). Alternative projections of mortality and disability by course 1990-2020: Global burden of disease study. Lancet.
7. Osipov, S.G. (2004). Cooperation between HPH and schools: The Russian experience with Health Promotion for Children and Youth. 12 th International Conference on Health Promoting Hospitals.
8. Kundapur, R.B., Modi, P. (2022). Shenoy l activity adaptation towards control of selected noncommunicable diseases-A detailed part of large community trial in rural areas of India. J Fam Med Prim Care.
9. Khalequzzaman, M., Chiang, C., Hoque, B.A. (2017). Population profile and residential environment of an urban poor community in Dhaka, Bangladesh. J.Environ Health Prev Med.

10. Vahle, J.L. (2016). Skeletal Changes in Rats GivenDaily Subcutaneous Injections of Recombinant Human ParathyroidHormone (1-34) for 2 Years and Relevance to Human Safety. ToxicolPathol.
11. Vuorimies, I. (2017). Bisphosphonate Treatmentand the Characteristics of Femoral Fractures in Children With Osteogenesis Imperfecta. J Clin Endocr Metab.
12. Agaba, E.I., Akanbi, M.O., Agaba, P.A. (2019). A survey of non-communicable diseases and their risk factors among university employees: a single institutional study. South African Journal of Diabetes and Vascular Disease.

Göndərilib: 09.08.2023 Qəbul edilib: 07.10.2023

DOI: https://doi.org/10.36719/2663-4619/96/150-155

**Gülnarə Abbasova**
Azərbaycan Dövlət Aqrar Universiteti
abbasovag13@gmail.com

# SOYA BİTKİSİNİN ƏKİNİ VƏ ƏSAS PERSPEKİVLƏRİ

**Xülasə**

Azərbaycan quşçuluq məhsulları ilə daxili bazarın 98 faizini təmin etməsinə baxmayaraq bu sahənin yem təminatının 85 %-dən çoxu xaricdən asılıdır. Xaricdən gələn yem məhsullarının tərkibinin böyük hissəsini soya təşkil edir ki, bu da kifayət qədər valyuta ehtiyatlarının ölkədən getməsi deməkdir. Ölkədə bu məhsulun dəyərini əkinçilikdən daha çox, quş əti və süd məhsulları istehsalçıları hiss etsə də, əkinçilik təsərrüfları hələ də bu bitkinin becərilməsində o qədər də maraqlı deyildir. Soya özü qiymətli olduğu kimi, torpaq üçündə faydalıdır. Dənli bitkilər, qarğıdalı ilə növbəli əkilə bilən soya torpağı azotla kifayət qədər zənginləşdirir. Torpaqda atmosferin təbii azot dövriyyəsini təmin etdiyinə görə, soya bitkisi davamlı olaraq yüksək məhsuldarlığa malik olur.

***Açar sözlər:*** *soya, soya südü, əkin, məhsuldarlıq, torpaq, bitki*

**Gulnara Abbasova**
Azerbaijan State Agrarian University
abbasovag13@gmail.com

## Soybean crop crop and key prospects

**Abstract**

Despite the fact that Azerbaijan supplies 98 percent of the domestic market with poultry products, more than 85 percent of the fodder supply of this sector depends on foreign sources. Soybeans make up the majority of the feed mix from abroad, which means that considerable foreign exchange reserves leave the country. Although poultry and dairy producers feel the value of this product in the country more than agriculture, agricultural farms are still not very interested in cultivating this plant. Soybean itself is valuable as well as beneficial to the soil. Cereals, soybeans, which can be alternated with corn, sufficiently enrich the soil with nitrogen. Since the atmosphere provides natural nitrogen circulation in the soil, it does not have a particularly high demand for nitrogen fertilizers.

***Keywords:*** *soybean, soybean milk, planting, yield, soil, plant*

## Giriş

Soya dünyada ən perspektivli ərzaq bitkisi olmaqla, torpaq münbitliyinin artırılmasında əsas yeri tutur. Onun toxumunun tərkibində 35-45% zülal, 17-26% yağ, 2%-dək vitamin vardır. Dünya əkinçiliyində soya qida və yem zülalının həllində aparıcı bir bitkidir .

Soya bitkisinin mənşəyi qaranlıqdır, lakin bir çox botaniklər onun ilk dəfə eramızdan əvvəl 7000-ci ildə mərkəzi Çində əhliləşdirildiyinə inanırlar. Qədim məhsul olan soya min illərdir Çin, Yaponiya və Koreyada qida və dərman komponenti kimi istifadə olunur. Soya 1804-cü ildə ABŞ-a gətirildi və 20-ci əsrin ortalarında Cənubi və Orta Qərbdə xüsusilə əhəmiyyətli oldu. Soya dik budaqlanan bitkidir və hündürlüyü 2 metrdən çox ola bilər (Cəfərov, 2009: 313). Toxumlar sarı, yaşıl, qəhvəyi, qara və ya ikirəngli ola bilər, baxmayaraq ki, kommersiya növlərinin əksəriyyətində qəhvəyi və ya qara rəngli toxumlar var, hər bir qabda bir-dörd toxum var.

Birləşmiş Ştatlarda soya bitkilərinin əksəriyyəti herbisid qlifosata davamlılıq üçün genetik cəhətdən dəyişdirilmişdir. Soya əksər torpaq növlərində becərilə bilər, lakin isti, münbit, yaxşı qurudulmuş, qumlu gildə inkişaf edir. Bütün şaxta təhlükəsi keçdikdən sonra məhsul əkilir. Soya

adətən mexaniki üsulla, yarpaqlar bitkidən düşdükdən və toxumun rütubəti 13 faizə endikdən sonra təhlükəsiz saxlanmağa imkan verir.

Soya zülalın ən zəngin və ucuz mənbələrindən biridir və dünyanın bir çox yerlərində insanların və heyvanların qida rasionunda əsas elementdir. Toxumun tərkibində 17 faiz yağ və 63 faiz unu var ki, bunun da 50 faizi zülaldır. Soyada nişasta olmadığı üçün şəkər xəstələri üçün yaxşı protein mənbəyidir (Əliyev, Əkbərov, Nəbiyev, 1982: 30).

Şərqi Asiyada və başqa yerlərdə lobya soya südü, ağımtıl maye süspansiyon və bir qədər kəsmikə bənzəyən kəsmik tofu şəklində geniş şəkildə istehlak olunur. Soya sousu, duzlu qəhvəyi maye, altı aydan bir ilədək və ya daha çox müddətə duzlu suda maya fermentasiyasına məruz qalan əzilmiş soya və buğdadan hazırlanır. Həmçinin salat tərkib hissəsi və ya tərəvəz kimi istifadə üçün cücərilir və qəlyanaltı kimi qovrulmuş halda yeyilə bilər. Ümumiyyətlə müxtəlif iqlim bölgələrinə uyğun olan soya əslində Şərqi Asiya mənşəli bir bitkidir. Xüsusilə Çin, Koreya və Yaponiyada uzun illər becərilir. Bu gün dünyanın bir çox ölkəsində tətbiq edilən soya əkinçiliyi 20° C-dən aşağı və 40° C-dən yuxarı olan bölgələr üçün uyğun deyil.

Dənində zülal çox olduğuna görə paxlalı, yağ çox olduğuna görə isə yağlı bitkilər qrupuna aid edilir. Dəndə 33-45% zülal, 25-27% yağ və 25-27% sulu karbonlar vardır. Soya becərən təsərrüfatlar 2 məhsul: tam qiymətli zülal və bitki yağı alırlar. Soyanın zülalı suda yaxşı həll olur və yaxşı həzmə gedir. Soya dənində olan zülal arpaya nisbətən 3,6 qarğıdalı dəninə nisbətən isə 4 dəfə çoxdur. Soya ərzaq, yem və texniki məqsədlər üçün becərilir.

Kütləvi çiçəkləmə, paxlaların əmələ gəlməsi və dənin dolması mərhələlərində soya nəmliyə ən çox tələbat göstərir. Bitkinin normal inkişafı üçün vegetasiya müddətində soya ən azı 4 dəfə suvarılmalıdır. Birinci suvarma budaqlanma, 2-ci suvarma çiçəklənmənin başlanğıcında, 3-cü suvarma paxlalar əmələ gəldikdə və 4-cü suvarma dən dolmağa başladıqda keçirilməlidir (Hümbətov, Xəlilov, 2010: 452). Suvarma yağış yağdırma üsulu ilə hektara 500-600 $m^3$, şırımlarla infiltrasiya yolu ilə 700-800 $m^3$ su normasında keçirilir. Torpağın su-hava xassələrini yaxşılaşdırmaq üçün çıxış alınanadək bir iz və çıxış vaxtı 1-2 iz KRN-38 yaxud torlu mala ilə malalayırlar. Vegetasiya dövründə cərgə araları 2 dəfə KRN-4,2 markalı kultivatorla yumşaldılmalıdır. Vegetasiya müddətində tor gənəciyinə və yarpaqyeyən həşəratlara qarşı karbofosun 30%-li emulsiyası ilə hektara 1-1,5 kq, fosfamidlə Bİ-5,8 1 kq normada çiləmə aparılır. Çiçəkləmədən sonra çiləmə kükürd tozu ilə əvəz edilir.

Şimali Karolinada fermerlər may ayından başlayaraq iyulun sonlarına qədər soya əkirlər. Toxum bir-birindən 30 düym məsafədə olan cərgələrdə soya toxumunu təxminən 1 1⁄2 düym dərinliyə yatıran traktor və əkinçi tərəfindən becərilən və ya əkilmiş torpaqlara əkilə bilər. Sıraların nə qədər geniş olması ilə bağlı heç bir qayda yoxdur, lakin 30 düym tipikdir. Alternativ olaraq, soya lobyaları yeddi düymlük cərgələrdə xüsusi bir əkinçi tərəfindən yerə "qazıla" bilər. Fermer becərmə üsulundan istifadə etdikdə, torpaq becərilmir və toxum birbaşa may və ya iyun aylarında yığılmış buğda kimi əvvəlki məhsuldan qalan küləşə əkilir. Əkinsiz üsul vaxta qənaət edir, torpağın nəmini qoruyur və torpağın eroziyası ehtimalını xeyli azaldır. Əkinçilik çox arzuolunandır, lakin fermerlər alaq otları və ya digər zərərvericilərlə yoluxmuş tarlalarla məşğul olurlarsa, zərərvericini məhv etmək lazım ola bilər.

Soya əkildikdən təxminən dörd-yeddi gün sonra cücərir. Fermer artıq toxum zərərvericilərinə qarşı mübarizə və əməliyyat xərclərinə böyük sərmayə qoyub, ona görə də fermer öz məhsulunu qorumaq üçün bir çox şeyi nəzərə almalıdır. Böcəklər və qurdlar həqiqətən kiçik zərif bitkiləri sevirlər, buna görə də fermer ağır həşərat infeksiyası olduğunu görəndə məhsul üçün risk dərəcəsini hesablamalıdır. İnfestasiya məhsula zərər verəcək qədər pis olarsa, fermer zərərvericilərə qarşı mübarizə aparmaq üçün pestisid püskürür. Fermer üzvi üsullardan istifadə edirsə, hələ də səpilə bilən məhsullar var, lakin seçim daha məhduddur və risk bir qədər böyükdür. Gənc məhsul üçün başqa bir təhlükə soya bitkilərindən daha sürətli böyüyən alaq otlarından qaynaqlanır (Məmmədov, Cəfərov, Mustafayeva, 2008: 210). Onlar soya bitkilərini sıxışdıra bilər və lazımi günəş işığının və qida maddələrinin soya bitkilərinin böyüməsinə imkan verməməsinə mane ola bilər. Bu, soya məhsuldarlığını azaldacaq. Əgər böyüməyə icazə verilsə, bəzi alaq otları soya ilə birlikdə yığılacaq

və dəyəri azaldacaq toxumlar verəcəkdir. Fermer məhsulu yığdıqdan sonra satdıqda daha az pul qazanacaq. İyul, avqust və sentyabr aylarında bitkilər çiçək açır.

Çiçəklər kiçikdir və ağdan gözəl bənövşəyi və ya bənövşəyi rəngə qədər dəyişir. Bu çiçəklərdən soya bitkisi gənc toxumları ehtiva edən kiçik qabıqlar yetişdirir. Soya özünü tozlayan bitkidir, yəni hər çiçəyin erkək və dişi hissələri var. Tək bir bitki toxum istehsal edə və özünü klonlaya bilər (Yusifov, Məmmədov, Qasımov, Rzayev, 2013: 280). Soya bitkiləri ehtiyac duyduqlarından daha çox çiçək verir, buna görə də bir çox çiçək heç vaxt qabıq vermir. Soya, yarpağın alt tərəfində bir qədər solğun gümüşü-yaşıl kölgəsi olan tünd yaşıldır. Sentyabrın sonunda soya yetişməyə başlayır. Günlər qısaldıqca və havalar soyuduqca soya bitkilərinin yarpaqları saralmağa başlayır. Oktyabrın ortalarında və noyabrda yarpaqlar qəhvəyi olur və tökülür, soya paxlasının yetişmiş qabıqlarını açır. Soya artıq yığılmağa hazırdır.

***Məhsulun yığılması***. Soya ümumiyyətlə toxumlar tam yetişdikdə və tamamilə sarıya çevrildikdə və 13-14% rütubətə qədər quruduqda yığılır. Soya toxumları tam yetişəndə, lakin qabıqlar sarıya çevrilməmişdən əvvəl yığılmalı olan edamame adlanan yaşıl tərəvəz kimi də istifadə edilə bilər.

Yetişərkən soya paxlası açılmır ona görə də dən itkisi az olur.



***Şəkil 1. Soyanın yığılması***

Dən məqsədi ilə əkdikdə soya tam yetişmə fazasında, yarpaqların töküldüyü, gövdələrin quruduğu və paxlaların saralmağa başladığı dövrdə dəndə 14-16% nəmlik olduqda SK-5 Niva, SK-4A, SKD-5P, SKD-5M, "Sibiryak" kombaynları ilə yığılmalıdır.

Kombaynın kəsici aparatı ən aşağıdan biçmək üçün nizamlanmalıdır. Dənin qırılmasının qarşısını almaq üçün barabanla – deka arasında məsafə CK- 4A, CK-5 kombaynlarda girəcəkdə 40 mm, çıxacaqda 28 mm-dən az olmamalıdır. Barabanın dövrü dəqiqədə 400-500 dəfə dövr etməlidir (Yusifov, 2011: 382). Yetişməni sürətləndirmək məqsədilə tezyetişən sortlar əkilən sahələrdə desikasiya aparılır. Bu iş dəndə nəmlik 40-45% olduqda maqnezium – xlorat preporatının 20 kq-ı suya qarışdırılaraq sahəyə çilənir. Soya samanı yem üçün istifadə ediləcəksə desikasiya aparılmır. Yığılmış toxumda nəmlik 14% - dən çox olarsa asfalt meydançada günəş altında qurudulmalı və digər qatışıqlardan təmizlənməlidir.

Soya insan sağlamlığına faydaları ilə diqqət çəkən bir bitkidir. Tərkibindəki vitamin və minerallar sayəsində bir çox faydası olan soya son zamanlar çox istehlak edilir. Beləliklə, soyanın faydaları nələrdir?

***1. Həzmi yaxşılaşdırmağa kömək edir.***

Soya bitkisi zəngin lif mənbəyi sayəsində həzmi rahatlaşdıran və sürətləndirən bir qidadır. Həzm sisteminə sakitləşdirici təsiri ilə qəbizlik, həzm problemləri və bağırsaq pozğunluğu yaşayanlar üçün təbii mənbədir.

